Rafiq Şükürov
Ramiz Orsər

# İşıq məbədi



Müəlliflər: **Rafiq Şükürov**
*Şəki Pedaqoji Kollecinin direktoru*

**Ramiz Orsər**
*Şəki Pedaqoji Kollecinin müəllimi, şair*

Məsləhətçilər: **Nizaməddin Şəmsizadə**
*Filologiya elmləri doktoru, professor*

**Vaqif Qurbanov**
*Pedaqoji elmlər namizədi, dosent*

**Şükürov Rafiq, Ramiz Orsər**
Ş86 **İŞIQ MƏBƏDİ.** Bakı,
«**İDEAL-PRİNT**», 2010, 310 səh.

Şəki Pedaqoji Kollecinin 90 illik yubileyi münasibəti ilə işıq üzü görən bu kitabda kollecin təşkili, inkişaf tarixi, pedaqoji kollektivi və fəxri məzunları haqqında maraqlı faktlar, xatirələr və.s öz əksini tapmışdır.

Kitabın hər bir oxucu ilə maraqlı və səmimi həmsöhbət və geniş oxucu auditoriyasının marağına səbəb olacağına inanırıq.

ISBIN: 978995244710

Ş $\frac{4702060200}{122}$








**Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır.**

**Biz hamımız həyatımızda əldə etdiyimiz nailiyyətlərə, bütün varlığımıza görə müəllimə borcluyuq.**

**Heydər ƏLİYEV**







«Təhsil hər bir dövlətin, ölkənin, cəmiyyətin həyatının fəaliyyətinin mühüm bir sahəsidir... Cəmiyyət təhsilsiz inkişaf edə bilməz».

Heydər Əliyev













Uşaqlarımız bilikli olmalı, dünyada gedən prosesləri izləməli, yeni texnologiyalara sahib çıxmalıdır. İnsan kapitalı inkişaf etmiş ölkələrin indiki durumunu müəyyən edən amildir. Həmin ölkələr təbii resurslar hesabına yox, intellektual potensiala, yeni texnologiyaların icad olmasına, tətbiqinə görə inkişaf edirlər. Biz də bu yolu seçməliyik.

**İlham Əliyev**

**Azərbaycan Respublikasının Prezidenti**













Müasir dünyada hər bir ölkənin inkişafı, onun dünya birliyinə inteqrasiyası üçün təhsilin rolu əvəzsizdir. Məhz buna görə Heydər Əliyev Fondu yarandığı ilk gündən təhsilə yardımı öz fəaliyyətinin prioritet istiqaməti elan etmişdir.

**Mehriban Əliyeva**

Heydər Əliyev Fondunun prezidenti,
YUNESKO və İSESKO-nun xoşməramlı
səfiri, millət vəkili










Orta ixtisas təhsilinin keyfiyyətinin təmin olunması bir sıra amillərdən asılıdır. Bu, ilk növbədə təhsil sahəsində dövlət siyasətinin düzgün formalaşdırılması ilə bağlıdır. Təhsildə keyfiyyəti təmin edən ikinci amil dövlət təhsil standartları ilə müəyyənləşdirilən onun məzmunudur... Bir-biri ilə sıx əlaqədə olan bu amillər təhsil müəssisəsinin fəaliyyətini keyfiyyət baxımından xarakterizə edir.

**Misir Mərdanov**

Təhsil Naziri



İşıq məbədi



# Ön söz əvəzi

Əziz oxucu! Sənin üz-üzə, göz-gözə dayandığın «İşıq məbədi» adlandırdığımız bu kitab Şəki Pedaqoji Kollecinin 90 illik yubileyi ərəfəsində əmələ-ərsəyə gəlmiş bir kitabdır. Müəlliflər yubiley ərəfəsində kollecin keçdiyi şərəfli inkişaf yolunu araşdırmağı, 90 illiyin zirvə toplantısına sanballı bir hesabat məruzəsi təqdim etməyi məqsəd kimi düşünürdülər. Araşdırmalar, axtarışlar, əldə edilən faktlar, məlumatlar, materiallar, xatirələr və digər mətbu vasitələri bizi vadar etdi ki, onları ümumiləşdirək, sistemləşdirək və belə bir kitabla sizin görüşünüzə gələk.

Bizim nə qədər dəyərli və faydalı bir iş gördüyümüzü isə son səhifəni də oxuyub qurtaran oxucu özü söyləyəcək.

Kitabı tərtib edən zaman bir məqsədimiz və bir amalımız olub: heç nəyi şişirtmədən, heç nəyi kiçiltmədən hər şeyi, hər bir faktı olduğu kimi əziz oxucunun diqqətinə çatdırmaq. Yenə də nəticə çıxarmağı, münasibət və mövqe bildirməyi, mühakimə yürütməyi də oxucularımızın öhdəsinə buraxırıq. Biz Şəki Pedaqoji Kollecinin 90 illik fəaliyyətinə qiymət verməyi də qarşımıza məqsəd kimi qoymamışıq. Bizim ümdə məqsədimiz və vəzifəmiz, sadəcə olaraq, bu işdə oxucularımıza bələdçilik etməkdir. Buna necə nail olub-olmadığımızı da kitabı oxuyub qurtaran oxucumuz özü söyləyəcək. Ancaq bir şeyə əminik ki, səbirli olub əlindəki bu kitabı sona qədər oxuyan şəxs hər bir oxucunu özünə çəkən, onun diqqət və marağına səbəb olan hər hansı bir fakt və məlumatla qarşılaşacaq. Bir şeyə də əminik və inanırıq ki, kitabı əlinə götürüb vərəqləyən oxucu onu yarımçıq qoymayacaq, sonadək oxuyacaq. Buna sərf etdiyi vaxtın itkisi haqqında da qətiyyən düşünməyəcək, əksinə...

Bu kitabın bir özəlliyi də ondadır ki, Şəki Pedaqoji Kollecinin fəaliyyəti haqqında ilk dəfədir ki belə bir kitab həm bu həcmdə, həm onun keçdiyi şərəfli yola yaxından bələd olan, həm də onun tarixi inkişafında bilavasitə iştirakı olan müəlliflər tərəfindən təqdim olunur. Təbii ki, bu kitab gərgin axtarış və araşdırmaların bəhrəsidir.





Bəs niyə əlinizdəki bu kitabı «İşıq məbədi» adlandırdıq, elmi-publisistik üslubun daha çox yer aldığı bir kitaba – araşdırmalar toplusuna ad verərkən bədii təsvir vasitəsindən istifadə etdik, adını bədiiləşdirdik – «İşıq məbədi» ?

Cavabımız çox sadədir. Yaşadığımız indiki qloballaşma və kompyüterləşmə dövründə həməsrlərimizin və gələcək nəsillərin idrakına və dərk etməsinə güvəndiyimizə görə.

Ziya, nur sözləri də elə işıq anlamındadır. Ancaq işıq sözünün yaddaşı milli və mənəvi dəyərlərimizin yaddaşından qaynaqlanır, ruhumuzu və beynimizi zorlamadan daha çox qidalandırır. Bütün zamanlarda və məqamlarda, bitkilər aləmində də inkişaf həmişə işığa doğru olmuşdur.

Məbəd sözü də ulularımızın tapındığı, inam, inanc və güvənc yeridir. Məbəd mənəvi dünyamızın beşiyi, ən müqəddəs məkan olmaqla, iç dünyamızın və mənəviyyatımızın, ruhumuzun qidalandığı Tanrı evidir. Daha başqa şərhə ehtiyac duymadıq.

Bir kitabda Şəki Pedaqoji Kollecinin tarixini, müəllimlərinin əsl maarif fədaisi kimi göstərdiyi fəaliyyətin hamısını əks etdirə bilməsək də, oxucuda müəyyən təsəvvür yaratmağa çalışdıq. İnanırıq ki, müəyyən zaman kəsiyində kollecimizdə həyata keçirilən işlər haqqında pedaqoji ictimaiyyətə daha geniş məlumatlar çatdırılacaqdır.

İlk növbədə bizə material təqdim edən hər bir kəsə minnətdarlığımızı bildiririk. Ola bilər ki, hansısa materialdan istifadə etməmişik və ya istifadə zamanı hansısa xətaya yol vermişik. Söz veririk ki, ikinci kitabda xətalarımızı aradan qaldıracaq, istifadə olunmamış materiallardan da istifadə edəcəyik.

Biz bəzi materialların hazırlanmasında köməklik göstərmiş kollecimizin müəllimləri Pərviz Zeynalova və Rəşid Səmədova minnətdarlığımızı bildiririk.

Şəki Pedaqoji Kollecinin çoxsaylı fəxri məzunları haqqında öz kitablarında məlumatlara yer vermiş Ələfsər Məmmədova, Fikrət Xalıqova, kollecimizin məzunu olmuş Almaz Qeysər qızına xüsusi minnətdarlıq bildiririk.

Bu kitabda biz də fəxri məzunlarımızın bir qismi haqqında qı-

sa qeydlər verə bildik. Ümidvarıq ki, ikinci kitabda fəxri məzunlarımız haqqında, bütün direktorlarımız və kollecimizin müəllimləri haqqında da daha geniş bilgilər verə biləcəyik. Bu işdə oxucularımızın da bizə yardımçı olacağına inanırıq.

Kitabda Nuxa Dövlət ikiillik Müəllimlər İnstitutunun direktoru və bir neçə fəxri məzunu haqqında da bəhs etmişik. Çünki Pedaqoji Texnikumla ikiillik Müəllimlər İnstitutu bir binada yanaşı və çox sıxı fəaliyyət göstərmişlər. Biz də bunu nəzərə aldıq. Növbəti kitabımızda ikiillik Müəllimlər İnstitutunun fəaliyyətinə də geniş yer verəcəyik.

Əlbəttə, belə bir fikir yaranmamalıdır ki, Şəki Pedaqoji Kollecinin tarixi inkişaf yolunu bu kitab tam əhatə edir. Yox, sadəcə bu kitab kollecin fəaliyyətinin bəzi məqamlarına işıq salır. Ancaq, bu kitabın da bir sıra özəllikləri var. Kitaba xas olan lakoniklik, şərh və izahlardakı yığcamlıq, məzmunu qısa, lakin dolğun ifadə etmək keyfiyyəti ondan istifadə edənlərə az bir vaxtda səmərəli nəticələr əldə etməyə imkan verəcəkdir. İnanırıq ki, bu keyfiyyətlərinə görə bu kitab pedaqoji fikir tariximizi öyrənənlər üçün gərəkli bir məlumat mənbəyi olacaqdır.

Bununla belə təqdim etdiyimiz kitabda müəyyən qüsürlar, yanlışlıqlar da ola bilər. Bunlar ikinci kitabda aradan qaldırılacaq və daha da təkmilləşdiriləcəkdir.

Odur ki, ümumi işimizin xeyrinə materiallarla bağlı mülahizə, rəy və təkliflərinizi bildirməyi Sizdən xahiş edir və əvvəlcədən təşəkkürümüzü bildiririk.

***Müəlliflər***

***PS.*** *Azərbaycan Respublikasının Nazirlər Kabinetinin «Orta ixtisas təhsili müəssisələrinin adlarının dəyişdirilməsi haqqında» 16 iyun 2010-cu il tarixli 112 nömrəli qərarına əsasən Şəki Pedaqoji Texnikumu Şəki Pedaqoji Kolleci adlandırılmışdır. Ancaq biz kitabdakı materiallarda ayrı-ayrı illərdə texnikumun hansı adlar altında fəaliyyət göstərməsini qoruyub saxlamışıq.*





# I bölmə

## Azərbaycan təhsili Heydər Əliyev dühasının işığında



***Ulu öndər Heydər Əliyev Respublika müəllimlərinin II qurultayında***

Bu gün ölkəmizdə fəaliyyət göstərən hər bir təhsil müəssisəsi özünün keçmişi, bu günü, uğurları və problemləri ilə Bütöv Azərbaycan təhsilinin tərkib hissəsi və ya sadəcə özüdür. Ötən XX əsrdə Azərbaycan təhsilinin inkişafına mərhələli rakusdan nəzər salsaq, təhsilimizin inkişafını şərti olaraq iki mərhələyə ayırmaq olar. Təbii ki, birinci mərhələ XX əsrin əvvəllərindən 1970-ci ilə qədər olan bir dövrü əhatə edir. İkinci mərhələ isə 1970-ci ildən XXI əsrin ilk illərinə qədərki dövrü (Təəssüf ki, 80-ci illərin II yarısı, 90-cı illərin əvvəllərini bu mərhələyə daxil etmək olmaz) əhatə edir. Bu dövrü Azərbaycan təhsilinin inkişafında ən parlaq dövr – Heydər Əliyev dövrü adlandırsaq, yanılmarıq – bu, daha doğru olar.

Azərbaycan dövlətinin qurucusu və böyük fatehi, ümummilli liderimiz, dahi şəxsiyyət Heydər Əliyevin dün-

yasını dəyişməsi və bundan doğan hüzn, kədər nə qədər ağır olsa da, təsəllini onda tapırıq ki, o böyük xilaskar milli dövlətçiliyimizə, müstəqilliyimizə dönməz bir xarakter verib, mükəmməl idarəetmə məktəbi yaradıb. Azərbaycan təhsilinin inkişaf strategiyasını müəyyənləşdirib, bütöv bir yeni tipli gənc rəhbər kadrlar nəsli tərbiyələndirib... Ən nəhayətdə isə bütün deyilənlərin yenilməz zirvəsi olan müasir lider – bü gün özünün əsəri olan Azərbaycan dövlətinə rəhbərlik edən İlham Əliyevi yetişdirib.

Heydər Əliyevin istər sovetlər dönəmində, istərsə də müstəqillik dövründə doğma Azərbaycana və xalqımıza göstərdiyi xidmətləri saymaqla qurtarmaq olmaz. Buna cild-cild kitablar həsr etmək gərəkdir. Bizim məqsədimiz bu yazıda böyük şəxsiyyətin təhsil, elm və mədəniyyətin inkişafına göstərdiyi diqqət və qayğıya kiçik bir ekskurs etmək, bunların fonunda 90-cı illərdə və ondan sonra 90 illik yubileyini qeyd etməyə hazırlaşdığımız Şəki Pedaqoji Texnikumuna və onun pedaqoji kollektivinə göstərdiyi diqqət və qayğısını bir daha gənc nəsillərin yaddaşına çatdırmaqdır.

Ulu öndər sovet dönəmində respublikaya rəhbərlik etməyə başladığı ilk illərdən təhsilə, xalqın maariflənməsinə böyük önəm verdi. Bütövlükdə ölkəmizdə təhsil şəbəkələrinin genişləndirilməsinə, təhsilin keyfiyyətinin yüksəldilməsinə diqqət və qayğını artırdı. Ölkədə təhsilin strateji önəm daşıdığını hər kəsin diqqətinə çatdırmaqla, hamıdan da bu işə böyük diqqət və qayğı tələb edirdi. Təsadüfi deyil ki, Azərbaycan təhsili XX əsrin 1970-ci illərinə qədərki mərhələdəki inkişafından ikinci dövrdə – Heydər Əliyevin ölkəyə rəhbərliyi illərində dəfələrlə çox, həm də planlı və dinamik şəkildə yüksələn xətlə inkişaf etdi. Heydər Əliyev ölkəmiz üçün yüksək ixtisaslı mütəxəssislərin





hazırlanmasını xüsusi nəzarətə götürdü. 1970-ci ilə qədər Azərbaycandan kənarda SSRİ-nin aparıcı ali məktəblərinə təhsil almağa gedən gəncləri barmaqla saymaq olardı. Hər sahədə olduğu kimi ümumi təhsil işində də pərakəndəlik, yalançı planlaşdırma hökm sürürdü. Təhsil, təlim-tərbiyə işindəki pərakəndəliyi Heydər Əliyevin işləyib hazırladığı xüsusi proqram və sistemli fəaliyyət əvəz etdi. O vaxtdan hər il Azəbaycandan yüzlərlə gənc keçmiş SSRİ-nin aparıcı ali məktəblərinə və elm mərkəzlərinə təhsil almağa göndərildi. Böyük öndərin Azərbaycan rəhbəri seçilməsindən cəmi üç il sonra bu iş artıq müsbət bir tendensiya şəklini almışdı.

Hər dərs ilinin başlanmasından əvvəl – avqust ayının üçüncü ongünlüyündə İttifaqın başqa şəhərlərinə təhsil almağa göndərilən gənclərlə respublika rəhbərinin şəxsən görüşməsi, onların qarşısında çıxış etməsi, məsləhət və tövsiyyələrini verməsi dahiyanə bir uzaqgörənlik və böyük millətsevərliyin ifadəsi idi. Respublikamızdan kənarda təhsil almağa gedən gənclərin bütün məişət qayğıları da ölkə başçısı ilə görüşə qədər Təhsil Nazirliyi və ayrı-ayrı rayon rəhbərləri tərəfindən öyrənilir və dərhal yerinə yetirilirdi. Bunu böyük öndər belə tələb edirdi.

1970-ci illərdən üzübuyana respublikadan kənarda təhsil almağa göndərilənlərin dinamikasına nəzər salsaq belə bir mənzərənin şahidi olarıq: Əgər 1970-ci ildə belə gənclərin sayı 50 nəfər idisə, 70-ci illərin sonunda biz bu rəqəmin 800-900 nəfərə çatdığını görürük. 80-cı illərin əvvəllərində isə artıq respublikadan kənarda təhsil almağa göndərilən gənclərin sayının 1400 nəfərə çatdırılmasına nail olunmuşdu. Burda bir incə məqama da diqqət yetirmək lazımdır ki, həmin gənclərin təqribən 400 nəfəri hərbi məktəblərdə təhsil alırdı. Uzaqgörən şəxsiyyət bu yolla

ölkənin kadr potensialını, intellektual bazasını möhkəmləndirmək üçün həmin illərdə respublikadan kənarda 15 mindən artıq yüksək ixtisaslı mütəxəssis hazırlanmasına nail olmuşdu. Bu, bizim Azərbaycandan kənarda ölkəmiz üçün ən gərəkli, kəskin tələbat olan ixtisaslar üzrə mütəxəssislər hazırlayan bir böyük ali məktəbimizin olmasına bərabər idi. Respublika rəhbəri həmin gəncləri oxumağa göndərməklə kifayətlənməyib, onların həm təhsil aldıqları illərdə üzləşdikləri problemlərin həlli ilə maraqlanır, həm də ali təhsildən sonra xalqa və dövlətə səmərə verə bilən işlə təmin edilmələri üçün xüsusi tapşırıqlar verir və onların yerinə yetirilməsinə bilavasitə nəzarət edirdi. Ən əsası da odur ki, respublikadan kənarda təhsil alan hər bir gəncin dəqiq uçotu aparılır, onların heç biri ulu öndərin diqqət və qayğısından kənarda qalmırdı. Məhz həmin uzaqgörənliyin nəticəsidir ki, bu gün müstəqil Azərbaycanda xalq təsərrüfatının və dövlətin idarə olunmasında kadr çatışmazlığı hiss olunmur. Burada onu da qeyd etmək yerinə düşərdi ki, Heydər Əliyevin təşəbbüsü ilə keçmiş İttifaqın böyük şəhərlərində təhsil almağa göndərilən, lakin təhsilini başa vurduqdan sonra bu və ya digər səbəbdən Azərbaycana qayıtmayan gənclərimiz də bu gün çox gərəkli bir işlə məşğuldurlar. Onlar dövlət başçımızın böyük uzaqgörənliklə hələ 1970-ci ildən başlayaraq formalaşdırdığı Azərbaycan diasporunun fəal üzvləri, millətimizin layiqli təmsilçiləri, xalqımızın sözünü deyən mühüm qüvvələrdir. Bizim indi görüb duyduqlarımızı uzaqgörən şəxsiyyət 1970-ci illərdən başlayaraq təməlini qoymuş, çox böyük uzaqgörənliklə bugünkü diasporanın formalaşmasına münbit baza və zəmin yaratmışdır.

Çox təəssüf ki, bu ənənə 1980-ci illərin ikinci yarısı, 90-cı illərin əvvəllərində respublikamızın o dövrkü rəhbərlərinin işbilməzliyi və səhlənkarlığı nəticəsində pozuldu və yaradılmış bu möhtəşəm ənənə səngiməyə başladı. Elə burada o vaxtlar çalışdığım, indi isə 90 illik yubileyini qeyd etməyə hazırlaşdığımız Şəki Pedaqoji Texnikumunun da taleyinə qara ruzigarlar əsdi. Hansısa qüvvələrin əli ilə 1987-ci ildən fəaliyyət göstərən (insafən də yaxşı fəaliyyət göstərən), öz ənənələri olan, respublikamızın, o cümlədən onun hüdudlarından kənarda fəaliyyət göstərən ümumtəhsil müəssisələri üçün yüksək ixtisaslı ortapillə mütəxəssislər hazırlayan bu dövlət müəssisəsi qapadıldı. O vaxtlar respublikada bunun səbəblərini izah edən bir kimsə tapılmadı. Böyük bir pedaqoji kollektiv, həm də yüksək təhsil vermək ənənəsi olan bir pedaqoji kollektiv ölkədə gündən-günə genişlənən işsizlər ordusuna qoşuldu. O vaxt texnikumun bazası əsasında Məişət Xidməti Texnikumu yaradıldı ki, onun da maddi texniki bazası sıfırdan yaradılmalı idi. Xalq Cəbhəsinin hakimiyyətdə olduğu illərdə isə yeni yaradılan texnikum bir az da gülünc vəziyyətə düşdü. 1990-cı illərin ilk illərində ölkə həyatının digər sahələrində olduğu kimi, təhsil sahəsində də çox acınacaqlı vəziyyət mövcud idi. Təhsil işi pozulmuş, məktəblərin fəaliyyəti zəifləmiş, iflic vəziyyətinə düşmüş, bəzi təhsil müəssisələri ümumiyyətlə öz işini dayandırmışdı. Özbaşınalıq, səriştəsizlikdən qaynaqlanan anarxiya, hakimiyyətsizlikdən rişələnən reketçilik, adam oğurluğu o qədər xof, vahimə yaratmışdı ki, bəzi hallarda valideynlər uşaqlarını məktəbə göndərməyə ehtiyat edirdilər.

1993-cü ildə Heydər Əliyevin hakimiyyətə yenidən qayıdışı cəmiyyətin bütün sahələri kimi, Azərbaycan təhsilini də üzləşdiyi bəlalardan xilas etdi. Hər cür mənfi proseslərin qarşısı qətiyyətlə alındı. Ölkədə qayda-qanun, əmin-amanlıq və ictimai-siyasi sabitliyin bərqərar edilmə-



***Ulu öndər Heydər Əliyev, Xalq şairi Bəxtiyar Vahabzadə və Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Şəkidə. 2002-ci il***

si nəticəsində digər sahələrdə olduğu kimi, təhsil sahəsində də normal fəaliyyət üçün şərait təmin edildi, tərəqqi və inkişaf üçün əsaslar yaradıldı. O vaxtdan bütün təhsil orqanlarımız və müəssisələrimiz normal fəaliyyət göstərir, uşaqlar, gənclər sərbəst təhsil alırlar.

Uzaqgörən, dahi şəxsiyyət Heydər Əliyevin hakimiyyətə ikinci qayıdışından sonra, məhz onun xidmətləri sayəsində Şəki Pedaqoji Texnikumunun da əlindən alınmış hüquqları özünə qaytarıldı. Şəki Pedaqoji Texnikumu 1994-cü ildən yenə əvvəlki kimi ölkəmizin şimal bölgəsi üçün yüksək ixtisaslı orta pillə pedaqoji kadr hazırlığı işini çox uğurla davam etdirir.

Heydər Əliyevin ikinci dəfə respublika rəhbərliyinə





qayıdışından sonra əvvəlki ənənə bərpa olundu. Ölkəmizin və təhsilimizin tarixində böyük yeri olan həmin mütərəqqi ənənə respublikadan kənarda mütəxəssis hazırlığı təcrübəsi ümummilli liderimizin diqqət və qayğısı sayəsində son 10 ildə daha əhatəli, daha sanballı şəkildə davam etdirilməkdədir.

Hazırda minlərlə azərbaycanlı gənc Türkiyə, ABŞ, Böyük Britaniya, Fransa, Rusiya, Çin, Misir, Çexiya, Koreya, Macarıstan – bütövlükdə isə dünyanın 40-a yaxın ölkəsində təhsil alır. Respublikamızın ali məktəblərinə hər il orta hesabla 25 mindən çox, texnikum və kolleclərinə isə 10 minə yaxın gənc qəbul olunur. Bütün bu göstəricilər bu günün reallıqlarıdır. Bütün bunlar son on ildə respublikamızın təhsil həyatında əldə edilən ən əhəmiyyətli nailiyyətlərdəndir.

Heydər Əliyev vaxtı ilə çox sərrast bir fikir söyləmişdi. «Başqa sahələrdə geriliyə, çatışmazlığa müəyyən qədər dözmək olar, o halların vurduğu zərərləri tezliklə aradan qaldırmaq olar. Amma xalqın, millətin təhsil sistemini qırmaq olmaz. Bu elə bir işdir ki, ardıcıl surətdə davam etməlidir. Bir il belə fasilə olsa, xalqa, millətə böyük zərbələr vura bilər».

Ulu öndər təhsili cəmiyyət həyatının ən öncül strateji əhəmiyyətli sahəsi hesab edirdi. O, iqtisadiyyatın da, cəmiyyətin başqa sahələrinin də təhsilə əsaslandığını, onun üzərində qurulduğunu vurğulayaraq göstərirdi ki, əgər bizim yüksək təhsil potensialımız, güclü kadr potensialımız, olmasa biz nə iqtisadi potensiala, nə elmi potensiala, nə də sosial potensiala malik ola bilmərik. Yaxşı təhsil ölkənin inkişafı üçün yaxşı əsas yaradılması deməkdir...Hər bir xalqın səviyyəsini onun bilik səviyyəsi müəyyən edir. Bilik

səviyyəsinə nail olmaq üçün isə təhsil ardıcıl surətdə inkişaf etdirilməlidir.



**_Ulu öndər Heydər Əliyev Respublika müəllimlərinin II qurultayında_**

Heydər Əliyevin çıxışlarında, söhbətlərində, müsahibələrində, məruzələrində təhsilin fəlsəfi mahiyyəti və strateji əhəmiyyətinə dair bu cür deyimlərə tez-tez rast gəlmək olar, təhsil işçilərimizə, müəllimlərə və gənclərə ünvanlanan çoxlu ibrətamiz nəsihətlərlə qarşılaşmaq olar.

Heydər Əliyev Azərbaycan təhsilini inkişaf etmiş dünya dövlətlərinin təhsil standartları ilə əlaqələndirmək, son nəticədə isə həmin standartlara cavab verən milli təhsil sistemi yaratmaq üçün mükəmməl bir islahat proqramının hazırlanmasına və həyata keçirilməsinə nail olub.

Heydər Əliyev təhsil islahatının həyata keçirilməsinə diqqət yetirməklə, təhsil ocaqlarına qayğı göstərməklə yanaşı, tələbə-gənclərin sosial problemlərini də unutmurdu.

O, «Azərbaycan Respublikasının ali məktəb tələbələri üçün Prezident təqaüdünün təsis edilməsi haqqında» 3 sentyabr 2001-ci il tarixli fərmanı ilə ölkənin ali məktəblərinə qəbul imtahanlarında ən yüksək nəticə göstərmiş tələbələr üçün Prezident təqaüdü təsis edib. Bu, postsovet məkanında heç bir yerdə analoqu olmayan çox müdrik və hümanist bir tədbirdir. Milli liderimizin bu qayğısı gənclərimizin təhsili üçün daha əlverişli şərait yaradılmasına, onların təhsilə olan həvəslərinin daha da artırılmasına yönəlib və s...







**Mehriban Əliyeva**
*Heydər Əliyev Fondunun prezidenti, YUNESKO və İSESKO-nun xoşməramlı səfiri, millət vəkili*

Heydər Əliyev vaxtı ilə demişdir: «Mən həyatımın qalan hissəsini də xalqıma bağışlayıram». Dahi şəxsiyyət həqiqətən də öz həyatını bütövlükdə Azərbaycan xalqının azadlığına, müstəqilliyinə və xöşbəxtliyinə sərf etdi, ömrünü şam kimi sonadək əritdi, ancaq sönmədi, işığa, nura, məşələ çevrilərək insanların qəlbində əbədi məskən saldı...

Bu gün bir həqiqətdir ki, Heydər Əliyevin vəfatı tarixindən illər ötdükcə, biz o tarixdən uzaqlaşdıqca, o nadir şəxsiyyətin böyüklüyü, onun ən uca zirvədə qərarlaşdığı daha aydın görünür. Biz ulu öndərin cismani ölüm tarixindən nə qədər uzaqlaşırıqsa, bir o qədər də onun ideyalarına yaxınlaşır, onun arzularına qovuşuruq. Heydər Əliyev dühasının işığı, nuru bizi daha aydın sabahlara – İlhamlı gələcəyə aparır. Memarı və qurucusunun da özü olduğu müstəqil Azərbaycanımıza rəhbərlik edən İlham Əliyev dövlətçiliyimizlə yanaşı, təhsilimizi də günü-gündən irəli aparır.

«Yeniləşən Azərbaycanda yeni məktəb» layihəsini fan-


*Təhsil naziri Misir Mərdanov Şəki məktəbliləri arasında*

tastik sürətdə həyata keçirən Heydər Əliyev fondu, bu fondun prezidenti, İSESKO və YUNESKO-nun xoşməramlı səfiri, millət vəkili Mehriban xanım Əliyeva Heydər Əliyev ocağının istisini, nurunu və işığını çox böyük həvəs və cəsarətlə Azərbaycan xalqına çatdırır.

Azərbaycanda Təhsil haqqında qanunun qəbul edilməsi də əsası Heydər Əliyev tərəfindən qoyulmuş dövlət siyasətinin formalaşdırılması və Azərbaycan təhsilinin hazırlanmış Milli Strategiyanın tətbiqi işinin həyata keçirilməsi nümunəsidir.

İnanırıq ki, illər keçdikcə Azərbaycan təhsili Heydər Əliyev dühasının işığında qabaqcıl dünya təhsil sisteminə inteqrasiya olunacaq, gündən-günə yeniləşən və çiçəklənən ölkəmizin təhsil sistemində daha möhtəşəm uğurlar qazanılacaqdır. Bunu Təhsil Nazirliyinin həyata keçirdiyi tədbirlər, hörmətli təhsil nazirimiz Misir Mərdanovun çıxışları, fəaliyyəti də sübut edir.

Ən başlıcası isə ümummilli liderimiz, dahi şəxsiyyət, ulu öndər Heydər Əliyev dühasının işığı bir mayak kimi Azərbaycan təhsilinə sürətli inkişaf və nailiyyətlər yolunu göstərir.





# II bölmə

## XIX yüzillikdə və XX yüzilliyin əvvəllərində Şəkidə təhsilin vəziyyətinə dair

Zəngin tarixə malik olan Şəki Azərbaycanın qədim şəhərlərindən biridir. Vaxtı ilə Nic, Qəbələ, Oğuz, Cəfərabad və Göynük nahiyyələrinin inzibati mərkəzi olan Şəki şəhəri respublikamızın ən səfalı, dilbər güşələrindən sayılır.

Belə bir fərziyyə vardır ki, şəhərin adı eramızdan əvvəl VII əsrdə Azərbaycan ərazisinə gəlib əsrlər boyu burada yaşamış saklarla bağlıdır.

Orta əsrlərə dair mənbələrdə onun adı müxtəlif şəkillərdə işlənmişdir. Şəki şəhəri uzun müddət Nuxa da adlandırılmışdır. Doğrudur, XIII əsr də daxil olmaqla şəhərin adı mənbələrdə və rəsmi sənədlərdə Şəki idi. Rusiyaya birləşdirildikdən sonra da xanlığın ərazisi inzibati vahid olmaq etibarı ilə rəsmən Şəki əyaləti adlanırdı. Yalnız 1846-cı il inzibatı islahatı ilə bütün əyalətə Nuxa qəzası, qəzanın mərkəzinə isə Nuxa adı verilmişdir. Bu hec də o demək deyildir ki, Nuxa adının mənşəyi yalnız XIX əsrlə bağlıdır. Nuxa hələ X əsrdə məlum olmuşdur.

Şəhərin ərazisi Xan yaylağı dağının cənub-şərq yamaclarından başlayıb dağətəyi düzənliyinə enir. Şəhər dəniz səviyyəsindən 675 metr yüksəklikdə yerləşir.

Şəki yaşıllıq və gül-çiçək şəhəri olmaqla yanaşı, həm də böyük bir sənətkarlar şəhəri idi.

Hər il İtaliyadan, Fransadan, yaxın və uzaq Şərq ölkələrindən Şəkiyə yüzlərlə tacirlər gəlirdi. Onlar gətirdikləri müxtəlif sənaye və ərzaq mallarının müqabilində Şəkinin əla növ baramasını, ipəyini və ipəkdən hazırlanmış məhsulları alıb öz ölkələrinə aparardılar.

İpəyi ilə dünya şöhrəti qazanmış Şəki qəzasında ötən əsrin əvvəllərində 60-dan çox buxarla işləyən baramaaçan fabrik, müxtəlif zinət və məişət əşyaları hazırlayan emalatxanalar var idi.

Təsadüfü deyil ki, Şəki ipəyi Moskva və London sərgilərində həmişə yüksək qiymətləndirilmiş, qızıl və gümüş medallara, tərifnamələrə layiq görülmüşdür.

Bu günə qədər gəlib çatmış bir sıra memarlıq abidələri, maddi mədəniyyət və sənət əsərləri şəkililərin fitri istedada, incə və bədii zövqə, yüksək sənətkarlıq qabiliyyətinə və incə yumora malik olduqlarını göstərir. Buna baxmayaraq Şəki qəzası XIX əsrin sonları və XX əsrin əvvəllərində maarif sahəsində geridə qalmış rayonlardan biri idi. Burada da əhalinin böyük əksəriyyəti savadsız idi. Savadsız və avamlığın təzahürü olan hər cür nadanlıq, cəhalət kök salmışdır. İnsanlıq, ləyaqət ayaqlar altında idi. Buna da başlıca səbəb o zamankı üsuli-idarə, savadsızlıq və avamlıq, bir də xalqın məişətində və şüurunda möhkəmlənmiş dini xurafat idi. Sadə bir məktub yazmağa ehtiyacı olan kəndlilər məscid hücrələrində və sair tinlərdə oturan mirzələrlə görüşmək üçün Şəkiyə (şəhərə) gələrdilər. Saatlarla, bəzən də günlərlə buna vaxt sərf edərdilər. Rayonda maarifin bu qədər geridə qalmasının əksinə olaraq, cəhalət, avamlıq bir o qədər dərin kök salmışdı.

Dövlət tərəfindən xalqın qayğısına fikir verilmədiyi kimi, onun maariflənməsi qayğısına da qalan yox idi. O zaman Şəki qəzasında 130-a yaxın məscid var idi. Bunlardan 26-sı şəhərdə, 99 məscid isə kəndlərdə dini təbliğatla məşğul olurdu. Din xadimləri məscid və onların nəzdindəki mollaxanalarda öz xeyirlərinə fəaliyyət göstərirdilər. Yaşlılar arasında dini təbliğ etmək vəzifəsini məscidlər, gənclər və yeniyetmələr arasında isə mollaxanalar həyata keçirirdi. «Mollaxana» və ya «Molla məktəbi» adlanan bu darısqal, lüzumsuz qurumların işləri xod gedirdi. Həmin mollaxanalarda çalışan mollalarla tək-tək valideyn görüşər, haqq danışar, övladını oraya oxumağa göndərərdilər. Oxu müddəti müəyyən deyildi. Bu hücrələrdə oxuyanlar 5 il, 7 il, hətta 8-9 il həmin hücrələrə gedər, bir neçə mənasını bilmədiyi sözləri əzbərləməkdən başqa bir şey öyrənə bilməzdilər.






***Rəşidbəy Əfəndiyev***

Görkəmli müəllim, metodist alim və yazıçı, Şəkidə pedaqoji məktəbin ilk təşkilatçılarından olan Rəşid bəy Əfəndiyev 1870-ci ildə Şəkidə daxil olduğu mollaxananı belə təsvir edirdi. «O zaman həmin məscidin həyətində olan hücrələrin hərəsində bir məktəb açılmışdı. Bu hücrələr dar, yeri torpaq olan bir otaqdan ibarət idi, həsirlə döşənmiş olduğu halda, məscid həyətinə baxan bir qapısı və xırdaca bir pəncərəsi var idi. Bu məktəbin (mən binəva Rəşid) 8 il şagirdi olmuşam».

Məscidlərdən başqa ayrı-ayrı evlərdə də qızlar və oğlanlar üçün bu tipdə olan «məktəblər» az deyildi.

XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanın ayrı-ayrı bölgələrində olduğu kimi Şəkidə də təhsil məsələsi özbaşına buraxılmışdı. Bu mollaxanalar ancaq din və şəriət qanunlarını öyrətməyi, təbliğ etməyi qarşısına məqsəd qoymuşdu, mollaxanalarda dünyəvi elm, ayrı-ayrı fənlər tədris edilmirdi.

Mollaxanalarda verilən təhsil heç bir proqrama əsaslanmayan təhsil idi. Bir az savadı olanlar da öz evlərində dərs verirdilər. Xüsusi evlərdə olan məktəbdarların yanında oğlan və qızlar da oxuyurdular. O məktəblərin əsas dərsliyi Quran və ərəb-fars dillərində yazılmış şeir kitablarından ibarət idi. Şagirdlərin yaxşı bilik və qavrama qabiliyyətlərindən asılı olmayaraq hamı həmişə eyni dərslikdən istifadə edirdi. Tədris üsulu isə əsasən «Məşq» və bu üsul ilə yazı yazdırmaqdan, biri də, müəllimi təqlid etməkdən ibarət olmuşdur. Şəkidə tək-tük də olsa belə təlim-tədris üsuluna etiraz edənlər olurdu. Belə adamlar isə təqib edilir və falaqqaya salınıb çubuq vurulmasından yaxa qurtara bilmirdilər.

XX əsrin əvvəllərində də Şəkidə təlim uzun müddət «falaqqa» dövrü keçirmişdir. XX yüzilliyin ilk onilliklərində də Şəki maarifi yenə sönük olmuş, bu zaman təlimdə iki məqsəd güdülmüşdür. Bir tərəfdən çar-mülkədar qanunlarını öyrətmək və onları müdafiə etmək, digər tərəfdən isə rus dilində savad vermək də tədrisə daxil edilmişdi. Bu illərdə Azərbaycanın tək-tək ziyalılarının təşəbbüsü ilə mollaxanalarla yanaşı üsuli-cədid məktəbləri təsis edildi.

Şəkidə «üsuli-cədid» üzrə dərs keçməyə başlayan ilk





məktəb 1831-ci ildə açılmış qəza məktəbi olmuşdur. Bu məktəbdə şəriət dərsləri ilə yanaşı ana dili, hesab, hüsnxət, sonralar coğrafiya, həndəsə və tarix fənləri də tədris edilmişdir. Həmin məktəb üç sinifdən ibarət idi və orada üç nəfər müəllim işləyirdi.

1833-cü il hesabatına əsasən o ildə, qəza məktəbində təhsil alanların sayı 29 nəfər olmuş və onlardan 21 nəfəri tacir balası idi.

1844-cü ildə bu məktəbdə oxuyanların sayı 50 nəfərə çatmışdısa da, siniflərin sayı eynilə qalmışdı.

M.F.Axundov və Rəşid bəy Əfəndiyev də mollaxanadan sonra bu məktəbdə təhsillərini davam etdirmişlər.

«Keçən əsrin 40-cı illərinə aid məlumatda isə istər Şəki şəhərində, istərsə də Şəki qəzasında daha çox məktəbin fəaliyyət göstərməsinə rast gəlirik. Məsələn. 1842-ci ilə aid bir rəsmi arxiv sənədində, bu vaxt təkcə Nuxa (Şəki) şəhərində 60 müəllimin rəhbərliyi altında 60 məktəbin olduğu və burada 500 şagirdin oxuduğu, Şəki qəzasında isə120 müəllimin fəaliyyət göstərdiyi 120 məktəbdə 900 şagirdin təhsil alması göstərilmişdir».[1]

Bu dövrdə Şəkidə «milli məktəb» adını daşıyan təlim ocaqları da açılmışdı. Bu məktəblərdə oxu və yazı təlimi aparılırdı. Həmin məktəblər «falaqqa» dövründən qalan müəllimlərin əlində idi. Belə məktəblər XX əsrin 20-ci illərinə qədər fəaliyyət göstərmişdir. Bu dövrdə dini mərasimlərin geniş şəkildə qeyd edilməsi, «müqəddəs» yerlərə sitayiş, çoxarvadlılıq, azyaşlı qızların ərə verilməsi geniş vüsət almış bir ənənəyə çevrilmişdi.

[1] *H.Əhmədov, S.Əfəndiyev:* «150 yaşlı Şəki məktəbi», «Maarif» nəşriyyatı,B.1983, səh14.

«XIX əsrin ortalarından başlayaraq Azərbaycanın məktəb təhsili tarixində ilk dəfə olaraq texniki peşə təhsili müəssisələri yaradıldı. Bu tipli peşə-sənət məktəblərinin ilk nümunəsi 1843-cü ildə «Səkidə Təcrübi ipəkcilik məktəbi» adı ilə açılmışdı».[1]

«Rus-Azərbaycan məktəblərinin yaradılmasının həqiqi tarixi və gələcək inkişafı Tiflis Müəllimlər İnstitutunun məzunları H.Mahmudbəyov və S.Qənizadənin adları ilə bağlıdır. Onların 1887-ci ildə Bakıda təsis etdikləri rus-Azərbaycan məktəbində rus məktəblərindən fərqli olaraq Azərbaycan dilinin tədrisi məcburi fənlər sırasına daxil edilmişdir.

Tezliklə Bakıda belə məktəblərin sayı 6-ya catdı.

Naxçıvan (1894), Nuxa (1894), Şuşa (1896), Salyan (1896) və Gəncədə (1899) də rus-Azərbaycan məktəbləri fəaliyyətə başladı".[2]

XIX əsrin ikinci yarısında 1882-ci ildən başlayaraq Şəki şəhərində və qəzanın böyük kəndlərində ikisinifli rus-tatar (azəri) məktəbləri, qızlar və oğlanlar gimnaziyası, sənət məktəbi kimi maarif ocaqları açılmışdısa da, onların hər biri bir-iki il fəaliyyət göstərdikdən sonra rühanilərin hökmü ilə qapadılmışdı. Bu məktəblərdə oxuyanların əksəri isə bəy, xan və tacir balaları idi. Arxiv materiallarından əldə etdiyimiz məlumatlara görə çar hökuməti zamanı Şəki qəzasında 16 məktəb olmuş və bu məktəblərdə 800-ə yaxın şagird, Azərbaycan Xalq Cümhuriyyətinin hakimiyyəti zamanı Şəki qəzasında 29 məktəb mövcud ol-

[1] Azərbaycan Milli Ensiklopediyası. «Azərbaycan Milli Ensiklopediyası» elmi mərkəzi. B. 2007. səh 682

[2] Yenə orada. səh.680





muş və bu məktəblərdə 1200 şagird təhsil almışdır ki, onlardan 76 nəfəri qızlar olmuşdur.

«1908-ci ildə Şəkidə əhalinin sayı 37003 nəfər olmuş, 1916- cı il yanvarın 1-də isə 52243 nəfərə catmışdır.

Çarizmin yerli xalqların mədəniyyətinin inkişafına mane olmasına baxmayaraq, Azərbaycanın ticarət və sənətkarlıq mərkəzlərindən biri olan Şəkidə maarif və mədəniyyəti inkişaf etdirmək yolunda bəzi addımlar atılmışdı. Əhalisinin əksəriyyəti savadsız olan Şəkidə 1831-ci ildə qəza məktəbi açıldı.

1834-cü ildə bir cox qəza məktəbi, o cümlədən Şəki qəza məktəbi üçsinifli oldu. Qəza məktəbindən başqa Şəkidə xüsusi şəxslərə məxsus və məscidlər nəzdində məktəblər var idi. Bu məktəblərdə əsasən şəriət dərsləri keçirilirdi.

1898-ci ildə şəhərdə yeni bir məktəb – rus-tatar (azərbaycanlı – *M.İ.*) məktəbi açıldı. 1904-cü ildə Şəkidə fəaliyyət göstərən 6 ibtidai məktəbdə 772 şagird təhsil alırdı.

1910-cu ildə Şəkidə artıq 10 oğlan, 2 qız ibtidai məktəbi fəaliyyət göstərirdi. 1910-cu ildə «Şəki şəhəri və qəza müsəlman əhalisi arasında savad yayan Nuxa cəmiyyəti» yaradıldı. Cəmiyyət müsəlmanlar arasında rus və doğma «Azərbaycan dillərində savad və ibtidai təhsil yaymağı» öz qarşısına məqsəd qoyur. Cəmiyyət fəaliyyətdə olan məktəblərə kömək etmək, öz vəsaiti hesabına yeni məktəb və mədrəsələr açmaq, cəmiyyət nəzdində oxu zalı – kitabxana açmaq, mühazirələr, axşam kursları təşkil etmək, teatr tamaşaları qoymaq, ədəbi gecələr kecirmək, yoxsul uşaqlara məktəbə daxil olmağa, təhsillərini davam etdirməyə kömək göstərmək, dərsliklər nəşr etmək və onları uşaqlara pulsuz

paylamaq, məktəbləri yaxşı bitirmiş uşaqlardan müəllimlər hazırlamaq və.s. işləri görməyi öhdəsinə götürürdü.

1914-cü ildə Şəkidə ali tipli ibtidai məktəb açıldı.

1916-cı ildə şəhər nümayəndələrinin xahişi ilə Azərbaycanlı qızların təhsil alması üçün Müqəddəs Nina xeyriyyə cəmiyyəti nəzdində qadın məktəbi acıldı».[1]

Dövlət hesabına saxlanılan məktəblərdən başqa Şəki şəhərində iki milli məktəb də var idi. «Sibqət» 1909-cu ildən 1912-ci ilə kimi, «Vətən» məktəbi isə 1916-cı ildən 1920-ci ilə kimi fəaliyyət göstərmişdir. Bu məktəblərin maliyyə xərci cəmiyyəti-xeyriyyənin hesabına ödənilmişdir.

O vaxtkı məktəblərin vəziyyətini çətinləşdirən və əksər hallarda onların bağlanmasına səbəb olan amillərdən biri də müəllim heyətinin çatışmaması idi. Fəaliyyət göstərən məktəblərin hamısında mollalar, qəza məktəbinin və ya ikisinifli məktəblərin məzunları və nadir hallarda kənardan dəvət edilmiş orta və natamam ali təhsili olan şəxslər müəllimlik edirdilər.

1882-1884-cü ildən sonra Qori seminariyasının Azərbaycan şöbəsini bitirmiş və yaxud İstanbul darülmüəllimində təhsil almış tək-tək müəllimlərə rast gəlmək mümkün idi.

Qori seminariyasının Azərbaycan (tatar) şöbəsi və rus-tatar məktəblərinin təsiri ilə Azərbaycanda, o cümlədən Şəkidə də köhnə məscid məktəbləri və məscidlərin yanında olan mollaxanalar tədricən bağlanmağa başladı. Rühanilərlə yeni fikirli və müasir təhsilli müəllimlər arasında mübarizə kəskinləşdi. Mollalar əhali arasında müəllimləri nüfuzdan salmaq üçün: «Müəllimlər namaz qılmır, oruc tutmur, şapqa qoyur, içki içir, onlar dinsizdirlər, onların yanına dərs oxumağa uşaq göndərmək böyük günahdır» – deyə təbliğat aparmağa başlayırlar. Belə təbliğatın əsas səbəblərindən biri də Qori müəllimlər seminariyasının tatar(Azərbaycan) şöbəsinin müdiri A.O.Çernyayevskinin Azərbaycan dilində sövti üsulla yazdığı «Vətən dili» və Rəşid bəy Əfəndiyevin «Uşaq bağçası» dərsliklərinin məktəb və maarif sahəsində böyük dəyişiklik əmələ gətirməsi idi. Həmin illərdə nə hazırlıqlı Azərbaycan dili müəllimləri, nə də şagirdlər üçün sövti üsulla yazılmış əlifba dərsliyi vardı. Köhnə tipli məktəblərdə isə qədim ərəb və fars dilində yazılmış dərsliklər şəklində tərtib edilmiş kitablardan istifadə olunurdu.

Vaxtı ilə M.F.Axundovun böyük səyi və təşəbbüsü ilə açılışına icazə alınmış və 1879-cu ildə təşkil olunan, A.O. Çernyayevskinin rəhbərliyi ilə çətin bir şəraitdə fəaliyyət göstərən Qori seminariyasının Azərbaycan (tatar) şöbəsi üç il sonra öz bəhrəsini verməyə başladı və 1882-ci ildə bu şöbənin ilk buraxılışı oldu. Həmin buraxılışda seminariyanı müvəffəqiyyətlə bitirən tələbələrdən biri də Rəşid bəy Əfəndiyev idi.

1882-1884-cü illər arası 6 nəfər şəkili gənc Qori müəllimlər seminariyasının Azərbaycan şöbəsini bitirərək Şəki qəzasına işə göndərilmişdir.

Bu ziyalıların gəlməsilə əlaqədar olaraq Şəkidə üç, Qəbələ, Oğuz, Xaçmaz, Qoxmuq, Göynükdə ikisinifli bir rus-müsəlman məktəbi açılmışdı. Bu yeni tipli məktəblərdə həmyerlilərimizdən Əhməd Bayramzadə, Yusif Əfəndiyev, Məmmədəli Xəlifəzadə, Rövşən Əfəndiyev, Əbdülməbud Əfəndiyev fəaliyyət göstərmişlər.

[1] Şəki. «Elm»nəşriyyatı, B.1988.səh.19-21


*Xeyriyyəçi Həsən kişi*

«Bu «yeni-üsullu» («üsuli-cədid»), yaxud o zamanlar deyildiyi kimi «milli» məktəblər yarımsavadlı mollaların dərs dediyi və dərs kitabları «Quran», Sədinin «Gülüstan» və «Büstan»ından ibarət olan köhnə mollaxana və mədrəsələrə böyük zərbə vurdu.Yeni məktəblərdə şagirdlər artıq həsir üstündə yox, partalarda otururdular, tabaşirdən, karandaşdan istifadə edirdilər. Qamışdan düzəldilmiş qələm əvəzinə, polad qələmucu işlədirdilər, məktəbin nizam qaydalarını öyrənirdilər və s. Bu yeni məktəblərin əhəmiyyəti bir də onda idi ki, uşaqlar ilk dəfə ana dillərində – Azərbaycan dilində elmlərin əsaslarını öyrənirdilər.

Azərbaycanda belə yeni məktəblərin açılması böyük bir mədəni hərəkatın başlanğıcı, yeni mütərəqqi ideyaların köhnə, çürük və mürtəce ideyalar üzərində ilk qələbəsi, mədrəsələrin ləğv olunmasının, cəhalətin məğlub olmasının başlanğıcı idi».[1]

Yeni açılan məktəblərə malik olmaq istəyən rühanilərə və köhnəpərəstlərə qarşı «Molla Nəsrəddin» jurnalında dərc olunmuş «Çaqqal» başlıqlı felyetonda deyilirdi.

«...Nuxa şəhərində iki yerdə gimnaziya açılıb: biri yuxarıbaşda – Çaqqal dərəsində, o birisi isə Dabbaxxanada.

A, molla, gələsən-görəsən, müsəlman balaları partapat necə oxuyurlar... İşlər çox yaxşı keçir. Amma bu zalım çaqqallar qoymurlar ki, müsəlman balaları dərs oxusun. Elə dərs başlanan kimi başlayırlar ulamağa. Sən Allah, molla dayı, bircə yaz ki, çaqqallar ulamasın...»[1]

[1] *Əziz Şərif,* «Cəlil Məmmədquluzadənin mühiti», «Azərbaycan» jurnalı 1957, səh:182-183.





Ruhanilərin təsir və təhriki ilə avam valideynlər öz uşaqlarını yeni açılmış «rus-tatar» məktəblərində oxutmaq istəmir və həmin məktəblərdə oxuyanları da müxtəlif yollarla təhsildən yayındırır, dini məktəblərə cəlb edirdilər.

Qori müəllimlər seminariyasının məzunları XX yüzilliyin əvvəllərində, həm də ondan sonra da Şəki qəzasında, bəlkə bütün respublikada maarifin tərəqqisi və gənc müəllim kadrlarının yetişdirilməsi işinə böyük və təqdirəlayiq əmək sərf etmişlər.

Bu zaman Şəkidə də maarif sahəsində ehtiyac və tələbat çoxalmışdı.

Rus-tatar məktəblərinin inkişafı tədricən Azərbaycanlı müəllim kadrlarının artması üçün şərait və zəmin hazırlayırdı. Azərbaycan dili bu məktəblərdə bir fənn kimi tədris olunmağa başlanmışdı. Bu məktəblər demək olar ki, Azərbaycanda ana dilində məktəb yaratmaq üçün pedaqoji zəmin hazırlayan ilk maarif ocaqları olmuşdur.

Lakin Azərbaycan dilinin tədrisinə həftədə 2-3 saat vaxt verməklə məsələ bitmirdi. Qarşıda anadilli ixtisaslı kadrların çatışmaması, proqram, dərslik və müəllim və şagirdlər üçün metodik vəsaitin yoxluğu kimi çox ciddi məsələlərin həlli dururdu.

XX əsrin ilk onilliklərində mətbuat səhifələrində qızğın mübahisə və mübarizələr gedirdi. Azərbaycanın mütərəqqi ziyalıları, müəllim və maarifpərvərləri proqram,

[1] «Molla Nəsrəddin» jurnalı, 1908, №14.

dərslik yaratmaq, Azərbaycan dili tədrisinin metodikasını hazırlamaq fikirləri irəli sürürdülər. Digər tərəfdən onlar məktəblərə təsadüfü adamların, rühanilərin Azərbaycan dili müəllimi təyin edilməsinə qarşı öz etirazlarını bildirirdilər.

Azərbaycan dili tədrisinin metodikasını yazmaq, bu xüsusda məqalələr, kitabçalar buraxmaq haqqında da fikirlər irəli sürülürdü.

Həsən bəy Zərdabi «Açıq məktub» başlıqlı məqaləsində müəllimləri yazıb-yaratmağa, dərsliklər hazırlamağa, məktəb şagirdlərinin bilik və görüş dairəsini genişləndirmək məqsədilə elmi əsərləri tərcümə və nəşr etmək işinə qoşulmağa çağırırdı.

«.... Yazın görək nə oxuyaq, necə oxuyaq, harada oxuyaq? Bəlkə siz elə fikir edirsiniz ki, məktəblərdə verdiyiniz dərslər bəsdir, artıq lazım deyil? Yox, yox, o vaxtlar keçibdir, damcı-damcı ilə yaramız sağalan yara deyil, indi sel vaxtıdır. Elm gərək sel kimi axsın ki, hər istəyən ondan içib doya bilsin. Belə yanğı vaxtında hər millətini istəyənin borcudur ki, birə-beş artıq işləsin... Gözlərimizi dövlətlilərin əlinə dikib, onların qara sandıqlarına ümid olmaq nahaqdır.» [1]

Elə bu baxımdan da yeni məktəbləri saxlamaq üçün savadlı müəllimlər lazım idi.

1917-ci ildə birinci dəfə açılmış olan üçaylıq pedaqoji kursu bitirənlər ibtidai məktəb müəllimi vəsiqəsi aldı.

Lakin bütün bu tədbirlər xalq maarifinin tələblərini ödəmirdi. Vəziyyət elə idi ki, şəhərin özündə belə məktəbyaşlılar məktəblərə cəlb olunmamışdılar. Xüsusən, qızla-

[1] «Həyat qəzeti», 1905-ci il, № 35




rın təhsilə cəlb olunması cox acınacaqlı vəziyyətdə idi. Tarix boyu elmin ziddinə olan avamlıq və xurafatdan doğan şəriət qanunları maarifin inkişafına mane olurdu. Yalançı və fırıldaqçı din xadimləri öz mövqelərindən azacıq da olsa geri çəkilmək istəmirdilər.

Buna görə də Şəki qəzasının əhatə etdiyi Qəbələ, Nic, Cəfərabad, Göynük nahiyyələrinin 120 kəndi daxil olmaqla bütün yerlərdə oxuyan şagirdlərin sayı 1500-dən artıq deyildi. (1917-ci il siyahısına görə)

1916-cı ildə Rəşid bəy Əfəndiyev yay-tətili dövründə xalq məktəblərini müəllimlə təmin etmək üçün Nuxada qısa müddətli müəllimlər kursu təşkil edir, yeni açılan məktəblər üçün müəllimlər hazırlayırdı.

Şəkidə 1911-1917-ci illər arası tərəqqipərvər ziyalıların təşəbbüsü ilə bir çox əziyyətlər hesabına açılmış səkkizillik klassik gimnaziya, dördsinifli sənət məktəbi, qız məktəbi də bir neçə il davam etdikdən sonra rühanilərin təsiri ilə bağlandı.

Düzdür, Şəki XIX əsrdə Azərbaycan ictimai fikir tarixinə Mirzə Fətəli Axundov kimi böyük mütəfəkkir, yazıçı və dramaturq, İsmi bəy Nakam kimi şair, Rəşid bəy Əfəndiyev kimi maarifpərvər, dramaturq və pedaqoq, şeirləri dillər əzbəri olan aşıq Molla Cümə, Ələsgər Abdullayev şəikli Ələsgər kimi məşhur xanəndə, onlarla xalq sənətkarı bəxş etmişdir. Lakin onlar keçmişdə qaranlıq zülmət içində tək-tək parlayan dan ulduzları idi.

XX əsrin üçüncü onilliyinin ilk illərindən xalq maarifi özünün sürətli inkişaf dövrünə qədəm qoydu. 1920-ci ilin may ayında Şəkidə Qəza İnqilab Komitəsi yanında xalq maarifi şöbəsi yaradıldı. Qabaqcıl maarifçi Ələkbər Mahmudov şöbəyə müdir təyin edildi.

Xalq maarifinin birdən-birə dirçəldilməsi, inkişaf etdirilməsi çətin idi. Çünki məktəb binaları, dərs ləvazimatları yox idi, müəllim çatışmırdı.

Fərdi təqaüdçü Əhməd Nəbiyevin 1970-ci ildə «Şəki fəhləsi» qəzetində dərc olunmuş «Şəkidə maarifin tarixindən» başlıqlı xatirələri XIX əsrin sonu, XX əsrin əvvəllərində Şəkidə xalq maarifinin vəziyyətini əks etdirdiyindən, həmin sətirləri bir də sizinlə birlikdə oxuyuruq.

«Şəkidə ilk milli məktəb 1893-cü ildə açılmışdı. Bu məktəb əvvəlcə kirayə edilmiş əczaxana binasında açılıb, iki aydan sonra yuxarı birinci cümə məscidinin (Xanzadələrin məscidi) həyətində tikilən binaya köçdü.

Çar hökuməti zamanı milli məktəblərin açılmasına icazə verilmədiyindən bu məktəbdə ancaq şəriət dərsləri keçiriləcəkdir deyə icazə alınmışdı.

Hafiz Məhəmməd Əmin Şeyxzadə müdir, Ömər Faiq Nemanzadə, Qəzənfər bəy Cavanşirov, Hacı Molla Zəkəriyyə, molla Tacəddin İmamzadə müəllim idilər.

Məktəbə 16-18 yaşı olanlar da qəbul olunurdu. Yaşlı tələbələr sırasında Məmməd Hacı Süleyman oğlu, Əbdül Kazım Nəbiyev (Sabit Rəhmanın atası), Əhməd Hacı Kərim oğlu, Hacı Ağakişi oğlu, Əbdülsəlam Əfəndizadə və törələrin Osmanı vardı.

Məktəb bir çox müşkülat və etirazlardan sonra rəğbət qazandı. Qafqaz aləmində misli görünməmiş bu təzə üsulda məktəbə şəhərdən və ətrafdan (Oxuddan) şagird qəbul edildi. Üsul və intizamı ilə bu məktəb gün-gündən xalqın nəzər-diqqətini cəlb eləyib bir neçə il ərzində hər il artmaqda, böyüməkdə idi.

Dərs haqqı ayda bir manat idi. 1986-cı ildə məktəbin həyətində tələbələrin müəllimlər ilə və məktəbin üç nəfər





hamisi – Hacı Süleyman Hüseynov, saatsaz Mustafa Bədəlov və Hacıağa Məhərrəm Hüseynov ilə birlikdə foto rəsmləri alınmışdır. Bu şəkil «Tərcüman» qəzetində dərc olunmuşdu.(Bu fotoşəkil məktəbin keçmiş tələbəsi olan Məmməd Ləlezadə müəllimdə də vardır.)

Şeyxzadənin arvadı Əsmə Soltan xanın qızı Şəfiqə xanımın yardımı ilə evində qız məktəbi açmışdı. Oraya kiçikyaşlı oğlan uşaqları da qəbul olunurdu. (Abdulla Əbdürrəhmanov ibtidai təhsilini orada almışdı.) Oğlan uşaqları üç il oxuduqdan sonra sövtiyyə məktəblərinə köçürülürdü.

1897-ci ildə Şeyxzadəni Şamaxıya dəvət edirlər. O, ailəsini də götürüb oraya köçür. O gündən etibarən qız məktəbi də bağlanır.

Şeyxzadənin yerinə Molla Ağakişi təyin olunur. Tələbələr get-gedə azalır.

Ömər Faiq ana dili dərslərini hökumətdən gizli keçirdi. Ona görə də hər dərsdə uşaqlara bu dərslərin keçməsini: «bir kəsə deməzsiniz», – deyə tapşırırdı.

Məktəbdə yeni üsuli-cədid üzrə dərs keçilməsi Şəkidə mövcud mollaxanalardan uşaqların bu məktəbə gəlməsinə səbəb oldu. Bu, mollaxanalara böyük zərbə idi. Ona görə mollalar məktəbi bağlatdırmağa çalışırdılar. Mollalar və avam adamlar şəhər məktəblərində uşaqların rus dərsi keçməsi və başlarına şapka qoymalarına görə övladlarını məktəbə vermirdilər. 1908-ci ilə qədər şəhər məktəbində 3-4 nəfər azərbaycanlı və rus uşaqları oxuyurdu. Mollalar üsuli-cədid məktəbində rus dili dərsi keçirilməsini sevmirdilər. Ona maneçilik edirdilərsə də bacarmırdılar. Çünki rus dilini arzu edənlər çox idi.

Paxıl və fəsad mollalar Gəncə qubernatoruna xəbər

verdilər ki, üsuli-cədid məktəbində bütün fənləri türkcə keçirlər. 1898-ci ildə Gəncədən üç nəfər jandarm gəlib yoxladı. Onlar gedəndən bir ay sonra Ömər Faiqi məktəbdən xaric etdilər.

Məktəbin varidatını artırmaq üçün Ömər Faiq teatra əl atmışdı.

1896-cı ilin yanvarında «Tərcüman» qəzetində yazılmışdı:

«Dekabrın 25-də birinci dəfə olaraq Şəkidə ana dilimizdə teatr oynandı. Mirzə Fətəli Axundovun əsərlərindən «Müsyo Jordan və Məstəli şah» komediyası oynandı».

«Tərcüman» qəzeti Şəki məktəbi haqqında 1897-ci il aprelin 16-da belə yazmışdı: «Məktəblərdə rus dərsləri tərəqqi edir. Gənc və ziyalı müəllim Qəzənfər bəy Cavanşirov dərslərində məharət kamilə icrasilə məktəbin üzünü güldürməkdədir. Bundan 2 sənə müqəddəm şəhərdə 40 şagird oxumaz ikən bu gün 200 şagird rus lisanı təhsil edir. Şəhərimizin naçalniki Asanidze, xalq məhkəmə rəisi Mürsəl bəy Şahmalıyev, qlava rəisi Şirəli bəy Əmircanov, qubernski məclisinin sədri qazi Məhəmməd Əfəndi şəhərin maarif cəhətinə diqqət edirdilər».

Müəllim Ömər Nemanzadə 1898-ci ildə «Tərcüman» qəzetində yazmışdı: «Bəzi şəhərlərdə üsuli-cədid məktəblərindəki şagirdlərin əksəri məktəbdən çıxdıqdan sonra daha böyük məktəblərə, ya ki, mədrəsələrə girməyib atalarının əski sənətinə qayıdırlar». Məlumat elmiyə və fənniyyələri az olduğundan ya ata sənətlərini tərəqqi etdirə bilməyirlər, ya da yeni və müqəyyəd bir iş görə bilmirlər. Bu hallar mülahizə olunub qeyrilərinə nümunə olmaq üzrə Şəki məktəbində bu ildən etibarən sənəd şöbəsi təsis olunacaqdır. İbtidai halda şagirdlərə ipəkqurdu haqqında məlumat veriləcəkdir».





H.Şeyxzadə Şamaxıda məktəb açdıqdan iki il sonra, yəni 1899-cu ildə təkrar Şəkiyə gəlib bir il daha məktəb müdiri olmuşdur.

Ancaq məktəb tərəqqi etmişdir. Təxminən 1906-cı ildə məktəb yenə camaat idarəsinə keçir.

Məmmədəli Xəlifəzadə «Təzə həyat» qəzetinin 1907-ci il 5 avqust nömrəsində yazmışdır:

«Bu gün 24 iyulda Şəkinin birinci milli məktəbinə camaat tərəfindən müəllim təyin olundu. Həmin gündən etibarən məktəbə şagird qəbul edirik.

Balaları avam adətlərdən tərk etdirib, mədəni adətlərə sövq edəcəyik. Bizi buraya təyin edən əşxaslar da camaata ümid bağlayıb şagird çoxaldıqca məktəbi böyütmək niyyətindədirlər».

Burada ikinci müəllim Haşım Məmmədzadə, rus dili müəllimi Mirrövşən Əfəndiyev idi.

1905-ci il inqılabının təsiri altında 1906-cı ildə Azərbaycan şəhərlərində məktəblər, kurslar, qiraətxanalar açmaq üçün «Cəmiyyəti xeyriyyə»lər, «Nəşri-maarif»lər təşkil olunub maarifə böyük xidmətlər etmişlər. «Rəşid bəy Əfəndiyevin təşəbbüsü ilə bütün şəhər camaatı ilə birlikdə üləmalar, ürəfalar, idarə məmurları birinci cümə məscidi həyatinə yığılıb Təzə Karvansaranın altında (köhnə naçalnik dəftərxanasında) bir qiraətxana açılmasını qərara aldılar.»[1]

Şəkidə 3 mollaxana var idi: molla Muxtar Bayramzadə, molla Kazım Axundzadə və molla Mizandar mollaxanaları. Molla Fərəc Axund bu 3 molladan ən müqtədiri – Mol-

[1] *Həsən Tahirzadə*, «İrşad», 21 iyul 1906-cı il.

la Kazım Axundzadəni 1906-cı ildə öz tələbələri ilə Daşlı Bazarın arxasında Hacı Məmmədsadiq Əliyevin tikdirdiyi binaya köçürüb, yazı taxtası və skamyalar qoydurub oranı milli məktəb şəklinə saldı.

Həmin gündən buraya rus dili müəllimi kimi Təhmasib bəy Quliyevi dəvət edir. Quran, şəriət, tarix-ənbiyə və fars dərslikləri də keçirilirdi. Dərs haqqı hərədən bir manat idi.

1907-ci ildə Təhmasib bəy məktəbdən çıxarılır. Onun yerinə Mirmusa Ağamirov təyin olunur. Uşaqlar çoxalıb siniflər artdığı üçün Cavad bəy Bağırbəyov ikinci rus dili müəllimi təyin olunur.

1908-ci ildə müdir Ağamirov məktəbi hökumətə təslim edir. O gündən məktəb II rus-müsəlman(tatar) ibtidai məktəbi adını alır. Bu məktəbdə türkcə, farsca və rusca dərslər keçirilirdi. Başqa elmi dərslər keçirilməzdi. Hər məktəbdə bir və ya iki rus dili müəllimi və bir nəfər molla (şəriət dərsi keçmək üçün) olurdu.

1906-cı ildə Məqsud bəy Lütfəlibəyovun evində bir qız məktəbi açılır. Məktəbin müdirəsi Leyla Lütfəlibəyova, müəllimləri Tamara Rəhimova (Qışlaqdan), Maral Əfəndiyeva (Nəbiyeva), rus dili müəlliməsi Rinsima Nəsibova idi. Burada müəllimlər təmənnasız dərs keçirdilər. Uşaqlardan dərs haqqı yox idi, yəni alınmırdı. Məktəbə çox qızlar yığıldı. Onlardan biri də Bilqeyis Haşımzadə idi.»

Yuxarıda da qeyd etdiyimiz kimi Bütöv Azərbaycanda olduğu kimi Şəkidə də müəllim çatışmamazlığı səbəbindən yeni məktəblərin açılması işi çox ləng gedirdi. Bu bir səbəb idisə, əsas səbəb isə çar hökumətinin nəzarəti altında saxladığı ucqarlarda yerli əhalinin maariflənməsini çox ustalıqla əngəlləməsi idi.





# III bölmə

## Şəki Pedaqoji Texnikumunun təşkili və inkişafı

Müstəqil Azərbaycan Respublikası bu gün özünün ən məsuliyyətli tarixini yaşayır. Ölkəmizdə demokratik dövlət qurulmuş, onun təsisatları yaradılmışdır. İndi cəmiyyətin bütün sahələrində köklü islahatlar gedir. Bütün bunlar isə ölkənin simasını büsbütün dəyişib... Azərbaycanın insan hüquqlarına və azadlıqlarına qovuşması üçün təminatlar yaradılıb, demokratikləşmənin davamlı prosesə çevrilməsi, müstəqilliyimizin dönməzliyi və əbədiliyi təmin edilmişdir. Bütün bunların nəticəsi olaraq Azərbaycanda – onun bir parçası olan Şəkidə pedaqoji kadrların hazırlanması istiqamətində böyük xidmətlər göstərmiş Şəki Pedaqoji Texnikumunun təşkilinə, onun inkişafı tarixinə nəzər salmaqla pedaqoji fikir tariximizə kiçik bir töhvə verəcəyimizi düşünürük.

Yarandığı 1920-ci ildən günümüzədək bu təhsil müəssisəsi müxtəlif adlarla fəaliyyət göstərmişdir.

1920-ci ildə ayrı-ayrılıqda oğlan və qız seminariyası (darülmüəllim və darülmüəllimat) kimi fəaliyyətə başlamış, 1926-cı ildən oğlan və qız seminariyaları birləşdirilərək müttəhid pedtexnikum halında çalışmış, 1928-ci ildən M.F.Axundov adına Nuxa Pedaqoji Məktəbi, 1932-ci ildən İ.V.Stalin adına Nuxa Pedaqoji Məktəbi, Şəki Pedaqoji Texnikumu kimi fəaliyyət göstərmişdir.

Ötən illər ərzində pedaqoji texnikum Azərbaycanımız üçün elmi, pedaqoji cəhətdən yüksək hazırlıqlı kadrlar yetişdirib ərsəyə çatdırmışdır.

Biz indi də bu texnikumun təşkilində, onun formalaşmasında böyük əmək sərf etmiş Azərbaycan maarifpərvərlərinə – maarif pərvanələri və fədailəri Rəcəb Əfəndiyevə, Rəşid bəy Əfəndiyevə və digərlərinə bizə zəngin və möhtəşəm bir irs qoyub getdikləri üçün çox minnətdarıq.

Bu minnətdarlıq hissi ilə də texnikumun inkişaf tarixini vərəqləyək.

Azərbaycan SSR Nazirlər Soveti yanında Baş Arxiv İdarəsinin 29 fevral 1977-ci il tarixli 6/700 nömrəli məktubuna əsasən söyləyirik. Şəki Pedaqoji Texnikumu 1920-ci ilin oktyabr ayında yaradılaraq fəaliyyətə başlamışdır. Mərkəzləşdirilmiş arxivin materialında göstərilir ki, 1920-ci ildə 49 №-li protokola əsasən Nuxa oğlan və qız seminariyasının təşkilinə başlanmış, məktəbin saxlanmasına müəyyən pul vəsaiti ayrılmış və maliyyələşdirilmişdir.

Beləliklə, 1920-ci ildə Şəkidə oğlan və qız seminariyaları açıldı. Qız seminariyası 2№-li uşaq evi binasında, oğlan seminariyası isə Əliyevlərin iki binasında – biri indiki əsas binada (o zaman yataq binası idi.), ikincisi isə yuxarı bina adlandırılan tədris binası idi. Hələ o zaman mövhümata aldanan bir sıra valideynlərin öz qızlarını yeni açılan məktəblərə buraxmaması ağır işləri bir az da çətinləşdirirdi. Ona görə də seminariyaya qızları toplamaq üçün R.Əfəndiyev qızı Mahtaban xanımla birlikdə, Şəki, Zaqatala və Göyçay qəzalarının kəndlərini gəzib qızlar arasında geniş təbliğat aparırlar.

Şəki seminariyalarının təşkilinin ilk illərindəki iştirakı haqqında Rəşid bəy Əfəndiyev Azərbaycan Elmlər Akademiyasının Əlyazmalar Fondunda saxlanılan tərcümeyi-halında belə yazır: «Məmləkətimiz şuralanandan sonra qadın azadlığı, qadın urfanı kimi mühüm surətdə həll etdiyindən mən də ömrüm uzunu bəslədiyim həmin məqsədlərimi adəmdən vicudə keçirdik. 1920-ci il sənədə noyabrın 20-də qızım Mahtaban başda olmaq şərti ilə Nuxa uyezdini gəzdim, kəndlərdən savadlı, savadsız qızları toplayıb gətirdim. Darülməlumat açdım, maddi səbəb oldum, darülmüəllim və darülməlumat müstəqil halda 6 il yan-yana yaşadı, birləşdi və 1926-cı sənədən Müttəhid pedtexnikum halında yaşayıb, qırmızı müəllim və müəllimlik verməkdədir.»





Bununla bağlı başqa bir mənbədə oxuyuruq: «Rəşid bəy Əfəndiyev 1916-1917-ci tədris ilində İrəvan quberniyasındakı Azərbaycan məktəblərinə inspektor təyin edilmişdir». 1917-ci ildə Rəşid bəy Tiflisdən aldığı əmrlə əlaqədar Naxçıvana gedir, orada da 3 aylıq müəllimlər kursu yaradır.

1918-ci ildə isə Bakıda 2 əsas və 2 hazırlıq siniflərindən ibarət müəllimlər seminariyası təşkil etmiş, özü isə müdir olmuşdur.R.Əfəndiyev Azərbaycanda sovet hakimiyyəti qurulandan sonra fəaliyyətini genişləndirmiş və Nuxaya 3 aylıq müəllimlər kursu açmaq üçün göndərilmişdir. Bu işdə təcrübəsi olan R.Əfəndiyev Nuxada qadın və kişilər üçün daha iki seminariya yaratmışdır. 1926-cı ildə isə bu seminariyaları birləşdirib Nuxa Pedaqoji Texnikumunu açmışdır.»[1].

Şəkidə ilk gimnaziyanın açılmasına icazə verildi. Rəcəb Əfəndiyev yüksək ixtisasalı kadr kimi *(Bu vaxt Rəcəb*

---

[1] *F.Ə.Seyidov* «Qori seminariyası və onun məzunları» – «Maarif» nəşriyyatı. B. 1988. Səh. 206

*Əfəndiyev təyinatla Göyçay qəzasına getmiş və orada çalışırdı.) 1915-ci ildə həmin gimnaziyanın direktoru təyin edildi. Azərbaycanda sovet hakimiyyətinin qələbəsini böyük ruh yüksəkliyi ilə qarşılayan Rəcəb Əfəndiyev işlədiyi gimnaziyanı pedaqoji texnikuma çevirir və 1927-ci ilədək orada direktor vəzifəsində çalışır.*[1]

İbtidai məktəblər beşillik idi. İbtidai məktəbi bitirdikdən sonra yeddiillik nümunə-zəhmət məktəblərini bitirən gənclər seminariyaya qəbul olunurdular. İbtidai sinifdən gələnlər əvvəlcə ehtiyat siniflərinə daxil olur, iki il burada təhsil alırdılar. Tələbələr 4 ildən sonra seminariyanı bitirmiş hesab olunurdular. Ümumiyyətlə, seminariyanı 11 ilə bitirənlər orta təhsilli, çox kamil kadr kimi yetişirdilər.

Seminariyanın birinci və ikinci buraxılışının məzunlarına nəzər yetirək. Oraya daxil olanlar vaxtilə Azərbaycanda sovet hakimiyyəti qurulmasından əvvəl Şəkidə ən məşhur gimnaziya və qorodskoy məktəblərində təhsil alan şagirdlər idi.

Şagirdlərdən kim gimnaziyanı və qorodskoyun ikinci sinfindən gəlmişdirsə, onlar seminariyanın 2-ci ehtiyat sinfinə daxil olub, 5 il təhsildən sonra pedaqoji məktəbi bitirmiş hesab olunurdular. Qorodskoyun birinci sinfini bitirib gələnlər birinci ehtiyata girib 6 ildən sonra darülmüəllimi və darülmüəllimatı bitirmiş hesab olunurdular. Əhməd Rəhimli və onun bütün birinci buraxılış yoldaşları qorodskoyun 2-ci sinfini bitirib 2-ci ehtiyat sinfinə daxil olaraq, 5 ildən sonra – yəni 1925-ci ildə pedaqoji məktəbi bitirmişlər.

Qız seminariyasının ilk direktoru Türkiyədə təhsil almış Yusif Əfəndiyev olmuşdur. Burada Rəşid bəy Əfəndiyev, qızı Mahtaban Əfəndiyeva, Məmmədəli Xəlifəzadə, Əhməd Bayramov, Yusif Əfəndiyev kimi qabaqcıl müəllimlər dərs deyirdilər.

[1] *F.Ə.Seyidov* «Qori seminariyası və onun məzunları» , «Maarif» nəşriyyatı, B.1988, səh.188





Darülmüəllim və darülmüəllimat müxtəlif binalarda yerləşsələr də, onlar bir-birilə müntəzəm olaraq təmasda idilər. Rəşid bəy Əfəndiyevlə Rəcəb Əfəndiyev həm qız, həm də oğlan məktəblərində dərs deyirdilər. Hər iki texnikum yüksək səviyyəli təhsil ocağıtək xalqın təfəkküründə seminariya təsəvvürü yaratmışdı.

Hər iki texnikumu, tədris işləri ilə yanaşı, qarşılıqlı metodiki, bədii kütləvi tədbirlər də birləşdirirdi.[1]

Birinci buraxılışın məzunlarından bir qismi haqqında əldə etdiyimiz aşağıdakı məlumatları nəzərinizə çatdırırıq.

1. Heydər Əfəndiyev – Sonralar geoloq ixtisasına yiyələnmiş, professor, kimya institutunun direktoru olub.
2. Şaban Barxalov – (BDU-nun professoru olub)
3. Qafar İbadzadə(İbadi)– Sonralar bioloq ixtisasına yiyələnib, elmlər namizədi olub.
4. Əhməd Rəhimli –
5. İbrahim Hacızadə – bioloq, elmlər namizədi.
6. Mirzə Salehli – 1939-1941-ci illərdə Şəki Pedaqoji Texnikumunun direktoru olub. Müharibəyə gedib. Müharibədən sonra 1945-1952-ci illərdə yenə texnikum direktoru, sonralar isə ali məktəblərdə işləmişdir.
7. Rəsul Əfəndiyev – elmlər namizədi, Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda müəllim.
8. Əliheydər Əfəndiyev – Zaqatala Pedaqoji Məktəbində müəllim

[1] *M.Qiyasbəyli.* «Rəcəb Əfəndiyev», «Çaşıoğlu» nəşriyyatı, B.2001-səh.9

Ümumiyyətlə, yuxarıda da qeyd etdiyimiz kimi 1925-ci ildə 18 nəfər gənc oğlan və 4 nəfər qız darülmüəllim və darülmüəllimatı bitirib müəllim ixtisasını qazanmışlar.

Bu xüsusda qəza partiya komitəsinin 1925-ci il may ayında keçirilmiş 10-cu plenumunda komitənin katibi Tağıyev yoldaşın məruzəsindən aşağıdakı sitatı gətirmək olar:

«...Nuxa darülmüəllimi tərəfindən 22 nəfər yeni ruhlu müəllimlər buraxılmasına nail olduq. Bunlardan 4 nəfəri qızdır. Keçən il qəzanın bütün məktəblərində 1800 şagird oxuyurdu. Bu il isə 3800 nəfər təlim və tərbiyə almaqdadır.»

Başqa bir təbrik.

«Nuxa fəhləsi» qəzetinin 1925-ci il 21 may tarixli 37/424 №-li nüsxəsində çap edilmiş materiallardan:

## Təbrik

Nuxa darülmüəllimindən birinci dəfə gənc müəllimlərin buraxılması münasibətilə qəza firqə komitəsinə Azərbaycan Mərkəzi Komitəsindən aşağıdakı məzmunda təbrik teleqramı gəlmişdir.

«Nuxa» qəza firqə komitəsinə.

Azərbaycan Mərkəzi İcraiyyə Komitəsi heyəti-rəyasəti Nuxada zükür darülmüəlliminin əvvəlinci dəfə müəllim tərxisi aparan Nuxa zəhmətkeşlərinə atəşin salamlar göndərir.

Mərkəzi İcraiyyə Komitəsi inanır ki, cavan müəllimlər maarif cəbhəsində cəhalətlə mübarizə edərək, şura





hökumətinin kəndləri və təsərrüfatı yüksəltmək işində ona gözəl yardımçı olacaqlar.

«Yaşasın müəllimlər, maarif, kəndlilər»

№4897.

*Azərbaycan Mərkəzi*
*İcraiyyə Komitəsinin katibi -Şahbazi.*

O cümlədən Naxçıvan Vilayət Partiya Komitəsi də Nuxa darülmüəlliminin birinci buraxılışını aşağıdakı şəkildə təbrik etmişdir:

Naxçıvan təşkilatı cümhuriyyətin dağılmış təsərrüfatını əhya etmək işinə ciddi surətdə çalışdığını binaən, sizin təntənəli bayramınızda iştirak etməyə imkan tapmadığıma təəsüf edirəm. Naxçıvan təşkilatı bürosu səmimi qəlbdən Nuxa zəhmətkeşlərinin maarif cəbhəsində qələbələrini təbrik edir və ümid edir ki, gənc maarifçilər geridə qalmış Naxçıvan zəhmətkeşlərinin dəvətinə səs verəcəklər.

Yaşasın maarif cəbhəsində zəhmətkeşlərin qələbəsi!

№ 2441.

*Naxçıvan vilayət*
*Komitəsi bürosunun katibi.*

Nuxa Pedaqoji Məktəbinin on illiyi münasibətilə hər yerdən çoxlu təbrik teleqramları gəlmişdir. Bu teleqramlar ondan irəli gəlir ki, Azərbaycan xalqı savadlanmasa, maarif cəbhəsi qüvvətlənməsə, cəmiyyəti möhkəmləndirmək olmaz. Maarif cəbhəsi möhkəmlənməsə, fəhlə və kəndlilər savadlanmasa, ittifaqı möhkəmləndirmək olmaz.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, Xalq Torpaq

Komissarı Dadaş Bünyadzadə də Nuxa darülmüəlliminin Pedaqoji şurasına məktub göndərmişdir. Onun məktubunda oxuyuruq.

«Nuxa darülmüəlliminin» pedaqoji şurasına.

Gənc qüvvələrin Azərbaycan kəndlərinin mədəni inkişafına, həsr edən təzə xalq maarif işçilərinin tarixini təbrik edirəm.

Həqiqi xalq müəllimləri tarixinə öz ciddi cəhdləri ilə müvəffəq olan pedaqoji heyətinə yoldaşlıq salamı göndərirəm.

*Xalq Torpaq Komissarı*
*Dadaş Bünyadzadə.*

Zaqafqaziya Xalq Komissarları Şurasından da Nuxa qəza birinci müəllimlər qurultayına aşağıdakı məzmunda təbrik məktubu göndərilmişdir.

Nuxa qəza birinci müəllimlər qurultayına.

Zaqafqaziya Xalq Komissarları Şurası qəza müəllimlər qurultayını və təzə buraxılış gənc müəllimləri təbrik edir və yəqin olduğunu bildirir ki, maarif işçiləri kəndli kütlələri ilə lazımi rabitə qurub, kəndin mədəni səviyyəsini yüksəltməyə çalışacaq və Azərbaycanda şura hökümətinin möhkəmlənməsinə çalışacaqlar.

22 may 1925, nömrə 2246.

*Zaqafqaziya Xalq Komissarları Şurası.*

Bunlardan başqa respublikanın başqa şəhərlərindən də bir çox təbrik teleqramları alınmışdır. Bu teleqramlarda Şəki darülmüəlliminin gənc məzunlarına, məktəbin pedaqoji heyətinə və qəza maarif işçilərinə yeni-yeni müvəffəqiyyətlər arzu olunurdu.





Nuxa Pedaqoji Texnikumu darülmüəllim və darülmüəllimat kimi (oğlan və qız seminariyası kimi)cəmi 5 il özünün ilk kövrək addımlarını atmışdır. 1925-ci ildə seminariyaya texnikum adı verilmişdir. Azərbaycan SSR Xalq Maarifi Komissarlığının 1927-ci il 15 yanvar tarixli kollegiya qərarına və 3137 №-li protokola əsasən ayrı-ayrı fəaliyyət göstərən oğlan və qız texnikumları birləşdirilmişdir. Bu məsələ arxiv sənədlərində öz əksini tapır. Dövlət arxivləri Baş İdarəsinin Şəki filialında Nuxa Qəza İcraiyyə Komitəsinin prezidium iclaslarının 1925-1926-cı illəri əhatə edən protokol kitabında qeyd olunan 1926-cı il 8 noyabr tarixli 33/23 nömrəli protokoldan aydın olur ki, oğlan və qız pedaqoji texnikumlarının IV qrupları uşaq sayının azlığı səbəbli birləşdirilmişdir. Nuxa Qəza İcraiyyə Komitəsinin geniş prezidium iclasında Azərbaycan SSR Maarif Komissarı Mustafa Quliyev və komissarlığın bir neçə şöbə müdiri də iştirak etmişdir.

Nuxa Pedaqoji Texnikumunun 2-ci buraxılışı 1926-cı ildə olmuşdur. Bu zaman məktəbdə 12 nəfər müəllim işləyirdi. İkinci buraxılışda Azərbaycan xalqının savadlanması üçün 36 nəfər qırmızı müəllim buraxmışdır. İkinci buraxılışın məzunlarından bir qrupunun adlarını qeyd edək:

Qurban Abbasov, Şamil Hacıyev, Müzəffər Hacıyev, Musa Qabulov, Əbdüləvvəl Əhmədov, Muxtar Abbasov, Əli Qazıyev, Ənvər Qarayev və digərləri.

Birinci və ikinci buraxılışın müdavimlərindən uzun illər Azərbaycan Dövlət Universitetində çalışan Abuzər Rəsulovu, Ziya Mustafayevi, İsmayıl Abbasovu, Şaban Barxalovu, Əbdülləzzəl Dəmirçizadəni, Azərbaycan Pedaqoji

Universitetində çalışan Şahmur Ağamirovu, Teyfur Xasməmmədovu, yazıçı, elmlər doktoru Yusif Şirvanı, uzun illər partiya işində çalışmış Nəzir Əhmədovu (Eltəkini) və Oğuz rayon XMŞ-da onlarla belə fədakar, xalqın maariflənməsi yolunda var gücü ilə çalışan maarif pərvanələrinin adlarını fəxrlə qeyd etmək olar.

Yeri gəlmişkən, darülmüəllimatın – qızlar seminariyasının ilk məzunlarının da bir neçəsinin adlarını qeyd edək. Məsələn, Nazilə Cabbarzadə (Hüseynova) sonralar həkim olmuşdur, Səmayə Ocaqova (o da sonralar həkim-ginekoloq olmuş) Şəki birləşmiş xəstəxanasında qadın məsləhətxanasının müdiri işləmişdir), Səyyarə Əfəndiyeva, Cavahir Vahabzadə (hər ikisi «Əməkdar müəllim» adına laiyq görülmüşlər) və başqaları.

Nuxa Pedaqoji Texnikumunu 1920-ci ildən 1935-ci ilədək qurtaran məzunları haqqında məlumat aşağıdakı cədvəldəki kimi olmuşdur.

| **İllər** | **Məzunların sayı (illər üzrə)** | **O zaman işləyən müəllimlərin sayı** | **Ali məktəbə gedənlər** | **Buraxılışın №-si** |
|---|---|---|---|---|
| 1925 | 22 | 4 | — | 1 |
| 1926 | 36 | 12 | — | 2 |
| 1927 | 35 | 16 | 3 | 3 |
| 1928 | 45 | 21 | 9 | 4 |
| 1929 | 72 | 29 | 6 | 5 |
| 1930 | 60 | 28 | 11 | 6 |
| 1931 | 64 | 29 | 13 | 7 |
| 1932 | 68 | 30 | 14 | 8 |
| 1933 | 62 | 29 | 15 | 9 |
| 1934 | 45 | 19 | 10 | 10 |
| 1935 | 55 | 23 | 11 | 11 |
| ***Yekun*** | ***564*** | ***240*** | ***92*** | ***11*** |





Yeri gəlmişkən qeyd etmək lazımdır ki, 1926-27-ci tədris ilindən darülmüəllim ilə darülmüəllimat müttəhid təhsil əsasında pedtexnikum halında gənc müəllim kadrları hazırlamağa başlamışdır.

Pedaqoji məktəb yaranan gündən bu vaxta qədər məktəbin nəzdində müxtəlif kurslar təşkil etmişdir. Demək olar ki, Azərbaycanın maarif cəbhəsindəki kadr ehtiyacının bir hissəsini bu məktəb ödəməyə çalışmışdır.

Azərbaycan məktəblərinin kadrlara olan böyük ehtiyacını ödəmək üçün Xalq Maarif Komissarlığının xüsusi tədbirlər planına əsasən pedtexnikumun nəzdində 3 və 6 aylıq hazırlıq kursları yaradılmışdır. Bu kurslar 6 il müddətində (1921-1927-ci illərdə) 1051 nəfər müəllim hazırlamışdır. Rəcəb müəllim kənd məktəblərində dərs deyən müəllimlə metodik kömək etmək məqsədilə texnikum nəzdində üçaylıq ixtisasartırma kursu açmışdı. Burada Şəkidən savayı, Balakən, Qəbələ, Qazax, Qax, Zaqatala-dan da müəllimlər iştirak edirdilər. Onların içərisində Zaqatala rayonundakı Muxax kəndinin müəllimi, gələcəyin görkəmli dilçi alimi Səlim Əbdüllətif oğlu Cəfərov da vardı. Həmin kursu S.Cəfərov belə xatırlayırdı: «Biz on beş nəfərdik. Kurs ana dili-ədəbiyyat, tarix-coğrafiya, fizika-riyaziyyat şöbələrinə bölünmüşdü. Mən dil-ədəbiyyat bölməsində ixtisaslaşırdım. Kursun rəhbəri Rəcəb Əfəndiyev pedaqogika və metodikadan dərs deyirdi. Mən öz şagirdlərimə dil-ədəbiyyatı sərbəst müsahibə, təhriri-şifahi

mühazirə yaradıcı rəftarlar üsulu ilə təlim etməyi ilk dəfə ondan öyrənmişəm. Rəcəb müəllimi əsl ziyalı kimi təsəvvür edirəm...»[1]

Tanınmış tədqiqatçı-alim Sabir Əfəndiyev xatirələrində bildirir ki, böyük Azərbaycan şairləri Səməd Vurğun və Osman Sarıvəlli də 1926-cı ildə Nuxa Pedaqoji Məktəbində ixtisasartırma kursunda olmuşlar. Xalq şairi Səməd Vurğun bir sıra şeirlərini, o gümlədən «Şəki maralı» şerini də məhz o dövrdə yazmış, Şəkinin Dodu hissəsində o vaxtlar istifadəyə verilən Şəki Su-Elektrik Stansiyasının açılışında o da çıxış etmiş, şeir söyləmişdir.

1927-28-ci tədris ilində qiyabi pedaqoji təhsil şöbəsi yaradılmışdır. Həm də Azərbaycan SSR Ali Sovetinin 1928-ci il 9 iyun tarixli qərarına (25 saylı protokoluna) əsasən Nuxa Pedaqoji Texnikumuna Azərbaycan dramaturgiyasının banisi, görkəmli dramaturq və filosof M.F.Axundovun adı verilmişdir.

Texnikumda on il müddətində (1927-1937-ci illərdə) qiyabi təhsil xətti ilə 5415 nəfər müəllim buraxılmışdır.

1931-1932-ci tədris ilindən etibarən istehsalatdan ayrılmadan pedaqoji təhsil vermək məqsədilə pedaqoji fəhlə fakültəsi yaradılmışdır. Fəhlə fakültəsi (rabfak) 6 il ərzində 1151 nəfər fəhləyə pedaqoji təhsil vermişdir.

Məktəbəqədər tərbiyə ocaqlarının ehtiyacını ödəmək məqsədilə 1927-28-ci tədris ilindən 1935-1936-cı tədris ilinə kimi məktəbəqədər tərbiyə ocaqları üçün 810 nəfər tərbiyəçi burada təhsil almışdır. Bunlardan əlavə 1932-ci ildən 1934-cü ilə qədər 120 nəfər partiya işçisi müvafiq şöbələr üzrə pedaqoji texnikumda təhsil almışdır. Eyni

[1] *M.Qiyasbəyli.* Rəcəb Əfəndiyev, «Çaşıoğlu» nəş.B.2001, səh 11





zamanda 1932-ci ildən 1937-ci ilə kimi qiyabi institutunun yay sessiyaları burada keçirilmişdir. Demək olar ki , bu dövrdə respublikamızda hazırlanan müəllim kadrlarının təxminən beşdə iki hissəsi Nuxa Pedaqoji Texnikumunun yetişdirməsidir.

Şəki Pedaqoji Texnikumunun məzunları sənaye, kənd təsərrüfatının inkişafı, Böyük Vətən Müharibəsi və bundan sonrakı quruculuq dövründə təlim, tərbiyə və siyasi-kütləvi tədbirlərin həyata keçirilməsində fəallıq göstərmiş və göstərirlər.

Şəki Pedaqoji Texnikumu qızlar arasında savadsızlığın aradan qaldırılması üçün xeyli iş görmüşdür. Qızları darülmüəllimata gətirmək üçün kəndlərdə qızlar və qadınlar arasında geniş təbliğat-təşviqat işi aparmışdır. «Nuxa fəhləsi» qəzetinin 1924-cü il tarixli yeddinci nömrəsinin ikinci səhifəsində oxuyuruq:

«Maarif səmərələrindən bir nümunə... Şəkinin darulmüəllimat tələbələrindən Kiçik Dəhnəli Kümçüzadə Xatimat və Təmamət xanımlar yanvar tətili münasibətilə evlərinə dəvət edilmişdi.

Xatimat xanım məktəb yoldaşları ilə, firqəvi qadınlarla qadınların da insan olduğundan və hər yerdə səsə, hörmətə malik olduqlarından və bu vaxta qədər cəhalət səbəbindən zay olan qadınlar azadlığın inkişafına və maarifin tərəqqisinə kömək edəcəklərindən danışmışdı. Eyni zamanda şura hökumətinin qadınların savadlanması üçün gördüyü işlərə aid məruzə etmişdir.

Məruzə kəndli qadınlar arasında böyük bir tərəqqi oyatdı».

Arxiv materiallarından aydın olur ki, darülmüəllimatda oxuyan qızların əksəriyyəti kəndli qızlarıdır. Onlar

yoxsul olduqlarından ehtiyac içərisində yaşayırdılar. Onların ehtiyacını aradan qaldırmaq üçün qızlar özəyi yardım kassası təşkil edilmişdir. Bu kassanın köməyi ilə yoxsul qızlar darülmüəllimatda oxuya bilirdilər.

Məlumdur ki, bir çox rayonlarda açılmış darülmüəllim və kurslar Azərbaycan zəhmətkeşlərinin savadlanması üçün azlıq edirdi. Ona görə də Nuxa darülmüəlliminin nəzdində «təbliğat məktəbi» açılmışdır. Məktəbin müəllim kollektivi zavod və fabriklərlə əlaqəyə girmişdilər. Əsas məsələ ondan ibarət idi ki, məktəbə fəhlə və kəndli balaları qəbul edilməsinin əsas səbəbi fəhlə və kəndlilər arasında savadsızlığı ləğv etməkdən ibarət idi.

Pedaqoji texnikumunun kollektivi kənddə mədəni-kütləvi işləri yaxşılaşdırmaq məqsədilə öz iş planında kəndlərə getmək, kənd əhalisi ilə söhbət etmək, kənddə mədəni iş aparmaq üçün tədbirlər planı hazırlamış və onun həyata keçirilməsinə nail olmuşlar.

O illərdə pedaqoji texnikumun qarşısında duran ən ümdə məsələ ondan ibarət idi ki, partiya və hökumətin qərarlarını yerinə yetirmək üçün, savadsızlığın aradan qaldırılması yolunda mübarizə cəbhəsində olsun. Bu məqsədlə texnikum müdiriyyətinin geniş tədbirlər planı vardır. Məsələn, Şəki Pedaqoji Texnikumunun müəllim və tələbə kollektivinin təşəbbüsü ilə 19 rayonda savad kursları açılmışdır. 1929-cu il 7 noyabr tarixli «Nuxa fəhləsi» qəzetinin 72-ci nömrəsinin 6-cı səhifəsində Məhərrəm Qarayevin imzası ilə çap olunmuş bir məqalədə oxuyuruq:

«Kursları təmin etmək üçün pedaqoji texnikumdan lazımi avadanlıq və ləvazimat» göndərilmişdir. Pedaqoji Texnikumun müəllimləri və yuxarı kurs tələbələri bu kurslarda dərs demişlər. Pedaqoji texnikum mədəni hücum yolu ilə





1150 nəfər savadsızı savadlandırmışdır. Savadlandırılmış şəhər və kənd əhlindən də 800 nəfəri qadındır.

1920-1930-cu illər arası pedaqoji texnikumun gördüyü işlərə nəzər yetirsək aydın olur ki, müəllim və tələbə kollektivi bu illərdə partiya və hökumətin qarşıya qoyduğu məqsədləri yerinə yetirmək üçün bütün imkanlardan istifadə etimşlər.Xalq maarifinin inkişafı üçün yollar axtarmış, xalqın marriflənməsi, savadsızlığın aradan qaldırılması, qızların məktəblərə cəlb olunması üçün bütün imkanlardan istifadə etmişlər.

Pedaqoji texnikumun müəllim kollektivi və ictimai təşkilatları qızlar və qadınlar arasında savadsızlığı aradan qaldırmaq üçün daha ciddi çalışmışlar.

1931-ci ilin yanvar ayının 4-də texnikumun nəzdində «savadsızlıqla mübarizə ştabı» yaradılmışdır. Bu ştabın yaradılmasının əsas məqsədi qadınlar arasında savadsızlığı ləğv etmək və qızları məktəblərə cəlb etmək idi. «Savadsızlıqla mübarizə ştabı» tərəfindən savadlanmış qadınların konfransı çağırılmışdır. Konfransın məruzəsində göstərilmişdir ki, bu il pedaqoji texnikuma mədəni hücum yolu ilə 1150 nəfərin savadlandırılması tapşırılmışdı. Lakin təşkilatların yaxından kömək etməsi və tələbələrin möhkəm işə girişməsi nəticəsində bu rəqəm 1450 nəfərə çatdırılmışdır. Həmin konfransda savadsızlıqla mübarizə işlərinə yekun vurulmuşdur. Yekunda göstərilmişdir ki, pedaqoji məktəbin bu sahədə apardığı iş təqdirə layiqdir.

Yeri gəlmişkən, qeyd etmək lazımdır ki, həmin konfransda 700 nəfər türk qadını iştirak etmişdir.

Yerlərdə yeni-yeni məktəblər açılırdı. Ancaq yenə də müəllim kadrları çatışmırdı. Savad kurslarında da dərs demək üçün böyük müəllim qıtlığı vardı. Odur ki, respublikamızda olan texnikumların nəzdiində müəllim ha-

zırlamaq üçün 6 aylıq kurslar açılırdı. O cümlədən, 1931-ci ilin yanvar ayının 28-də Nuxa Pedaqoji Texnikumunun nəzdində açılacaq 6 aylıq kursun elanı verilmişdir.

## Elan

*Bu kursa 7 sənəliyi bitirb və yaxud bu həcmdə biliyi olan 16-30 yaşlarında firqəçi və komsomolçular, türk qadınları qəbul olunurlar. Muzdur aə qadınlar 5 sənəliyi bitirmiş olsalar da olar.*

*Daxil olmaq istəyənlər öz ərizələrini yanyar ayının 30-na kimi pedaqoji texnikumuna verməlidirlər.*

*Qəbul olunacaq yoldaşlara ayda 45-60 manata kimi təqaüd veriləcəkdir.*

*Kursa:*
*Nuxadan – 45 yer,*
*Ağdaş rayonundan – 30 yer*
*Vartaşen (Oğuz) rayonundan – 20 yer verilmişdir.*

*Nuxa Pedaqoji Texnikumun*
*müdiri Məhərrəm Qarayev.*

Məktəblərdə müəllim çatışmadığı kimi, uşaq bağçalarında və körpələr evlərində işləmək üçün kadr da yox idi. Bu müəssisələrdə işləmək üçün savadı az, bağça işini bilməyənlərə bu iş tapşırılmışdı. Bu nöqsanı aradan qaldırmaq məqsədi ilə Nuxa Pedaqoji Texnikumunun nəzdində bağça və körpələr evi müəssisələri üçün tərbiyəçi hazırlayan kurs açılmışdır. 1933-cü ilin yanvar ayının 15-dən texnikum nəzdində müəllim, məktəbəqədər tərbiyəçi və pioner işçiləri hazırlamaq üçün kurslar da açılmışdır.




Kursların müddəti 8 ay olmuşdur. Kurslara 6-7-ci sinif həcmində biliyi olan şagirdlər qəbul edilmişlər.

Qəbul olunan şagirdlərdən ailəli olanlara 75 manat, ailəsi olmayanlara isə 60 manat təqaüd verilmişdir.

Nuxa Pedaqoji Texnikumu ÜRK (b)P Mərkəzi Komitəsinin qərarları əsasında yenidən məktəbdə dərs keyfiyyətinin yüksəldilməsi, ictimai təşkilatların işini yaxşılaşdırmaq məqsədilə bir sıra işlər görmüşlər. Belə ki, dərs keyfiyyətinin yüksəldilməsində zərbəçilik və ictimai yedəkçilik üsullarından geniş istifadə etmişdir. Bunun nəticəsidir ki, istər texnikum, istərsə də pedrabfakda dərslərin mənimsənilməsi yaxşı olmuşdur. Fənn müəllimlə, xüsusilə riyaziyyat, fizika və ictimaiyyat dərslərindən əlavə məşğələlər keçirilməsi məktəbin dərsi mənimsəmə işinə xeyli kömək etmişdir. Məktəbin tələbələri məktəbin emalatxanasında, ipək fabrikalarında, kolxozlarda işləmişlər. Tez-tez iməciliklər keçirilmişdir. Elə buna görə də müəllimi məktəblərə işə göndərmişdir. Pedrabfak isə 19 nəfər ən yaxşı oxuyan tələbəni ali təhsil almaq məqsədilə ADİ-na göndərmişdir.

Hər il pedaqoji texnikum institutlara ezam yolu ilə öz tələbələrindən göndərmişdir. Pedaqoji məktəbin müəllim kollektivi bacarıqlı və işgüzar olduqlarından hər il yeni-yeni kursların açılması bu texnikuma qismət olurdu. Bu texnikumda 1934-cü ildə kolxoz firqə özək katibi hazırlayan kurs açılmışdır. Bu kursun əhəmiyyəti ondan ibarət idi ki, kolxozlarda çalışan firqə katibləri savadlı olsun. Həyata keçirilən siyasəti başa düşsün, həmin qərarları kolxozçulara çatdıra bilsin. Kursun müdavimləri öz işini müvəffəqiyyətlə başa çatdırmışlar.

14 mart 1934-cü il tarixdə Şəki Pedaqoji Texnikumunda təşkil edilmiş firqə özək katibləri kursunun təntə-

nəli buraxılışı olmuşdur. Buraxılışda şəhər firqə komitəsinin katibi Abbasov, MTS siyasi şöbəsinin rəisi Maqsudov yoldaşlar iştirak və çıxış etmişlər. Kursda dərs planları müvəffəqiyyətlə yerinə yetirilmiş və müdavimlərə yeni şəraitdə işləmək vəzifələrini öyrətmişdir.

Şəki Pedaqoji Məktəbinin hərtərəfli inkişaf etməsində əsas səbəb ondan ibarət idi ki, bu texnikumda sosializm yarışı yaxşı təşkil edilmişdir. Yarış şərtləri ictimai təşkilatlar tərəfindən vaxtaşırı yoxlanıb müzakirə edilmişdir.

Bunun nəticəsidir ki, Nuxa Pedaqoji Texnikumu ali məktəb və texnikumların ümumittifaq yarışında birincilik uğrunda mübarizədə fəal iştirak etmişdir. Texnikum bu yarışa qoşularaq yarışın əsas şərtlərini müzakirə etmiş və işə başlamışdır.

Şəki Pedaqoji Texnikumunun kollektivi Gəncə və Şuşa Pedaqoji texnikumlarını yarışa çağırmışdırsa da, Gəncə Pedaqoji Texnikumundan cavab alınmamışdı. Texnikum öz işlərini ÜRK (b) P Mərkəzi Komitəsinin qərarları əsasında quraraq pedaqoji heyəti möhkəmləndirmiş, müəllimlərin ixtisasına uyğun dərs bölgüsü aparılmış, fənlər arasında əlaqənin yaradılması və nəzəriyyə ilə praktikanın canlı olaraq əlaqələndirilməsinə ardıcıl fikir vermişdir.Texnikumda dəmirçi, cildçi və çilingər emalatxanaları yaradılmışdır ki, bunların vasitəsilə canlı politexniki işlər aparılmışdır. Bu emalatxanalara material almaq üçün 18500 manat pul sərf olunmuşdur.

Texnikumda dərsburaxma və dərsəgecikmə halları tamamilə aradan qaldırılmışdır. Yarışa qoşulan 9 müəllim və 230 nəfər tələbə, eyni zamanda bütün qruplar arasında yarış müqavilənaməsi bağlanmışdır. Birinci yarımilin sonunda 53 nəfər zəif oxuyan tələbə irəlidə gedən tələbə-




lərə çatdırılmışdır. Xalq maarif komissarlığının qərarı üzrə pedaqoji praktika müəyyən plan üzrə aparılmışdır. Şəhər 2 və 5 №-li nümunə məktəbləri ilə əlaqə möhkəmlənmiş, Oxud və Baş Göynük kolxoz cavanlar məktəbi şefliyə alınmışdır. Texnikum öz ətraf (yardımçı) təsərrüfatını genişləndirərək tələbələrin yeməyini (texnikum tələbələrə pulsuz isti yemək verirdi) yaxşılaşdıra bilmişdir. 17-ci firqə qurultayının qərarlarına uyğun olaraq texnikumun yardımçı təsərrüfatında mövcud olan 50 baş mala nümunəvi baxmağı tələbələr öz öhdələrinə götürmüşlər. Texnikumun Ümumittifaq yarışına qoşulması onun hərtərəfli inkişafına çox müsbət təsir göstərmişdir.

Texnikumda savadlı, öz fənnini sevən müəllimlər az olmamışdır.Texnikumun riyaziyyat müəllimi Ziya Əfəndizadə bu yarışda fərqlənmiş, 1934-35-ci tədris ilini müvəffəqiyyətlə başa çatdırmaq üçün tələbələrlə çox gərgin işləmiş, tədris etdiyi fənni tələbələrinə sevdirə və onun çətin yollarını öyrədə bilmişdir.O, texnikumdakı 15 illik fəaliyyəti dövründə bir çox orta ixtisaslı gənc müəllimlər yetişdirmiş, onların ali təhsil almaları üçün şərait yaratmışdır. Buna görə də bu müəllimin texnikumda nüfuzu böyük olmuş və sosyarışın qalibi olmuşdur.

Şəki Pedaqoji Texnikumunun 1934-35-ci dərs ilinə hazırlıq haqqında pedaqoji şurasında və tələbələrin ümumi yığıncağında yarışın təşkilindən və gedişindən doğan məsələlər geniş müzakirə edilmiş, bir sıra həlli vacib qərarlar qəbul edilmişdir. Bu qərarda 1934-35-ci tədris ilində texnikumda dərs keyfiyyətini qaldırmaq, ictimai təşkilatların işini yaxşılaşdırmaq və müəllim kadrlarının hərtərəfli yetişmələri üçün pedaqoji kollektivin qarşısına böyük

vəzifələr qoyulmuşdur. Bu səbəbdən müəllim kollektivi dərs planlarının yerinə yetirilməsinə diqqət və qayğını artırmış, əyanilikdən istifadə etmiş, fənlərarası əlaqəni möhkəmləndirmişdir. Sərbəst məşğələ zamanı lazım olan materialları əldə etmək məqsədilə kitabxanaya 28500 manatlıq elmi, fənn və siyasi ədəbiyyatlar alınmışdır. Bundan əlavə texnikumda mövcud olan fizika və kimya kabinələrinə lazım olan 7000 manatlıq əlavə material alınmışdır.

Texnikumda və pedaqoji rabfakda təhsil alan 427 nəfər tələbə və talibə yarışa qoşulmuşdur ki, onlardan 82 nəfəri qızlar olmuşdur. Şərif Hüseynzadə, Məmməd Göyçəyev, Şəfiqə Səfərzadə, Səyyarə Həmidzadə, Pərnaz Abdurrəhmanova, Elza Cəfərqızı kimi 187 nəfər həqiqi təhsil zərbəçisi olmuşdur. Onlar ictimai işlərdə də birincilik qazanmışlar. Texnikum yanındakı, pedaqoji rabfakda işçi və qulluqçulardan pedaqoji institutlar üçün hazırlıqlı tələbələr yetişdirilimşdir. Zəif oxuyan tələbələrə kömək məqsədilə qış sessiyasına daha yaxşı hazırlaşmaq məqsədilə ayrıca zaçot hazırlıq məşğələləri təyin edilmişdir. Müəllimlərdən Hacızadə, Ziya Əfəndizadə, Əyyub Əhmədov və Balabəy müəllim belə tələbələrlə müntəzəm və sistemli surətdə məşğul olurdular.

Texnikumda yarış genişləndirilmiş, N.Krupskaya adına Moskva Pedaqoji İnstitutu ilə əlaqələr daha da möhkəmləndirilmiş və genişləndirilmişdir. Keçici bayraq 3-cü əsas qrupa verilmişdir.

Azərbaycan Pedaqoji İnstitutu Şəki Pedaqoji Texnikumunu hamiliyə götürərək ayda bir dəfə öz nümayəndələrini texnikuma göndərmişdir. İnstitut kollektivinin köməkliyi ilə təhsil ili ərzində bir çox tədbirlər həyata keçirilmiş, nümunəvi tədris proqramları, dərs plan və icmalları, eyni zamanda nümunəvi təcrübə dərslərinin planları hazırlanmışdır. Müəllim və tələbələrlə kütləvi görüş və açıq dərslər keçirilmişdir. Dərsdənkənar tədbirlərin keçirilməsi, dərnək məşğələlərinin keyfiyyətinin artırılması yolları araşdırılmışdır.



İşıq məbədi

Təşviqatçı müəllimlərdən Qurban Abbasov, Rza Cəlilzadə, Musa Hacızadə, Hacı Kişiyev və digərləri dərnəklərdə müntəzəm iş aparmış və dərnək məşğələlərinin gündəlik dərslərlə əlaqələndirilməsinə nail olmuşlar ki, bu da qruplarda dərslərin keyfiyyətinin yaxşılaşmasına təsir göstərmişdir.

Texnikumun rəhbərliyi və ictimai təşkilatları tələbələrin maddi vəziyyətlərini yaxşılaşdırmaq üçün var qüvvə ilə çalışmışlar. Texnikumun yardımçı təsərrüfatlarından əldə edilən gəlirlərlə tələbələrin 80 faizini paltar, ayaqqabı və yeməklə təmin etmişlər. 1934-cü ildə yardımçı təsərrüfatlardan 18400 kq çəltik, 1562 kq darı, 6425 kq arpa, 9176 manatlıq bostan məhsulu əldə edilmişdir və s.

Texnikumda çıxarılan «Qızıl pedaqoq» qəzeti texnikum həyatını hər ay hərtərəfli işıqlandırırdı.

Texnikumda gənclər təşkilatı tərəfindən «Yüngül süvari» dəstəsi yaradılmışdı. Bu dəstənin üzvləri tələbə-gənclərin ev şəraitini yoxlayır, çatışmayan cəhətlərin aradan qaldırılması üçün onlara yaxından kömək edirdi. Gənclər təşkilatı «Yüngül süvari» dəstəsinin üzvlərindən 13 nəfərini yaxşı işlədiklərinə görə mükafatlandırmışdır. Səyyarə Həmidzadə, Nazilə Məmmədzadə, Mirəli və Əsabəli və b. dəstənin fəal üzvlərindən idi.

Nuxa Pedaqoji Texnikumunun 1935-ci il 18 iyulunda 10-cu buraxılışı olmuşdur. Texnikumun direktoru Sə-

fi Hüseynov pedaqoji kollektivin 10 illik fəaliyyətini ətraflı təhlil edərək məruzəsinin sonunda göstərmişdir ki, bu ilə qədər texnikum 585 nəfər gənc müəllim, ixtisaslı pedaqoqlar yetişdirmişdir. Bu kadrların Xalq Maarifinin inkişafında xeyli xidmətləri olmuşdur ki, onlar ən bacarıqlı, işgüzar müəllimlərdir. Məsələn: Əhməd Rəhimli, Qurban Abbasov, Məhəmmədəli Rəhimov, Heydər Əfəndizadə, Ziba Muxtarova, Əminə Xəlilova, İbrahim Hacızadə və bir çox belələrini göstərmək olar. Builki dərs ilində 63 nəfər gənc, müəllim adına layiq görülmüşdür ki, onlardan 9 nəfəri əlaçıdır.Əlaçı tələbələrdən Abbasəli Əhmədzadə, Mahmud Şirinzadə, Bulud Nəcməddinzadə və başqalarını göstərmək olar.

Təhsil zərbəçilərindən Ənvər, Abbasəli, Xanım Subeyhə, Sədayə və başqaları ictimai işlərdə birincilik qazanmışlar.

Pedaqoji kollektiv müəllimlərin hərtərəfli yetişməsində böyük səy göstərmişdir. Musa Hacızadə, Ziya Əfəndizadə. Əyyub Əhmədov, Balabəy Sultanov və başqaları tələbələrlə yanaşı, ictimaiyyətin də böyük hörmətini qazanmışlar.

İclasın sonunda texnikumun qabaqcıl müəllimi Rəşid bəy Əfəndizadə 10-cu buraxılışa həsr etdiyi şerini oxumuşdur.

### Nuxa Pedaqoji Texnikumunun 10-cu buraxılışına ithaf [1]

*Min doqquz yüz otuz beşinci sənə.*
*Möhtərəm buraxılış, qulaq ver mənə.*
*Bu məktəb hər sənə verir meyvəsin,*

[1] «Nuxa fəhləsi», 18 iyul 1935-ci il , №161, səh.2




*Bollaşdırır müəllimlər kütləsin,*
*Pedtexnikum yetirmiş cavanlar*
*Müəllim pedaqoq qızlar, oğlanlar,*
*İctimai həyat sürüb gedirlər.*
*Sosializm qurmaq yolun bilirlər.*
*Sovxoz, kolxoz məktəbi qurarsız,*
*Təsərrüfat cəbhəsində durarsız.*
*Söylə görüm sən, hara gedirsən?*
*İş başına keçib nələr edirsən.*
*Nədir sənin dərs planın*
*Nəyə sərf olacaq qiymətin, canın*
*2-ci beşilliyin göstərişləri.*
*Məktəblərdə görüləcək işləri.*
*Hansı şeydən ibarətdir qeyd et.*
*Sonra elmi sevə-sevə irəli get.*
*Yaşasın kəndimiz, yaşasın, şəhər.*
*Aləmdən alqışlar səsi yüksələr.*

***Rəşid bəy Əfəndizadə***

1936-cı ildə yeni Sovet Konstitusiyası qəbul edildi. Bu tarixi sənəd adamların böyük hüquqlarını – əmək, istirahət, təhsil hüququnu qanunvericiliklə təsbit edib bu hüquqların həyata keçirilməsi üçün təminat verdi.

İkinci beşillik ərzində ölkəmizin hər yerində ibtidai məktəb həcmində ümumi icbari təhsil həyata keçirildi. Bu illərdə məktəblərdə işin məzmunu və təşkili kökündən dəyişdi. Həmin dövrdə partiya və hökümət tərəfindən qəbul edilən bir sıra qərarlar («İbtidai və orta məktəb üçün dərsliklər haqqında») 1933-cü il 12 fevral tarixli, «SSRİ İbtidai və orta məktəbin quruluşu haqqında» 1935-ci il 3

sentyabr tarixli, «Xalq Maarif Komissarlığı sistemində pedaqoji təhriflər haqqında» 1936-cı il 4 iyul tarixli qərarlar və s.) məktəbdə təlim-tərbiyə işinin yaxşılaşdırılmasında olan «əsaslı nöqsanın» aradan qaldırılmasını təmin etdi.

Azərbaycan KP XVI qurultayının (mart 1940-cı il) qərarlarına uyğun olaraq məktəblərdə təlimin təşkiliniin yaxşılaşdırılması, uşaqların tərbiyəsində müəllim və valideynlərin rolunun hər vasitə ilə yüksəldilməsi, şagirdlər arasında siyasi tərbiyə işinin qüvvətləndirilməsi işi geniş vüsət aldı. Bütün bunların nəticəsi olaraq respublikada orta təhsil xeyli genişləndi, yeddiillik məktəblər və bu məktəbdə oxuyan şagirdlər sayca artdı.

1940-1941-cı dərs ilində məktəblərdə, xüsusən kənd məktəblərində təlim-tərbiyə işinin yenidən qurulması kimi çox mühüm bir vəzifə qarşıya qoyuldu. Məqsəd orta məktəbi bitirən gəncləri əməli fəaliyyətə hazırlamaq idi. Uşaqların tərbiyəsi məsələsi ayrı-ayrı iclas və yığıncaqlarda müzakirə edilirdi.

Valideynlər arasında pedaqoji təbliğat xeyli genişləndirilmişdi.

Respublikamızda yeddiillik və orta təhsilin coşqun inkişafı ilə əlaqədar olaraq ali təhsilli müəllimlər hazırlanması işini genişləndirmək lazım idi. 1939-1940-cı dərs ilində Kirovabad (Gəncə) və Şəki şəhərlərində müəllimlər institutu açıldı.

Üçüncü beşillik ərzində Azərbaycan SSR Xalq Maarif Komissarlığı məktəblərin fəaliyyətini yaxşılaşdırmaq üçün çox mühüm bir təşkilati tədbiri həyata keçirdi ki, bu da məktəb şəbəkəsinin səmərələşdirilməsindən, məktəblər üçün pasport düzəldilməsindən, məktəblərdə olan bütün





əmlakın siyahıya alınmasından, məktəb əmlakı üçün norma və standartların müəyyən edilməsindən ibarət idi.

Şəki Pedaqoji Məktəbinin müəllim kollektivi və ictimai təşkilatları bu dövr ərzində partiya və hökümətin xalq maarifinin inkişaf etdirilməsi sahəsindəki qərar və tədbirləri pedaqoji şuralarda və ümumi yığıncaqlarda müzakirə edərək məqsədyönlü tədbirlər həyata keçirmişlər.

Böyük Vətən Müharibəsinin başlanması və onun fəsadları Şəki Pedaqoji Məktəbindən də yan keçmədi. Kişi müəllimlər könüllü əsgər getdilər. Bu illərdə məktəb təhsil müəssisəsitək bütün ictimai-siyasi həyatda, ideoloji işdə, təbliğat işində xüsusi fəallıq göstərmişdir. Pedməktəbə getməklə ikiilik müəllimlər institutunun fəaliyyəti sıx əlaqəli idi.

Böyük pedaqoq Yəhya Kərimovun xatirələrində oxuyuruq:

*«Qazax Müəllimlər İnstitutunda dərs deyirdim.*

*İki ildən sonra ikiillik müəllimlər institutları bağlandı. Quba, Qazax, Ağdam İnstitutlarının axırıncı kursları təhsillərini Gəncə Pedaqoji İnstitutunun filialı Şəki Müəllimlər İnstitutunda davam etdirməli oldular. Məni baş müəllim vəzifəsinə göndərdilər. Bir neçə gündən sonra Maarif Nazirliyinə çağırıb, istisna hal kimi Şəki Pedaqoji Məktəbində də tam ştatla işləməyimə əmr verdilər. Pedməktəbdə pedaqogika, psixologiya və məntiqdən dərs dedim. İkiillik fəaliyyətim dövründə ibtidai siniflərdə təlimin əsaslarını, onun didaktikasını mükəmməl öyrəndim. Psixologiya və məntiqdən dərs deməyimin elmi-tədqiqatla dadıma çatmasını sonralar dərk etdim.»*[1].

[1] *Yəhya Kərimov* «Necə varsa», «Pedaqogika» n. Bakı -2007, səh 163

Yuxarıda qeyd etdiyimiz kimi Böyük Vətən Müharibəsi başlananda bütün Azərbaycan oğulları kimi, texnikumun kişi müəllimləri də ön cəbhəyə yollandılar. Məktəbdə pedaqoji kadrların çatışmazlıqlarını aradan qaldırmaq üçün pedaqoji məktəbin hələ diplom almamış müdavimləri təhsil illərini məktəb emalatxanalarında, siniflərdə müəllim kimi davam etdirdilər, müvafiq vaxtda isə imtahan verərək pedaqoji təhsillərini başa vurdular. Bu illərdə texnikum fəaliyyətini çətinliklə də olsa, davam etdirdi. Cəbhəyə yollanmış müəllimlər, məktəbin məzunları cəbhədə yüksək fədakarlıq göstərdilər. Pedaqoji kollektiv arxa cəbhədə öz işini davam etdirərək mütəxəssislər yetişdirdi, ideoloji iş apardı. Əhalidə qələbəyə inam əzmini yüksəltdi, yaşadı, yaratdı, yetişdirdi, inkişaf elədi. 1941-42-ci il tədris ilində 55 nəfər, 1942-43-cü tədris ilində 36 nəfər, 1943-44-cü tədris ilində 33 nəfər, 1944-45-ci tədris ilində isə 75 nəfər müəllim hazırladı. Müharibədən sonra texnikum öz müdavimlərinin sayını artıra bildi.

Şəki Pedaqoji Məktəbi müharibənin ağır sınaqlarından şərəflə çıxaraq mənəvi istehsal hazırlığını genişləndirdi. Respublikanın, o cümlədən, regionun məktəblərini müəllim kadrları ilə təmin etmək işini genişləndirdi. İllər ötdükcə məktəbin müəllimləri fəal, bacarıqlı fəaliyyətlərinə görə Fəxri fərmanlar, orden-medallar, döş nişanları və müxtəlif fəxri adlarla təltif edilmişlər. Texnikum sonrakı tarixi dövr ərzində həm Azərbaycan, həm də qonşu Zaqafqaziya respublikaları üçün 10 min nəfərdən çox orta ixtisas təhsilli müəllim kadrları hazırlamışdı. 1946-cı ildən etibarən pedaqoji məktəb ildə 80,150,200 rəqəmləri orta rəqəm olmaqla məzun buraxmışdır.

1987-ci ildə əsaslı səbəb olmadan texnikuma pe-





daqoji ixtisaslar üzrə qəbul dayandırıldı. Texnikumun profili dəyişdirilərək Məişət Xidməti Texnikumuna çevrildi, sonra texnologiya təmayüllü oldu.

1995-ci ildən isə Respublika rəhbərliyinin şəxsən Ulu öndər Heydər Əliyevin yaxından köməkliyi və səyi nəticəsində Şəki Pedaqoji Texnikumu bərpa edildi. Onu da qeyd edək ki, texnikum 1989-1990-cı illərə kimi pedaqoji ixtisaslar üzrə, sonra isə digər ixtisaslar üzrə mütəxəssislər yetişdirmişdir. Texnikum bu dövr ərzində ibtidai sinif, əmək və rəsmxətt, idman, uşaq bağçası tərbiyəçisi ixtisasları üzrə müəllim kadrları buraxmışdır.

Nazirlər Kabinetinin 1994-cü il 23 noyabr 405№-li qərarına əsasən Şəki Texnologiya Texnikumunun bazası əsasında Şəki Pedoqoji Texnikumunun yaradılması haqqında sərəncam verildi. Buna muvafiq olaraq Respublika təhsil Naziri 17 yanvar 1995-ci il tarixli 17 №-li əmrlə Şəki Texnologiya Texnikumunun bazası əsasında Şəki Pedaqoji Texnikumunun yaradılması haqqında qərar verdi. II fevral 1995-ci ildə Şəki Pedaqoji Texnikumunda təntənəli açılış tədbiri keçirildi.

Şəki Pedaqoji Texnikumu bərpa edildikdən sonra özünün ənənəvi fəaliyyətini davam etdirməyə başladı. Texnikumun bərpa edilməsi həm müəllim kollektivinin, həm şəhər ictimaiyyətinin, həm də bütün regionun sevincinə səbəb oldu. Dövrün çətinliklərinə, texnikumun qarşısına çıxan problemlərə baxmayaraq, təhsili yüksək, tərəqqiyə uyğun tələblər səviyyəsində qurmağa başladı. Keçmiş maddi texniki baza əsasında, onların bərpası, yenidən istifadəyə verilməsi şəraitində işini davam etdirdi. Texnikumun tədris korpusunun həyətində təmir işləri görüldü. Kitabxana yeni dərslik və ədəbiyyatla zənginləşdirildi, kim-

ya, riyaziyyat, biologiya, coğrafiya, rəsmxətt, ictimai elmlər, Azərbaycan tarixi, əmək mühafizəsi, metodika və s. kabinələrinin işi xeyli canlandırılaraq fənlərə, ixtisaslara uyğun işlər genişləndirildi.

Texnikumda indi müxtəlif ixtisas qrupları fəaliyyət göstərir. Aşağıdakı ixtisaslar üzrə gənclərimiz təhsilini davam etdirirlər.

1.İbtidai siniflərdə tədris
2.Əməyin tədrisi
3.Rəsm və rəsmxəttin tədrisi
4.Musiqi təhsili
5.İngilis dili
6.İdman və gənclərin çağırışaqədərki hazırlığı.

Tələbələrin əksəriyyəti əyani, az bir hissəsi isə qiyabi yolla öz təhsillərini davam etdirirlər.

Texnikumda tədris işi, təlim, tərbiyə, intizam məsələlərinə xüsusi diqqət yetirilir. Tələbələrin savadlı, hazırlıqlı, yetkin mütəxəssis kimi yetişməsi üçün bütün imkanlardan istifadə edilir. Bir faktı qeyd etmək olar ki, indiki bir çox problemlərə, çətinliklərə baxmayaraq tələbələrin dərsə davamiyyəti, intizamı, hazırlığı, davranışı, əxlaqi keyfiyyətləri əvvəlki ən yaxşı dövrlərdən fərqlənmir. Müəllimlərin özlərinin bir çox problemləri, onların ehtiyaclarını ödəyəcək əmək haqlarının olmamasına baxmayaraq, onlar işə tam məsuliyyətlə, vicdanla yanaşırlar, demək olar ki, özlərini gənc nəslin təlim tərbiyəsi, millətin tərəqqisi naminə fəda edirlər. Texnikumda belə müəllimləri bir-birindən ayırmaq çətindir. Bununla belə uzun müddət pedaqoji kollektivdə çalışan, öz səyi, bacarığı, əməksevərliyi, təlim




müvəffəqiyyəti ilə fərqlənən müəllimlərdən Məmmədov Nizami Sadəddinoğlunu, Arif Bağbanlını, Şəfa Əfəndiyevanı, Rasim Rzayevi, Qurbanəli Camalovu, İradə Həmidovanı, Aynur Əliyevanı, Bəsarət Abbasovu, Şəlalə Bayramovanı, Mahir Məhərrəmovu, Almaz Cabbarovanı, Rəna İsrafilovanı, Rəşid Səmədovu, Pərviz Zeynalovu, Cavanşir Musayevi və başqalarını göstərə bilərik.

Texnikumda müəllimlərin öz bilik və bacarığının yüksəldilməsinə də xüsusi fikir verilir. Bu işdə metodiki kabinə qabaqcıl iş təcrübəsinin yayılmasına, kabinetin yeni ədəbiyyatlarla zənginləşməsinə, gənc müəllimlərə diqqətin artırılmasına, metodiki işlərin, mühazirələrin yazılmasına və təbliğinə xüsusi fikir verir. Texnikumun işində tədrislə bağlı sahələrdən biri fənn birləşmələrinin işidir. Birləşmələrin üzvləri ayrı-ayrı fənlərin tədrisi ilə bağlı plan proqramları tərtib edir və ona müvafiq dərsləri tədris edirlər. Texnikumda 3 fənn birləşməsi fəaliyyət göstərir. Birləşmələr iş planları əsasında fəaliyyət göstərir. Fənlərin tədrisinə, metodiki işlərə, açıq-qarşılıqlı dərslərin keçilməsinə, plan-proqramlarının ödənilməsinə kabinələrin, laboratoriyaların işinin təşkilinə rəhbərlik, nəzarət, eyni zamanda metodiki köməklik edirlər. Metodiki işin keyfiyyətini yüksəltmək üçün bütün fənn birləşmələri üzrə açıq dərslər keçirilir, müzakirə və təhlil edilir. Gənc müəllimlərə xüsusi istiqamətverici köməklik göstərilir.

Texnikumda tələbə özünüidarəsinin təşkilinə xüsusi diqqət yetirilir. Belə ki, pedaqoji şurada tələbə həyatı ilə bağlı məsələlər müzakirə edilərkən, hər qrupdan tələbələrin sayından asılı olaraq 4-8 nəfər tələbə iştirak edir. Təltif və cəza veriləcək tələbələr haqqında çıxarılan qərarlarla əlaqədar onların necə həll edilməsilə bağlı tələbələr öz fi-

kirlərini bildirir, müzakirələrdə iştirak edirlər. Qərarların qəbulunda tələbələr səs verməklə iştirak edirlər. Tələbələrin həyata hazırlanmasında bunun böyük əhəmiyyəti və təsiri vardır. Tələbələr təqaüd komissiyasının tərkibində də fəal iştirak edirlər. Onlar məktəb əmlakının qorunmasına da nəzarət edirlər. Tələbələrin tərbiyəsində, neqativ halların aradan qalıdırılmasında, mövcud nöqsanların tənqid edilməsində texnikumda çıxan «Tikan» satirik divar qəzetinin və tələbələrin iştirakı ilə buraxılan sinif divar qəzetinin tərbiyəvi təsiri vardır.

Texnikumda ən mühüm aparıcı, məsuliyyətli sahə tədris hissəsidir. Dərslərin bölgüsündə, fənn proqramlarının əldə edilməsində, dərs məşğələlərinin gedişinə nəzarət edilməsində, sənədləşmə işlərinin aparılmasında, imtahanların obyektiv keçirilməsində, jurnallara nəzarət işində tədris hissəsi öz üzərinə düşən işi məsuliyyətlə yerinə yetirir, məktəbdaxili tədris işinin bütün sahələrinə nəzarəti həyata keçirir. Müəllimlərin dərslərin keyfiyyətinin yüksəldilməsində, onlara metodiki köməklik göstərilməsində tədris sahəsi məqsədyönlü iş aparır. Dərslərin kabinə üsulu ilə keçilməsinə xüsusi diqqət yetirilir.

Məlumdur ki, öyrənilmiş nəzəri biliyin təcrübədə tətbiqi olmadıqda onun qiyməti yüksək olmur. Tələbələrimiz şəhərin orta məktəblərində keçdikləri təcrübə prosesində müəllimliyin sirlərinə yiyələnirlər. Bacarıqlı təcrübə rəhbərliyi, metodist müəllimlər təcrübəçi tələbələrə lazımi istiqamət verirlər. Təcrübə dərslərinin canlı keçməsi üçün təcrübəyə rəhbərlik edən müəllimlər tələbələrin dərslərində iştirak edir, onlara çıxarılan nəticələr haqqında məlumat verir, dərsləri təhlil edirlər.

Texnikumda tədris müddəti prosesində ayrı-ayrı





qruplar üzrə hərbi xidmətə çağrılacaq tələbələrin siyahısı tərtib olunur. Hərbi xidmətdən qayıdan tələbələrə xüsusi qayğı ilə yanaşılır. Onların ixtisası müvafiq ixtisaslara uyğun gəlməyəndə şəhərin və ya respublikanın başqa orta ixtisas məktəblərinə dəyişmələrinə köməklik göstərilir. Texnikumda imtahanların gedişi, onun obyektivliyi həmişə diqqət mərkəzində dayanır.

Tədris müəssisələrində həmişə diqqət mərkəzində duran məsələlərdən biri də tələbələrlə aparılan tərbiyə işinin hərtərəfli olması, onlarda yüksək əxlaqi mənəvi keyfiyyətlərin formalaşmasıdır. Tələbələrin mənəvi tərbiyəsi məsələlərinə texnikumda kompleks şəklində yanaşılır. Belə prinsip gözlənilir ki, tələbələrin tərbiyəsi hamının, bütün kollektivin işidir. Eyni zamanda mümkün qədər çalışırıq ki, gəncliyi yad elementlərdən, mənfi meyllərdən, eybəcər, kənar təsirlərdən qoruyaq. Bu sahədə həm qrup rəhbərliyi, həm məktəb rəhbərliyi məqsədyönlü iş aparır.

Müəllimin özünün nümunəvi olması gələcək nəslin tərbiyəsində əsas rola malikdir. Ona görə də çalışılır ki, gələcəyin müəllimi olacaq indiki tələbələr nümunəvi davranışa, yüksək əxlaqi keyfiyyətə, zəngin mənəviyyata, sağlam ruha malik olsunlar. Tələbələrə tərbiyəvi hisslər ilk növbədə dərs prosesində aşılanır. Texnikumda idman, dama, şer, musiqi, rəsm və s. müsabiqələr keçirilir. Şəkinin şəkil qalereyasında təşkil edilmiş sərgidə texnikumun rəsm, rəsmxətt ixtisas qrup tələbələri də iştirak edirlər. Tələbələrin vaxtaşırı tamaşalara, musiqi proqramlarına baxışı təşkil edilir.

Tələbələrin mənəvi tərbiyəsinə yönəldilən sahələrdən biri də kitabxana ilə işin təşkilidir. Texnikumun geniş oxu zalına malik kitabxanası var. Texnikumun kitabxana fon-

dunda 22248 ədəd kitab var. Onlardan 6875 ədədi dərslik, 15373 ədədi isə bədii ədəbiyyatdır.

Möhtərəm Prezidentimiz İlham Əliyev cənablarının imzaladığı sərəncama uyğun olaraq latın qrafikası ilə çap olunmuş 878 ədəd yeni nəşrlər də kitabxanaya hədiyyə edilmişdir.

Kitabxanada 150 adda ingilis dilində kitab var və oxucuların sayı 910 nəfərdir. Ötən illər ərzində gənclərlə aparılan iş, gənc nəslin tərbiyəsinə göstərilən diqqət və qayğı dövlət səviyyəsinə qaldırılaraq, onlarda azərbaycançılıq, millətçilik və bəşərilik kimi keyfiyyətlərin aşılanması üçün xüsusi tədbirlər həyata keçirilir.

Təhsildə bu gün və həmişə əsas sima kimi ən aparıcı subyekt məhz müəllimlərdir. Təhsil sisteminin əsas məqsədi dövlət təhsil standartlarına uyğun biliyə, bacarığa, praktik hazırlığa, mütərəqqi dəyərlər və bəşəri dəyərlərə dərindən yiyələnən, Azərbaycan xalqının azadlıq amalına və demokratik ənənələrinə, insan hüquqlarına hörmət edən vətənsevər, müstəqil və yaradıcı düşünən şəxsiyyət tərbiyə etməkdən ibarətdir.

Şəki Pedaqoji Texnikumunun müəllim kollektivi ölkəmizdə gedən təhsil islahatının həyata keçirilməsində fəal iştirak edib yüksək peşəkarlıq, tədqiqatçılıq nümayiş etdirərək pedaqoji ictimaiyyətə bir daha belə bir həqiqəti sübut etmək istəyir ki, ölkəmizin gələcəyi üçün yüksək peşə hazırlıqlı müəllim kadrlarının hazırlanması işində yenə də səfərbərdirlər.





# IV bölmə

## Nuxa Pedaqoji Texnikumunun 1920-1930-cu illərdəki fəaliyyəti yerli mətbuat səhifələrində

### Maarifin səmərələrindən bir nümunə

Şəki darülmüəlimat talibələrindən Kiçik Dəhnəli Kümçüzadə Xatimat və Təmamət xanımlar yanvar tətili münasibətilə evlərinə dəvət edilmişdi.

Xatimat xanım məktəb yoldaşları ilə, firqəvi qadınlarla, qadınların insan olduğundan və hər yerdə səsə, hörmətə malik olduqlarından və bu vaxta qədər cəhalət səbəbindən zay olan qadınlar azadlığının inkişafının maarifin tərəqqisilə olacağına və şura hökumətinin qadınların savadlanması üçün gördüyü işlərə aid məruzə etmişdir.

Məruzə kəndli qadınlar arasında böyük bir tərəqqi oyatdı.

*İ.Tofiq*

*«Şəki fəhləsi», 23 yanvar 1924-cü il, № 7, səh. 2*

### Məktəblərimizə nəzər yetirilməlidir

Cümhuriyyətimizdə fəhlə-kəndli hakimiyyəti bərpa olunduqdan sonra bütün qəzalarda, o cümlədən, Şəki qəzasında da bir çox növ məktəblər açılaraq zəhmətkeşlərə verilmişdir.

Bu gün qəzamızda 1920-ci ildən əsası qoyulan darül-

müəllim və darülmüəllimat məktəbləri zəhmətkeşlərin səadət öyləridir, lakin bir tərəfdən unudulmamalıdır ki, bu məktəblər təzə təşkilat olduqlarından təchizatla, maddi-mənəvi ehtiyacla bir çox yarımçıqları vardır.

*«Şəki fəhləsi», 11 avqust 1924-cü il, № 52, səh. 1*

## Darülmüəllimat gənc qızlar özəyində

1924-cü il 9 oktyabr Nuxa darülmüəllimat gənc qızlar özəyinin təzə təşkili münasibətilə birinci təntənəli iclası olur. İclasda talibələr, müəllimlər, qəza gənclər komitəsinin təşkilat müdiri yoldaş Hüseynov iştirak edir.

Hüseynov ətraflı məruzə edir. Qızlar tərəfindən çıxarılan qərarda deyilir ki, biz darülmüəllimat talibələri söz veririk ki, hamımız ittifaqa daxil olub var qüvvəmizlə təşkilatın götürdüyü yollarla gedəcəyik və gənclər ittifaqının nüfuzunu qəza və şəhər qızları arasında artıracağıq.

*Gənc talibə Zərifə Əbdürrəhimzadə*
*«Şəki fəhləsi», 14 oktyabr 1924-cü il, № 68, səh. 2*

## Darülmüəllimin özəyi

Çar hökumətinin siyasəti və ruhanilərin elmi haram etməsi və bir çox ataların xurafata inanması biz gəncləri elmdən məhrum etmişdi. Şura hökuməti qurulduqdan sonra həmən maniələr götürüldü. Maarif ziyası hər yeri ziyalandırmağa başladı. O cümlədən, 1920-ci ildən bəri da-




vam edən darülmüəllimində çoxlu kəndli balaları təhsil etməyə başladı.

Bu məktəbdə müdiriyyətin təşəbbüsü ilə 1922-ci il oktyabrın 22-də kommunist gənclər özəyi təsis olunmuşdur. Əvvəlcə 6 nəfər üzvü, 12 nəfər namizədi olan bu təşkilatın indi 75 nəfər üzvü və 4 nəfər namizədi vardır. Bütün tələbələr siyasi və fənni məlumatları bu özəkdən alırlar.

*Özək katibi-Ə.Əbdürrəhimov*
*«Şəki fəhləsi», 14 oktyabr 1924-cü il, № 68, səh. 3*

## Darülmüəllimində

1924-cü il 4 noyabr darülmüəllimin nəzdində pedaqoji dərnəyi təşkil edilmişdir. Dərnəyə 30 nəfər tələbə yazılmışdır.

Dərnəyin rəhbərliyi müdiriyyətin öhdəsindədir. Bu məsələ ümumi və ictimai bir məsələ olduğundan qəza firqə komitəsindən, maarif ittifaqından müəllimlərdən dərnəyə üzvlər dəvət edildi. Dərnək tərəfindən tez-tez mühazirələr veriləcək və bütün müəllimlər iştirak edəcəklər.

*Müxbir*

**Redaksiyadan:**
Darülmüəllimin müdiriyyətinin gözəl-gözəl başlanğıcını təbrik edirik. Gələcək nəslimizi tərbiyə etmək kimi şanlı vəzifəni öhdələrinə götürmələrinə, tələbələrin bu kimi dərnəklərdə ciddiyyətlə çalışmalarına ümid edirik.

*«Şəki fəhləsi», 12 noyabr 1924-cü il, № 74, səh. 3*

## Darülmüəllimində

29 noyabrda pedaqoji dərnəyinin birinci konfransı oldu. Konfransda ümumi tələbələr və müəllimlər iştirak edirdi.

1. Dərnək rəhbəri dərnəyin əhəmiyyəti və məqsədi haqda məruzə etdi.

2. Müəllim Həşim Məmmədzadə pedaqoji təhsil sistemi haqda ətraflı məruzə etdi.

3. Rəşid bəy Əfəndizadə kompleks üsul sistemi haqda məlumat verdi.

4. Rəcəb Əfəndizadə kəndi-kəndini idarə prinsipi uğrunda məruzə etdi.

*Pedaqoji dərnəyi*
*«Şəki fəhləsi», 10 dekabr 1924-cü il, № 82, səh. 3*

## Nuxa darülmüəllimatında

Darülmüəllimat gənclər təşkilatında ən çox kəndli qızlar üzvüdür. Özək bir çox yoxsul bacılarımızın ehtiyacı üçün yardım kassası təşkil etmişdir.

*Vəzifə Əhmədova*
*«Şəki fəhləsi», 21 dekabr 1924-cü il, № 85, səh. 4*

## Nuxa qəza firqə komitəsinə

Nuxa darülmüəllimatdan 1-ci dəfə gənc müəllimlərin buraxılması münasibətilə qəza firqə komitəsindən, Azərbaycan Mərkəzi İcraiyyə Komitəsindən aşağıdakı təbrik teleqramı gəlmişdir.

Azərbaycan Mərkəzi İcraiyyə Komitəsi heyyət riyasəti Nuxa Zükur darülmüəllimatının əvvəlinci dəfə müəllim tərxisi bayramını aparan Nuxa zəhmətkeşlərinə atəşin salamlar göndərir.

Mərkəzi İcraiyyə Komitəsi inanır ki, cavan müəllimlər maarif cəbhəsində cəhalətlə mübarizə edərək şura hökumətinin kəndləri və təsərrüfatı yüksəltmək işində ona gözəl yardımçı olacaqlardır.

Yaşasın müəllimlər! Maarifçi kəndlilər.

*Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin katibi Şabbazi*
*«Şəki fəhləsi», 1925-ci il, 21 may, №37, səh 1*

## Zəhmətkeş hakimiyyəti meyvəsindən nümunə

Bu gün darülmüəllimat 22 nəfər yeni müəllim buraxır. Azərbaycan-türk zəhmətkeşlərinin tarixində bu gün böyük yer tutacaqdır. Bu kimi fəxr ediləcək bayramlarla Azərbaycan-türk zəhmətkeşləri isbat edirlər ki, onlar da elm və mədəniyyət arxasınca mədəni millətlər cərgəsinə keçməyə qadirdilər. Fəqət, bu vaxta qədər özlərində olan istedadı izhar etməyə mane olan səbəblər var idi. Bu səbəblərin yeni çar istibdadının kabusu üzərimizdən götürüldüyü az zamandan bəri bütün Azərbaycan, o cümlədən, onun uzaq guşəsindən Nuxa qəzası zəhmətkeşləri füqareyi-kasibə hökumətinin qayğıkeşliyi sayəsində çalışaraq isbat etdilər ki, hər kəs elmə doğru getməyi bacarırmış.

Elm və mədəniyyət yalnız varlıların malı olmayıb, bəlkə əsl zəhmətkeşlərin bacardığı şeydir.

Bu gün buraxılan 22 nəfər müəllim yoldaşlar 22 nəfər olmayıb, bəlkə 22000 deməkdir. Zira, onlar bir tərəfdən zəhmətkeş gəncləri ictimai həyata hazırlayaraq özləri aldıqları ictimai-mədəni tərbiyəni öyrədərək cəhalət və mövhümata qapılaraq övladlarını məktəblərə verməyən, onların qiymətli ömürlərini mal güddürməklə zəifləyən zavallı kəndli qardaşlarımıza bu gün deməliyik ki, gəlin baxın övladlarınızın fərasətinə ki, siz deyirdiniz ki, biz onları qoymarıq ki, at-ata, tat oxusunlar.Bu gün həmən balalarımız elm-ürəfan nuru ilə nurlanıb hər birinə atəşli bir həvəslə sizi və sizin balalarınızı xilas etməyə qoşulurlar. Kəndli qardaşlar, daha təcrübədən çıxın at-ata, tat dərsini oxumaq üçün övladlarınızı məktəblərə göndərin. Bu gün şanlı xalq müəllimi naminə kəndlərə qayıdan sevgili balalarınızın bu yolda çalışacaqlarına əmin oluruq.

Yaşasın yeni qırmızı müəllimlərimiz!

*İ. Əşrəf*

## Maarif cəbhəsindəki müvəffəqiyyətlərimizdən

Zəhmətkeşlərin mədəniyyətinin düşmənləri ilə mübarizə aparmaq üçün beş senə əvvəl – 1920-ci sənədə əsası qoyulan, beş senə müddətində elm və bilik əczaları ilə təchiz edilən mədəniyyət silahının birinci atəşinə, yəni maarif cəbhəsinə atılan birinci qırmızı müəllim kadrosuna səmimi salamlar olsun.

Azərbaycan əmələ kəndliləri maarif-mədəniyyətə





olan kəskin ehtiyacını gənc müəllimlərimizin ödəyəcəyinə əminik.

Maarif, mədəniyyət vasitəsilə əldə ediləcək müvəffəqiyyətlər top və plemyotlar vasitəsilə nail olmaq mümkün olmadığına inanmalıyıq. Müəllim eyni zamanda bir ictimaiyyətçi şura işçisi, həkim, aqranom, zəhmətkeşlərin məşvərətçisi olmalıdır. Bu vəzifəni 5 sənəlik tərbiyə müddətində aldıqları elmlə yerinə yetirmələrinə şübhəm yoxdur. Müəllim təyin olunduğu yerdə yeni kəndlərdə mövcud firqə və şura təşkilatlarının yaradıcısı olmalıdır. Tədris etdiyi məktəbdə ictimai təşkilatların kəndi-kəndini idarəyə hazırlanmasına səy etməlidir. Müəllim kommunizm məfkurələrinin təbliğini unutmamalıdır.

Nuxa darülmüəllimin pedaqoji heyyətinin və məzunların ailələrinə Nuxa qəza maarifi şöbəsi adından izhari təşəkkür edirəm.

*Nuxa qəza maarif şöbəsinin müdiri*
*Ələkbər Mahmudzadə*
*«Şəki fəhləsi», 1925-ci il, 21may № 37, səh. 2*

## Bildiriş

Nuxa darülmüəllimin nəzdində bulunan tədbiqat məktəbinin birinci-ikinci qrupuna tələbə qəbulu bütün Nuxa zəhmətkeşlərinə xəbər verilir.

İlk növbədə əmələ balaları qəbul ediləcək. Birinci qrupa qəbul ediləcək tələbələrin yaşı 8, ikinci qrupa daxil olanların yaşı 9-10 olmalıdır.

Ərizə ilə bərabər iş və vəziyyətinə dair şəhadətnamə

təqdim olunmalıdır. Ərizə hər gün səhər saat 8-dən axşam saat 6-ya qədər darülmüəllimat binasında qəbul olunur.

*Tədbiqat məktəbinin müdiriyyəti*
*«Şəki fəhləsi», 1925-ci il, 17 sentyabr № 59, səh.3*

## Nuxa darülmüəllimat talibələri çarşabı atmalıdırlar

5 ildir şəhərimizdə darülmüəllimat vardır. Bunun məqsədini təkrar etməyə lüzum görmürük. Ancaq burada oxuyan talibələrin bir çoxu məktəbdən ümid edilən məqsədi yerinə yetirəcəkləri işlərindən bəllidir. Məsələn, bu talibələrdən bir çoxu məktəbə qədər çarşabla gəlib, məktəbin qapısında çarşabı açıb qoltuqlarına qoyurlar. Bayramlarda, nümayişlərdə çarşabsız gəzirlərsə də, lakin məktəbə gəldikdə həmən hal davam edir. Bu xüsusda xalq maarif komissarı Quliyev də Nuxada ikən lazımı tövsiyyələrdə bulunmuşdur. Ancaq nəticəsi görünmür. Biz belə köhnə məlumatları tərk etməli və onlara verilən təzə fikirləri ibtida özləri tətbiq etməli möhtərəm talibə həmişirələrimizdən gözləyirik.

*Tələbə Ş.S*
*«Şəki fəhləsi», 21 yanvar 1926-cı il, №7, səh. 2*

## Darülmüəllimat həyatından ümumi əhval

Keçən senəyə nisbətən məktəbin halı ümumiyyətlə gözəldir. Çocuqlara verilən yemək miqdarı artırılıbdır. Əvvəlləri xidmətçi azlığından otaqlar o qədər təmiz saxlanılmırdı, indi xidmətçilər çoxalmış, otaqlar təmiz saxlanılır, çocuqlara əlbəsələr hazırlanır.

### Təşkilat məsələsi

Məktəbdə gənclər, pionerlər və tələbə təşkilatları vardır. Ciddiyyətlə işləyirlər. Gənclər və tələbə təşkilatları tərəfindən divar qəzeti nəşr olunur. Pionerlər üçün qəzetə də nəşr olunacaqdır.

### Dərnəklər

Məktəbdə pedaqoji, riyaziyyat, ədəbiyyat, ictimaiyyət, kənd təsərrüfatı və dram dərnəyi vardır. Bunlar da ciddi surətdə işləyirlər.

### Nəşriyyat

Məktəbdə «Yeni şölə» fənn və «Zəhmət» adlı divar qəzetləri çıxır. Ədəbiyyat dərnəyi tərəfindən «Yeni həyat» adlı məktəb məcmuəsi nəşr olunur.

### Ləvazimat-tədrissiyyə

Ləvazimat-tədrissiyyə bir qədər azdır. Bəzi dərs kitabları yoxdur. Bu barədə tələbələr çətinlik çəkirlər.

### Komissionlar

Məktəbdə maarif, mədəniyyət, münaqişə və təsərrüfat komissionları vardır. Bu komissionlar özlərinin idarə

məsələsinə xidmət edirlər. Tələbələr öz sevdikləri tələbə təşkilatlarını tanıyır və odur ki, işlərimiz öz yerində gedir.

*Gənc müəllim*

## Darülmüəllimin binasını təmir etməli

Darülmüəllimin binası get-gedə xarab olur. 6 senədir ki, bu binada təmirat işləri aparılmadığından bir az da keçsə oturmağa layiq olmayacaqdır. Binalar böyük və dairəli olduğundan bunları tez zamanda təmir etmək lazımdır ki, şəhərdə bundan başqa məktəb sığacaq bina yoxdur.

*Tələbə*
*«Şəki fəhləsi», 1 aprel 1926-cı il, № 19, səh. 4*

## Darülmüəllimin pioner təşkilatının vəziyyəti

Bu məktəbdə 1924-cü senədən özəyin fəaliyyəti sayəsində pionerlər təşkilatı yaradılmışdır. İbtida işlərin bir çoxu nöqsanlı idi. Hal-hazırda isə sürətlə irəliləyir, belə ki, əvvəlləri 25 nəfər üzvə malik olan bu təşkilat hal-hazırda 50 nəfər üzvə malikdir. Bunların fəaliyyətləri sayəsində dəstədə pionerlərə məxsus «Ulduz» adlı qəzetə nəşr edilir. Nizam-intizama artıq fikir verilir. Dram dərnəyi də təşkil edilmişdir. Vaxtı-vaxtında teatro verilir. Sair pionerləri də bu vasitə ilə bura cəlb edirlər. Bədən tərbiyə işlərinə artıq fikir verilir. Burada qeyd ediləcək bir məsələ varsa, o da hamilik məsələsidir. Dəstənin hami təşkilatı əhəmiyyəti vermir. Bu




səbəbdən maddi cəhətdən geri qalmışlar. Bu qüsuratın dəfinə dair qəza pionerlər ordusunun nəzərini cəlb edirik.

*N.Yusifzadə*
*«Şəki fəhləsi», 5 aprel 1926-cı il, № 20, səh. 4*

## Nuxa darülmüəllimatı

Keçən illərə nisbətən məktəbimizin halı ziyası ilə gözəlləşmişdir. Müəllim, tələbə və talibələrin çalışması nəticəsində məktəbdə bir çox təbəddülatlar meydana gəlmişdir. Talibə və müəllimlər ictimai işlərdə fəal çalışırlar. Məktəbdə bir çox təşkilatlar, dərnəklər və komissionlar təşkil olunmuşdur. Bu təşkilatlarda talibələr həvəslə iştirak edirlər. Məktəbimizin gənclər özəyi, pioner təşkilatı və talibələr komitəsi vardır. Bundan başqa maarif, mədəniyyət və münaqişə komissionları təşkil olunmuşdur. Onlar da məktəbin tərəqqisinə çalışaraq kəndi-kəndini idarə şuranı həyata keçirməyə səy edirlər. Dərnəklərə gəlincə, məktəb daxilində ictimaiyyət, ədəbiyyat, təbiət, dram və pedaqoji dərnəkləri təşkil olunmuşdur ki, onlar dəxi ciddi surətdə işləyirlər. Tələbələr komitəsi və gənclər özəyi tərəfindən həftədə bir dəfə «Türk qızı» divar qəzeti nəşr olunur ki, bu da məktəbdə müxbirlərin əsasını qoyan talibələri mətbuata alışdırmaqla bərabər, mərkəzi qəzetlərə fəal müxbirlər yetişdirirlər.

*Nazilə Hüseynzadə*
*«Şəki fəhləsi», 15 aprel 1926-cı il, № 22, səh. 5*

## Təbliğat məktəbinin vəziyyəti

Nuxa darülmüəllimin nəzdindəki təbliğat məktəbinin daxili və xarici vəziyyətinə baxılacaq olursa, burada işlərin yeni sistem üzrə getdiyi nəzərə çarpır. Oxumaqda olan 170 nəfər tələbənin əksəriyyəti fəhlə və kəndli balasıdır. Məktəbdə ittifaqımız bir çox təşkilat və zavodlarla əlaqəyə girmişdir. Gələcək tədris ilində qəbul olunacaq tələbələr yalnız zavoddan, fəhlə balaları olacaqdır. Bu da hökumətin gələcək əsasıdır. Tələbələr komitəsi və pioner təşkilatı tərəfindən həftəlik «Şərq çocuğu» adında divar qəzeti nəşr olunmağa başlamışdır. Pedaqojinin yürütdüyü kəndi-kəndinin idarə prinsipi həyata tədbiq olunur.

*Tələbə*

## Pedaqoji texnikumda 8 Marta hazırlıq

8 Martı təntənəli qarşılamaq üçün pedaqoji texnikumda böyük hazırllıq işləri aparılır. Qadınların həyatına üyğun mahnılar, xor, deklamasiya və pyeslər hazırlanmışdır.

8 Mart günündə Şəki Pedaqoji Texnikumu talibələrinin böyük müvəffəqiyyət əldə edəcəklərinə əminik.

*Təhminə Hacıbəyli*
*«Şəki fəhləsi», 5 mart 1928-ci il, №17, səh. 2*

## Pedtexnikum kəndə doğru

Şəki pedtexnikumu builki planında kəndlərə tənəzzöhü iş planını da unutmamışdır. Aprelin 17-də 3-cü və 4-





cü qrup tələbələri birinci dairənin Aşağı Şabalıd kəndinə 3 günlük tənəzzöhə çıxırlar. 3 gündə ayrı-ayrı kollektivlər tərəfindən kəndin ictimai, iqtisadi tərəfləri mümkün qədər öyrənildi. Kənd şurası, kooperativ kənd məktəbi tədqiq edildi. Küllü surətdə ölkəşünaslıq və xalq ədəbiyyatına dair məlumatlar toplandı. Tədqiqat nəticəsində bir çox nöqsanlar meydana çıxdı.

1. Kənd kooperativinə satış üçün az mal gətirilir. Kənddə su işləri bərbad haldadır. Kənd şurası su işlərinin təmirinə fikir vermir.
2. Kənd məktəbi ilə məscid bir binadadır. Bir otaqda molla camaata mövhümatı aşıladığı bir halda, o biri otaqda müəllim dərs keçir.
3. Kənd qızları arasında işlər zəifdir. Qızlar məktəbə cəlb olunmamışdır.
4. Kənddə səhiyyə işlərinə nəzarət edilmir.
5. Əkinlər qışda əkilir. Baxmaq üçün bir dəfə də olsun aqronom gəlməmişdir.

*Bal arısı*
*«Şəki fəhləsi», 28 aprel 1928-ci il, № 28, səh. 2*

## Pedaqoji Texnikumunda iməcilik

Nuxa Pedaqoji Texnikumunda iməcilik işləri aparılmışdır. Təmizlik komissionunun bu haqdakı fəaliyyəti təqdirə layiqdir. Şəhərin küçələrinin təmizlənməsində tələbələr fəallıq göstərmişdir.

*Özək katibi Bahəddin Kərimov*
*«Şəki fəhləsi», 7 noyabr 1928-ci il, № 71, səh. 4*

## Builki buraxılış münasibətilə

### Mədəni yollara yeni mübarizlər

Nuxa Pedaqoji Texnikumu aprel inqilabının meyvəsi olub bu gün Azərbaycanın maarif ocaqları arasında görkəmli yer tutur. Nuxa Pedaqoji Texnikumunun müvəffəqiyyətlərini görməmək mümkün deyildir.

1925-ci ildə birinci dəfə 22 nəfər müəllim buraxan bu məktəb 1926-cı ildə 36 nəfər, 1927-ci ildə 35 nəfər, 1928-ci ildə 45 nəfər, bu il isə 1929-cu ildə 72 nəfər xalq müəllimi buraxır. Bütün dəvami müddətində məktəb cəmi 210 nəfər müəllim buraxmışdır.

Builki buraxılış tam başqa bir şərait daxilində icra olunur. Ölkəmizin sənayeləşdirilməsi işi geniş ölçü almış, kənd təsərrüfatının yeni mədəni və kollektiv üsullarla hər gün irəliləməsi göz önündədir. Daha doğrusu, buraxılış şəhər və kənddə sosializm ünsürlərinin canlandığı bir dövrə təsadüf edir. Kənddə mədəni inqilabın genişləndirilməsi və bu dövrdə həmişəkindən artıq qətiyyət tələb edir. Gənc müəllimlərimiz indiki şəraitin qarşılarına atdığı bu ağır vəzifələri mətanətlə ifa edəcəklərinə əminik.

*Abdulhəmid*

*«Şəki fəhləsi», 22 may 1929-cu il, № 35, səh. 1*

### Savadsızlıqla mübarizə cəbhəsində

Savadsızlıqla ciddi mübarizə işində Şəki Pedaqoji Texnikumu böyük işlər görmüşdür. Pedaqoji texnikum şəhərin 19 rayonunda savad kursları təşkil etmiş, kursları müəllim və ləvazimatla təmin etmişlər. Pedaqoji texnikumu mədəni hücüm yolu ilə 1150 nəfər savadsızı əhatə edərək savadlandırmışdır. Onlardan 800 nəfəri qadındır.

*Məhərrəm Qarayev*

*«Şəki fəhləsi», 7 noyabr 1929-cu il, № 72 səh. 6*

## Pedaqoji texnikumun 10 illiyi

### Yeni qızıl kadrolar buraxılır

Ölkəmiz cəhalətlə kəskin mübarizəyə başlamış, burjuaziya üsul-idarəsi ilə toqquşan mübariz qüvvələrimiz hər il artır, o qədər də düşmənlərimiz azalır. Bu gün mədəni inqilab cəbhəmizi yeni mübarizlərlə təmin edirik. Nuxa Pedaqoji Texnikumunda hər ilki kimi bu il də 60 nəfər hazırlıqlı gənc qızıl müəllim və müəllimələr buraxılır.

Ölkəmiz üçün yeni kadrların nə qədər lazım olduğunu hamımız bilirik.

Şura Azərbaycanının mədəni inqilab yürüşündə Nuxa Pedaqoji Texnikumu çox iş görmüşdür.Bütün buraxılışın müəllim və müəlimələri indi kəndlərimizdə kəndli balalarına həqiqi şura tərbiyəsi verirlər. Onlardan gələcək qurucular yetişdirirlər.

On il əvvəl bir şəhər məktəbi var idi ki, burda ancaq varlı balaları təhsil alırdı. Nuxa Pedaqoji Texnikumunu indi biz böyük fəxrlə irəli sürürük. Qarşımızdakı vəzifələr böyükdür, buraxılan müəllimlər unutmasınlar ki, onlar hər biri vəzifəyə göndərilən bir əsgər kimi müəllimlik və-

zifəsinə göndərilirlər. Bu gün kəndlərimiz sosializm çırağı ilə durmadan irəliləyərkən gənc müəllimlərimiz bu inqilabi yürüşə yardımçı olmalıdırlar.

Pedaqoji texnikum təşkil olunduğu 10 ildə 1925-ci ildən başalayaraq məzunlar buraxmışdır. Bu müddətdə 270 nəfər müəllim buraxılmışdır ki, onlardan 110 nəfəri müəllimədir.

İndi biz Nuxa Pedaqoji Texnikumu ilə fəxr edirik.

*Əbdülhəmid Həmidov*
*«Şəki fəhləsi», 20 may 1930-cu il, № 25, səh. 3*

## Pedaqoji Texnikum 700 qadını savadlandırdı Savadlanmış qadınların konfransı

Yanvarın 4-də Nuxa Pedaqoji Texnikumu nəzdində olan savadsızlıqla mübarizə inqilabı tərəfindən texnikumun əhatə etdiyi rayonlarda yeni savadlanmış qadınların konfransı çağırılmışdır. Bu il pedaqoji texnikuma mədəni hücum yolu ilə 1150 nəfərin savadlanması həvalə edilmişdir. Tələbələrin zərbəçi surətdə işə girişməsi sayəsində bu rəqəm 1450 nəfərə çatdırılmışdır.

4 ay müddətində bunlardan 1150 nəfəri savadlandırılmışdır. Çağırılmış konfransda 700 nəfər savadlandırılmış türk qadını iştirak edirdi. Konfransda savadsızlıqla mübarizə işlərinə yekun vurulmuş, müvəffəqiyyətlər göstərilmişdir.

Yeni savadlanmış türk qızları ixtisas əldə etmək üçün zərbəli surətdə fatzauça daxil olmağı vəd etdilər.





Konfrans olduqca təntənəli keçib, qadınların ruh yüksəkliyi ilə nəticələndi.

*Özək katibi: Qara Abidzadə*
*«Şəki fəhləsi», 8 yanvar 1931-ci il, № 2, səh. 4*

## Nuxa Pedaqoji Texnikumu nəzdində fevralın 1-dən açılacaq 6 aylıq müəllimlər kursuna tələbələr qəbul olunur

Buraya 7 sənəliyi bitirib və yaxud bu həcmdə biliyi olan 16-30 yaşlarında firqəçi və komsomolçular, kolxozçular, muzdurlar, türk qadınları qəbul olunurlar. Muzdur və qadınlar 5 illiyi bitirmiş olsalar da olar.

Daxil olmaq istəyənlər öz ərizələrini yanvarın 30-na kimi pedaqoji texnikumuna verməlidirlər. Qəbul olunacaq yoldaşlara ayda 45-65 manata kimi təqaüd veriləcəkdir.

Kursa:
Nuxaya – 45 yer
Ağdaş rayonuna – 30 yer
Vartaşenə – 20 yer verilmişdir.

*Nuxa Pedaqoji Texnikumunun müdiri*
*Məhərrəm Qarayev*
*«Şəki fəhləsi», 28 yanvar 1931-ci il, № 5, səh. 4*

## Pedaqoji texnikumu sağlam əllərə tapşırmalı

Nuxa Pedaqoji Texnikumunun direktoru M.Qarayev 1931-1932-ci dərs ili qarşısında böyük səhlənkarlıq etmişdir.

1 sentyabrda məktəb dərsə başlamaq əvəzinə sentyabrın 15-də başlamışdır. Düzgün dərs təqsimatı haqqında Xalq Maarif Komissarlığının qərarı olmasına baxmayaraq, Qarayev bu il müəllimlər kursunda ixtisasından kənar 450 saat dərs götürmüşdür. Keçən dərs ilində məktəbdə biabırçılıq olmuşdur.

Bitərəf Salehcanov ictimaiyyat dərsləri vermiş və Əli Şahməmmədov fizikadan lazımi bacarığı olmadığı halda, il uzunu tələbələrə tapşırıq oxumuşdur.

Ümumiyyətlə dərs ilinin nəticəsi yaxşı olmamışdır. Qarayev müəllimlərlə kobud rəftar etdiyindən, Bağırov, İlyaszadə, Hacıağa məktəbi buraxıb getmişlər.

*Dilsiz*

*«Şəki fəhləsi», 9 avqust 1931-ci il, № 39, səh. 2*

## Müəllimlər kursu açılır

### Daşkolnı işçilər hazırlayan kursun təşkili

Nuxa Pedaqoji Texnikumu bildirir ki, 1933-cü il 15 yanvardan texnikum nəzdində müəllim daşkolnik və pioner işçiləri hazırlamaq üçün kurs açılır. Kursun müddəti 8 ay olub, buraya 5-7 sənəlik həcmdə biliyi olanlar qəbul ediləcəkdir.

Qəbul olunan ailəlilərə 75 manat, ailəsiz olanlara 60 manat təqaüd veriləcəkdir.

*Direktor Seyfi Hüseynzadə*

*«Şəki fəhləsi», 11 yanvar 1933-cü il, № 2, səh. 4*





## Təhsil dəyəri uğrunda mübarizə bayrağını daha yüksək qaldırmalı

### Keyfiyyət uğrunda mübarizə

Nuxa Pedaqoji Texnikumu təhsil işini ÜİK(b)F Mərkəzi Komitəsi və Mİ komitəsinin qərarları əsasında yenidən qurmuş və buna görə bir çox uğurlar əldə etmişdir. Dərs keyfiyyəti uğrunda mübarizədə sosyarış, zərbəçilik və ictimai yedəkçilik üsullarından geniş istifadə etmişdir. Ona görə də istər texnikum və istərsə də pedrabfakda dərslərin mənimsənilməsi yaxşı olmuşdur. Nəticəli təqaüd verilməsi bu işdə mühüm rol oynadığı kimi, müəllimlərin də yaxşı çalışmaları – riyaziyyat, fizika və ictimaiyyat dərslərindən əlavə məşğələlər keçirilməsi mənimsəmə işinə yardım etmişdir. Məktəbdə tələbələr məktəb emalatxanasında, ipək fabrikalarında, kolxozlarda işləmişlər, ictimai işlər və iməciliklər keçirilmişdir.

Bu günlərdə texnikum 62 nəfər hazırlanmış müəllim, pedrabfak isə 19 nəfər aniyə tələbə buraxır. Texnikum gələcək dərs ilində bu mübarizəni daha da gücləndirməlidir.

*Ziya Əfəndizadə*

*«Şəki fəhləsi», 15 iyun 1933-cü il, № 65, səh. 3*

### Kolxoz firqə özək katibləri kursunun buraxılışı

14 martda Nuxa Pedaqoji Texnikumu yanında açılmış kolxoz firqə özək katibləri kursunun təntənəli buraxılışı olmuşdur.

Buraxılışda şəhər fiqrə komitəsinin katibi Abbasov, MTS siyasi şöbəsinin rəisi Maksudov yoldaşlar danışmışlar.

Kolxoz firqə özək katiblərinin bilik səviyyəsini artırması üçün açılan bu kurs öz dərs planını müvəffəqiyyətlə yerinə yetirmiş və müdavimlərə yeni şəraitdə işləmək vəzifələri öyrətmişlər.

*«Şəki fəhləsi», 23 mart 1934-cü il, № 36, səh. 3*

## Nuxa Pedaqoji Texnikumu ümumittifaq yarışında birincilik uğrunda mübarizədə

Nuxa Pedaqoji Texnikumu ali məktəb və texnikumların ikinci yarışına vaxtında qoşularaq, yarışın əsas şərtləri ətrafında işə başlamışdır. O, Gəncə və Şuşa pedaqoji texnikumlarını yarışa çağırmış, ancaq təkcə Gəncə Pedaqoji Texnikumundan cavab ala bilmişlər.

Pedaqoji texnikum öz işlərini ÜİK(b)F Mərkəzi Komitəsi və Mərkəzi İcraiyyə Komitəsinin qərarları əsasında quraraq, pedaqoji heyəti və dərsləri müəllimlərin ixtisasına görə bölüşdürmüş və predmetlər arasında təbii əlaqənin yaradılmasına və nəzəriyyə ilə praktikanın canlı olaraq əlaqələndirilməsinə ayrıca fikir verilmişdir. Texnikumda dəmirçilik, cildçilik və slesar emalaxanaları vardır ki, bunların vasitəsilə canlı politexniki işlər aparılır. Bu emalatxanalara material üçün 18500 manat para sərf edilmişdir. Texnikumda gecikmə və proqulçuluq tamam aradan qaldırılmışdır. 9 müəllim, 230 tələbə, bütün qruplar arasında yarış müqavilənaməsi bağlanmışdır.

Birinci semestrdə olan 53 zəif tələbə irəlidə gedənlərə çatdırıla bilmişdir. Xalq Maarif Komissarlığının qərarı





üzrə pedaqoji praktikası müəyyən plan üzrə aparılmışdır. 2,5 və nümunə məktəbi ilə əlaqə bağlanmış, Oxud və Baş Göynük kolxoz cavanlar məktəbini şefliyə almışdır.

Texnikum öz ətraf təsərrüfatını genişləndirərək tələbə təchizatını yaxşılaşdıra bilmişdir.

17-ci firqə qurultayı qərarı əsası ilə texnikumda bir maldarlıq təsərrüfatı təşkil edilərək burada mövcud 50 baş mala nümunəvi baxmağı tələbələr öz öhdələrinə götürmüşlər.

Lakin nöqsanlar da az deyildir. Yarımillik dərs proqramı 89 faiz yerinə yetirilmişdir. Birinci siniflərdə rus dili proqramlarına 94 faiz əməl edilmişdir. Texnikum şefliyə götürdüyü Oxud və Baş Göynük kolxoz cavanlar məktəbi ilə əlaqə işini istənilən dərəcədə qura bilməmişdir.

Nuxa Pedaqoji Texnikumu ümumittifaq yarışına qoşulmaqla böyük müvəffəqiyyətlər əldə etməlidir.

*Maqsud*

*«Şəki fəhləsi», 28 mart 1934-cü il, № 39 səh. 3*

## Bütün müəllimlər Ziya Əfəndizadə kimi çalışmalıdır

Nuxa Pedaqoji Texnikumunun riyaziyyat müəllimi Ziya Əfəndizadə yoldaş 1934-35-ci tədris ilinin müvəffəqiyyətlə başa çatdırılması uğrunda öz varlığı ilə çalışır. O, 15 ildir ki, texnikumda riyaziyyat dərsi verməklə bir çox kadrlar hazırlaya bilmişdir.

Ziya Əfəndizadə yoldaş keçən dərs ilində olduğu kimi bu dərs ilində də mənimsəmə səviyyəsi aşağı dərəcədə olan tələbələrin irəlidə gedənlərlə ayaqlaşması üçün dərs saatlarından başqa onlara əlavə riyaziyyat dərsi verir.

Odur ki, Ziya yoldaşın texnikum tələbələri arasında böyük hörməti vardır.

*Tələbə*
*«Şəki fəhləsi», 18 dekabr 1934-cü il, № 153, səh. 3*

## Yarışda qalib çıxmaq üçün dərs keyfiyyəti və şüurlu intizam uğrunda mübarizəni daha da artırmalı

Nuxa Pedaqoji Texnikumu 1934-35-ci dərs ilinin hazırlığına qabaqcadan başlanmışdır. ÜİK(b)F MK-nın və Zaqafqaziya ölkə komitəsinin dərs ilinə hazırlıq haqqındakı qərarı pedaqoji şurada və ümumi tələbələr yığıncağında geniş müzakirə edilmişdir.

Dərs ilinə hazırlığın canlı aparılması yaxşı nəticələr əldə edilməsinə səbəb olmuşdur. Müəllim kadrosu dərs planının yerinə yetirilməsinə ciddi çalışır.

Sərbəst məşğələ zamanı lazım gələn materiallarla təmin etmək məqsədilə kitabxanaya 28500 manatlıq elmi-fənni və siyasi kitablar alınmışdır. Bundan əlavə texnikuma mövcud fizika və kimya kabinələrinə dəxi 7000 manatlıq material alınmışdır. Texnikumda dülgərlik və dəmirçilik kimi sexlər yaradılaraq burada tələbələrə politexniki bilik öyrədilir.

Texnikum və pedaqoji rabfakda hazırda 427 nəfər tələbə və talibə təhsil alır, bunlardan 82 nəfəri qızlardır.

Şərif Hüseynzadə, Məmməd Göyçəyev, Şəfiqə Səfərzadə, Səyyarə Həmidzadə, Pərinaz Abdurrahmanova, Elza Cəfərqızı kimi 187 nəfər həqiqi məhsul zərbəçisi vardır. Bunlar ictimai işlərdə birincilik qazanmışlar.

Texnikum yanındakı pedaqoji rabfakda işçi və kol-





xozçulardan pedaqoji institut üçün hazırlıqlı tələbələr yetişdirilməkdədir. 61 nəfər müxtəlif dərslərdən zəif olan tələbələrin qış zaçot sessiyasına yaxşı hazırlaşmaq məqsədi ilə ayrıca zaçot məşğələsi saatları təyin edilmişdir. Müəllimlərdən Hacızadə, Ziya Əfəndizadə, Əyyub Əhmədov, 45 illik müəllim staji olan Balabəy bu tələbələrlə müntəzəm surətdə məşğul olur.

Dərs ilini müvəffəqiyyətlə başa çatdırmaq üçün Şuşa, Gəncə Pedaqoji Texnikumları yarışa çağrılmış, bundan başqa texnikum təşkilatları Krupskaya adına Moskva Pedaqoji İnstitutu ilə əlaqəni sıxlaşdırmışdır.

Texnikumda yarış genişləndirilmişdir.

Qabaqcıl qruplar üçün keçici bayraq vardır. Bu bayraq hazırda 3-cü əsas qrupundadır. Azərbaycan Ali Pedaqoji İnstitutu Nuxa Pedaqoji Texnikumunu öz hamiliyinə alaraq ayda bir dəfə öz nümayəndələrini bura göndərir ki, onun yardımı ilə içərisindəki nöqsanlar vaxtında aradan qaldırılır. İnstitutun nümayəndəsi Əli yazıçı yoldaş yaxınlarda gələrək texnikum təşkilatçılarına bir sıra dəyərli göstərişlər vermişdir.

Tətil günlərində plan əsasında mədəni istirahət keçiriləcək. İpək sexinə, elektrik stansiyasına, kino, teatrla texnikumun şefliyində olan məktəblərin müəllim və tələbələri ilə kütləvi təntənəli görüş gecələri keçiriləcək.

## Texnikumda firqə və komsomol kütləvi siyasi işləri

Dərslərdən xaric və tənəffüs saatlarında texnikumun firqə və komsomol təşkilatları tərəfindən tələbələr arasında siyasi söhbətlər aparılır. Komsomol maarifi günü bütün komsomollar məşğələyə toplanır.

Təşviqatçı Qurban Abbasov yoldaş rəhbərlik etdiyi dərnəklərdə mənimsəmə dəyərini yüksəltmişdir.
Təşviqatçılardan Musa Hacızadə, Rza Cəlilzadə, Hacı Kişiyev də siyasi məşğələlərə yaxşı hazırlaşırlar.

## Texnikumun ətraf təsərrüfatı

Tələbələrin maddi vəziyyəti xeyli yaxşılaşmışdır. Tələbələrin 80 faizi paltar və ayaqqabı ilə təmin edilmişdir.
1934-cü ildə ətraf təsərrüfatdan 18400 kq çəltik, 1562 kq darı, 6425 kq arpa, 9176 manatlıq bostan məhsulu əldə edilmişdir. Maldarlıq fermasında 12 baş sağmal, 26 baş boğaz, 32 baş ətlik, 10 baş qoşqu malı və 3 at vardır.
Bu payız əkinində texnikum 14 hektar buğda, 16 hektar arpa səpmişdir.
Texnikumda çıxarılan «Qızıl pedaqoq» qəzetinin 80 nəfər müxbiri vardır.
Nöqsanlarımız da vardır. Himayəmizdə olan məktəblərə yaxşı rəhbərlik etmirik.

*Müseyib Sadıqov, Yunus Kişli*
*«Nuxa işçisi», 8 yanvar 1935-ci il, № 2, səh. 2*

## Tələbələrin yaşayışı gözəlləşdirilir

Pedaqoji texnikum komsomol komitəsinin katibi Məhəmməd Qocayev komsomolçu və məktəbli gənclərin mədəni yaşamaları yolunda yaxşı çalışır. O, yaxın günlərdə texnikum tələbə və talibələrin geniş iclasını çağıraraq bu haqda məsələ müzakirə etmişdir.
İclasda yüngül süvari dəstəsi ayrılmışdır. Bu dəstə




bir sıra komsomolçu və məktəbli gənclərin ev məişətlərini yoxlamışdır.
İclasda mədəni yaşayış uğrunda çalışan komsomolçu və məktəbli gənclərin də ev məişətlərini yoxlamışdır.
İclasda mədəni yaşayış uğrunda çalışan komsomolçu və məktəbli gənclərdən Səyyarə Həmidzadə, Nazilə Məmmədzadə, Mirəli və Əsabəli yoldaşları – 13 nəfəri mükafatlandırmışdır.

*Musa Yusifzadə*
*«Nuxa işçisi», 11 aprel 1935-ci il, № 81, səh. 1*

Nuxa Pedaqoji Texnikumuna 1935-36-cı tədris ilinə 5 və 6-cı sinfi bitirmiş qızlar qəbul olunur.
Qəbul müddəti sentyabrın 15-nə qədərdir.

*Direktor Seyfi Hüseynov*
*«Nuxa işçisi», 10 sentyabr 1935-ci il, № 206, səh. 1*

## 53 nəfər əlaçı

Nuxa Pedaqoji Texnikumunda dərs keyfiyyəti yüksəlir. Məktəbdə yaxşı bolşevik intizamı yaradılmışdır. Burada əlaçıların sayı hər gün artır.
Tədris ilinin birinci yarım ilində 31 nəfər bütün dərslərdən əla alanlar var idi. İndi onların sayı 53 nəfərə çatmışdı. Səyyarə Həmidzadə, Baxış Tahirli, Subeyhə Məmmədzadə, Kişvər Əliyeva və s. kimi məktəbin hər işində qabaqcıl olan və verilən dərslərdən əla qiymətlər alanlar çoxdur.

Texnikum təşkilatları əlaçılıq uğrunda mübarizə işinə yaxşı əhəmiyyət verir və şərait yaradırlar.

*Ə.Cabbarov*

*«Nuxa işçisi», 18 mart 1936-cı il, № 63, səh. 2*

## Elan

1936-37-ci tədris ilinə Nuxa Pedaqoji Texnikumunda tələbə qəbulu başlanır.

Aşağıdakı sənədlər təqdim edilməlidir:

Ərizə, yeddiillik məktəb bitirməsinə dair vəsiqə;

Sağlamlıq arayışı, 2 ədəd şəkil.

Qəbul edilənlər hər cəhətdən məktəb tərəfindən təmin olunacaqlar.

Pedoqoji texnikumda iyun ayının 1-də ikiillik institut üzrə fizmat, tarix şöbələri qiyabi institut və qiyabi pedoqoji texnikum kurslarında dərsləri başlayır.

Maarif şöbələri üzrə təhkim olunan müəllim yoldaşlar vaxtında kursda olmalıdırlar.

*Direktor Seyfi*

*«Nuxa işçisi», 30 may 1936-cı il, № 12, səh. 4*

## Bu gün pedaqoji texnikumunda dərslər başlanır

Nuxa Pedaqoji Texnikumunda bu gün ilk yoxlama imtahanları başlanır. İmtahanların müvəffəqiyyətlə keçməsi üçün adi dərs saatlarından əlavə sistematik olaraq





konsultasiyalar və tələbələrə ayrıca məşğələlər keçirilməsi işinə may ayının əvvəllərindən başlanmışdır.

Müəllimlərdən Yusif Kənan, Ziya və Həsən Əfəndizadə, Əyyub Əhmədov, Mustafa İsmayılzadə yoldaşlar tələbələrlə müntəzəm işləmiş, onları hərtərəfli imtahana hazırlamışlar.

Həmişə dərslərindən əlaçı olan tələbələrdən Abbasəli Əhmədov, Məmməd Məmmədov, Mahinur Şirinzadə, Səyyarə Həmidova, Baxşı Tahirzadə, Şövkət Quliyev dərslərindən geri qalan yoldaşlarını imtahana hazırlamışlar.

Bu il texnikum təntənəli buraxılış keçirmək üçün indidən hazırlıq işi aparır.

*S. Sədrəddin*

*«Nuxa işçisi», 5 iyun 1936-cı il № 127, səh. 4*

## Nuxa Pedaqoji Texnikumunun 11-ci və pedaqoji işçi fakültəsinin 6-cı buraxılışı

Pedaqoji texnikumun 11-ci buraxılışında şəhər firqə komitəsinin katibləri Çuverlinski və İbadov, şəhər Şurasının sədri Abdullayev və Quliyev yoldaşlar iştirak edirdilər.

İclasda texnikum direktoru Seyfi Hüseynov texnikumda 1935-36-cı dərs ilinin yekunu və qarşıda duran vəzifələrdən danışmışdır. Daha sonra maarif işçiləri ittifaqının sədri İsmayıl Həmidov, Mustafa İsmayılov və Zeynalov yoldaşlar yeni gənc müəllimləri təbrik etmişlər.

Məktəbi bitirən 63 nəfər müəllim adından Şəfiqə Səfərova, işçi fakültəsini bitirən 28 nəfər adından Nuri yoldaşlar danışaraq öhdələrinə çoxlu təhüdlər götürmüşlər.

Rəsmi hissədən sonra tələbələrə, valideynlərə, buraxılışda iştirak edən bütün qonaqlara böyük ziyafət verilmişdir.

*Cabbar*
*«Nuxa işçisi», 26 iyun 1936-cı il, № 144, səh. 3*

## Puşkinin vəfatının 100 illiyi qarşısında pedaqoji texnikumda hazırlıq

Nuxa Pedaqoji Texnikumunda böyük rus şairi A.S.Puşkinin vəfatının 100 illiyinə ciddi hazırlıq aparılır. Məktəbdə Puşkinin əsərlərindən ibarət sərgi təşkil edilmişdir.

Tələbələrdən Əbdürrəhim Hacızadə, İsrafil İsmayılov, Ələddin Əmrahov şairin «Qaraçılar», «Baxçasaray fantanı», «Kapitan qızı», «Yevgeni Onegin», «Dobrovski» əsərlərini oxuyub yaxşı öyrənmiş və öyrəndiklərini tələbələrə izah etmişlər.

Yanvarın 29-da texnikumda şairin xatirəsinə aid böyük bədii gecə keçirilmişdir.

*Yusif Kənan*
*«Nuxa işçisi», 23 yanvar 1937-ci il, № 23, səh. 43*





# V bölmə

## Bizim direktorlar

Şəki Pedaqoji Texnikumunda işləyən direktorlar haqqında

| Sıra | Adı, soyadı və atasının adı | Vəzifəsi | İşlədiyi illər |
|---|---|---|---|
| 1. | Rəcəb Əfəndiyev | Direktor | 1920-1927 |
| 2. | Sani Məmmədov | Direktor əvəzi | 1927-1928 |
| 3. | Hacıbala Hacızadə | Direktor | 1928-1930 |
| 4. | Abduləli Sərdarlı | Direktor | 1930-1930 |
| 5. | Məhərrəm Qarayev | Direktor | 1930-1932 |
| 6. | Seyfi Hüseynov | Direktor | 1932-1937 |
| 7. | Əlihüseyn Hacıkişiyev | Direktor | 1937-1938 |
| 8. | Əhməd Əbdürəhmanlı | Direktor | 1938-1939 |
| 9. | Mirzə Salehli | Direktor | 1939-1941 |
| 10. | Rza Babayev | Direktor | 1941-1943 |
| 11. | Yusif Həmidov | Direktor | 1943-1945 |
| 12. | Mirzə Salehli | Direktor | 1945-1952 |
| 13. | Qurban Abbasov | Direktor | 1952-1957 |
| 14. | Aminə Babayeva | Direktor | 1957-1967 |
| 15. | Zinyət Məmmədova | Direktor | 1967-1972 |
| 16. | M.Sadıq Naibov | Direktor | 1972-1974 |
| 17. | Cəmil Süleymanov | Direktor | 1974-1982 |
| 18. | Mədinə İsmayılova | Direktor | 1983-1988 |
| 19. | Rafiq Şükürov | Direktor | 1988-1992 |
| 20. | Akif Cabbarov | Direktor | 1992-1993 |
| 21. | Rafiq Şükürov | Direktor | 1993- |

## Rəcəb Əsədulla oğlu Əfəndiyev



Hər bir xalqın tarixində, onun tarixi inkişafının müəyyən mərhələsində görürsən, bir nəsil yetişir və bu nəsil onu yetirən xalqın başını ucaldır, ürəklərin sönməz hərarətindən ictimai-siyasi həyata təp-təzə hava gətirir, elmin, mədəniyyətin, maarifin inkişafını təmin edir.

XIX əsrin sonları və XX əsrin əvvəllərində Azərbaycanda da belə bir nəsil, xüsusilə müəllimlər nəsli yetişmişdi: H.B.Zərdabi, N.B.Vəzirov, S.M.Qənizadə, Ə.Haqverdiyev, N.Nərimanov, C.Məmmədquluzadə, F.Köçərli, Rəşid bəy Əfəndiyev yaşadıqları qaranlıq mühiti maarif ziyası ilə işıqlandıran bir nəslin nümayəndələri idilər. Ətrafına nur saçan, minlərlə gəncin gözünə maarif işığı verən, bütün ömrünü vətən övladının savadlanmasına, mədəni inkişafına sərf edən nəcib insanlardan, sözün əsl mənasında xalq müəllimlərindən biri Rəcəb Əsədulla oğlu Əfəndiyev olmuşdur.

Rəcəb Əfəndiyev 1893-cü ildə Şəki şəhərində sənətkar ailəsində anadan olmuşdur. Atası dövrünün açıqfikirli adamlarından biri olduğundan oğlu Rəcəbin təlim-tərbiyəsinə ciddi fikir vermiş, onun xalqa layiqli bir övlad kimi yetişməsinə çalışmışdır.

İlk təhsilini mədrəsədə, sonra isə Nuxa şəhər məktəbində alan Rəcəb Əfəndiyev 1909-cu ildə Zaqafqaziyanın məşhur Qori müəllimlər seminariyasına daxil olur. Bu, gənc Rəcəbin həyatında yeni bir dövrün başlanğıcı idi.





Rəcəb Əfəndiyev hələ seminariyanın tələbəsiykən ictimai fəaliyyətə başlamış, bir sıra mədəni-maarif tədbirlərinin həyata keçirilməsində fəal iştirak etmişdir.

O, həm seminariyada, həm də tətillər zamanı Nuxada dram dərnəyi təşkil etmiş, doğma şəhərində əməkçilər üçün qiraətxana, axşam savad kursları yaratmış, müxtəlif mövzularda kütləvi mühazirələr oxumuşdur. O elə həmin illərdən də mətbuat səhifələrində çıxış etməyə başlamışdır. Tələbəlik illərində – 1912-ci ildə hələ 19 yaşında ikən rus dilində yazdığı «Tərbiyə sistemində həvəsləndirmə və cəza» *(«Поощирения и наказания в системе воспитания»)* adlı 2 çap vərəqi həcmində yazısı Qori müəllimlər seminariyasının iclasında oxunmuş və yüksək qiymətləndirilmişdir.

Gənc Rəcəbin həyatından nümunə gətirəcəyimiz, bu günə qədər heç yerdə çap olunmamış və heç bir tədqiqatçının diqqətini cəlb etməmiş iki fakt çox maraqlıdır:

1. 1911-ci ilin noyabrında Qori Müəllimlər Seminariyasında M.F.Axundovun anadan olmasının 100 illiyi münasibəti ilə məşhur pedaqoq F.Köçərlinin rəhbərliyi ilə xatirə gecəsi keçirilmişdi. Xatirə gecəsində M.F.Axundovun «Müsyo Jordan və dərviş Məstəli şah» komediyası azərbaycanlı tələbələrin ifasında tamaşaya qoyulmuşdu. Rəcəb Əfəndiyev həmin tamaşada Məstəli şah rolunda çıxış etmişdir. Onun ifası o qədər təsirli və güclü olmuşdur ki, tamaşanın axırında F.Köçərli sevimli tələbəsinə demişdir «Oğlum Rəcəb, sağ ol, məni sevindirdin. Məstəli şah rolunu çox gözəl oynadın», *(«Yeni İrşad» qəzeti, 2 dekabr, 1911-ci il, №78)*

2. Yuxarıda qeyd edildiyi kimi, Rəcəb Əfəndiyev seminariyadan Nuxaya yay tətillərinə gələndə öz dostlarını toplayıb tamaşalar təşkil edirmiş. «İqbal» qəzetinin 5 avqust 1912-ci il tarixli 130-cu nömrəsində Nuxadan Həsən

Tahirzadə adlı birisi yazırdı: «....Şəhərimizin hümmətli, qüdrətli cavanları Rəcəb Əfəndiyev, Məbud Sərkərov, Yahya Səfərov, Məmmədiyə Əzizağayev, Məmmədiyə Əfəndiyev zavallı cəmiyyəti-xeyriyyəmizin böylə fəlakətlər keçirdiyini nəzərə alıb, bir həftə əvvəl hümmət əllərini uzadaraq, cəmiyyəti-xeyriyyənin mənfəətinə bir teatr tərtib etdilər... Hasil olan 57 manat 35 qəpiyi cəmiyyəti-xeyriyyənin kassasına təqdim etdilər. Bu fədakar cavanların xidməti müqabilində şükrani-nemət olmaq birinci vəzifələrdəndir...»

Rəcəb Əfəndiyev 1914-cü ildə Qori seminariyasını fərqlənmə diplomu ilə bitirib Bakı quberniyasının sərəncamına göndərildi. Onu qabaqcıl bir məzun kimi Göyçay ikisinifli ibtidai məktəbinə müdir təyin etdilər. Avamlıqla, cəhalətlə üz-üzə gələn gənc müəllim əziyyətlər çəkir, çətinliklərlə qarşılaşır. Lakin bu çətinliklər onu qorxutmur. O, təkcə gənc nəslin təlim-tərbiyəsi ilə məşğul olmaqla kifayətlənmir, həm də avam valideynlərin gözlərini açmağa çalışırdı.

Rəcəb Əfəndiyev 1915-ci ildə Şəkidə təşkil edilən qadın və kişi gimnaziyasına direktor təyin edildi.

O zaman dərsliklərin olmaması, yaxud da vaxtılə cüzi tirajla buraxılan «Vətən dili», «Uşaq çeşməyi», «Ana dili», «Gülzar» və s.dərsliklərin sıradan çıxması müəllimlər üçün böyük çətinlik yaradırdı. Dərsliyə olan, xüsusilə, qiraət dərsliklərinə olan ehtiyacı müəyyən qədər ödəmək məqsədilə Rəcəb Əfəndiyev 1917-ci ildə 160 səhifədən ibarət «Türk çələngi» adlı dərsliyini tərtib edərək, Şəkidə nəşrinə nail olmuşdur. Dərslikdəki materiallar uşaqlarda məktəbə, elmə, kitaba məhəbbət hissi aşılayırdı.

F.Köçərli, Ə.Haqverdiyev və S.S.Axundovla səmimi dostluq edən gənc Rəcəb müəllim xalqının maariflənməsi




yolunda əlindən gələni etmişdir. O, təkcə dərs deməklə, məktəblər təşkil etməklə kifayətlənməmiş, pedaqoji və ictimai fəaliyyəti ilə yanaşı, bədii yaradıcılıqla da məşğul olmuşdur. O, hələ seminariyada təhsil aldığı illərdən başlayaraq müxtəlif mətbuat səhifələrində maraqlı hekayələr dərc etdirirdi.

1911-ci ildə «Yeni İrşad» qəzetində Rəcəb Əfəndiyevin «Gimnazist Vahid, yaxud mütəəllimlərə ibrət», «Aclar», «Əttar dükanında», «Rahat olmaq istəyirəm», «Tərbiyə qurbanı» hekayələri, 1912-ci ildə «Məktəb» jurnalında «Axır çərşənbəsi» pyesi, 1914-cü ildə «İqbal» qəzetində «Kimdir o?», «Yaxşılıq» hekayələri çap olunmuşdur. 1917-ci ildə Nuxa mətbəəsində onun «Namus» povesti ayrıca kitabça halında nəşr olunmuşdur. Bu povest hələ 1915-ci ildə «Dirilik» jurnalının 15,16,17-ci nömrələrində çap olunmuşdu.

Həmin bədii əsərlərdə ailə-məişət məsələlərinə toxunulur, xalq kütlələrinin maariflənməsinə maneçilik törədənlər tənqid edilir, o dövrdəki sadə insanların, binəsiblərin ağır və yoxsul həyatı təsvir olunur.

Rəcəb Əfəndiyevin istər bədii əsərlərində ifadə olunan, istərsə də pedaqoji fəaliyyətində can atdığı nəcib arzular yalnız 1920-ci ildə geniş surətdə həyata keçməyə başladı.

Bütün mütərəqqi ziyalılar kimi Rəcəb Əfəndiyev də yeni quruluşun ilk günlərindən yeni məktəblərin təşkili ilə, dərs deməklə gənc nəslin təlim-tərbiyəsi ilə məşğul olmağa başladı.

Əgər biz Rəcəb Əfəndiyevin sovet dövrü fəaliyyətini təhlil etsək, bu dövrdə onun yaradıcılığının üç istiqamətdə getdiyini söyləyə bilərik:

1. Rəcəb Əfəndiyev pedaqoji kadr hazırlığı ilə məşğul olmuşdur. Bu mənada onun Rəşid bəy Əfəndiyevlə birlik-

də Nuxa Pedaqoji Texnikumunu təsis etməsi, 1928-ci ilədək həmin texnikumun direktoru olması, sonra isə Bakıda qiyabi pedaqoji institutunda çalışması xüsusilə qeyd olunmalıdır.

2. Rəcəb Əfəndiyev çox səmərəli elmi-tədqiqat və metodik işlə məşğul olmuş, bir sıra elmi-pedaqoji əsərlər yazmışdır. «İş yeri seçmənin pedaqoji prinsipləri» – 1931-ci il, «İş otağı» – 1933-cü il, «Müəllimlərin ixtisasınıartırma işinin təşkili» – 1934-cü il, «Kurs işlərinin metodları» – 1935-ci il, «Qiyabi təhsil sistemində şifahi konsultasiya» – 1935-ci il və s. Rəcəb Əfəndiyevin dilimizdə pedaqoji fənlərə aid istilahların müəyyənləşdirilməsində də böyük xidmətləri olmuşdur. 1930-cu illərin sonlarında «İzahlı pedaqoji lüğət»i tərtib edən müəlliflər kollektivi yaradılmışdı. Rəcəb Əfəndiyev «İzahlı pedaqoji lüğət»in ən ağır sahəsini öz üzərinə götürərək, 4 min söz istilahdan ibarət lüğət tərtib etmişdi. Rəcəb Əfəndiyevin yazdığı «Xalq maarifi üzrə təlim kitabı» və «Füzulinin pedaqoji görüşləri» əsərləri də çox diqqətə layiqdir».

Yorulmaq bilməyən bu görkəmli maarif xadimi Böyük Vətən Müharibəsi illərində daha səmərəli işləmişdir. Onun bu illərdə yazdığı «Gənc nəslin hərbi tərbiyəsi», «Şagirdlərin fiziki tərbiyəsi və hərbi hazırlığı» kitablarını, «Müəllim-lərin iki sinifdə eyni zamanda işləməsi haqqında», «İki komplektli məktəbdə müəllimin işi», «Pedaqoji məktəblərdə pedaqoji təcrübənin təşkili və üsulları», «Direktor tərəfindən dərslərin dinlənilməsi və təhlil edilməsi üsulu» adlı əsərləri indi də öz elmi-pedaqoji əhəmiyyətini saxlamaqdadır.

3. Rəcəb Əfəndiyev tərcüməçilk fəaliyyəti ilə məşğul olmuş, dünya və rus klassik pedaqoji fikri ilə müəllimlərimizi tanış etmişdir.




Onun tərcümə etdiyi əsərlər sırasında Y.A.Komenskinin «Didaktikanın prinsipləri», K.D.Uşinskinin «Məktəbdə təlim-tərbiyə işləri haqqında», Herbartın və Pestalotsinin seçilmiş əsərlərini misal göstərmək olar.Rəcəb Əfəndiyev pedaqogika və psixologiyadan orta və ali məktəblər üçün yazılmış qiymətli dərsliklərin də ilk tərcüməçisi və redaktoru olmuşdur.

Görkəmli maarif xadimi Rəcəb Əfəndiyev nəsillərə nümunə olacaq mənalı bir həyat yolu keçmişdir. O, öz istedadı və əməksevərliyi ilə məktəb müəllimliyindən alimliyə qədər yüksəlmişdir.

Rəcəb Əfəndiyev 1956-cı ildə Bakı şəhərində vəfat etmişdir.

Onun xalqımız üçün qoyub getdiyi ən böyük irs uzun illər boyu dərs dediyi yetirmələridir.

Rəcəb Əfəndiyev xalqımız üçün layiqli övladlar yetişdirmişdir. Böyük oğlu Hüseyn Əfəndiyev uzun illər indiki Neft Akademiyasında çalışmış, kiçik oğlu bütün müəllim və məktəblilərin sevimlisi filologiya elmləri doktoru, professor Əziz Əfəndizadə, böyük qızı Münəvvər xanım Azərbaycan Pedaqoji Universitetində atalarının fəaliyyətini ləyaqətlə davam etdirmişlər. Kiçik qızı Pirayə xanım isə memarlıq ixtisasına yiyələnmiş və ən çox məktəb binalarının layihələri üzərində işləmişdir.

## Hüseynov Seyfulla Cəlal oğlu



Şəki Pedaqoji Texnikumunun salnaməsində qızıl hərflərlə yazılmış daha bir ad da var: Seyfulla Cəlal oğlu Hüseynov.

Azərbaycan Respublikasının əməkdar müəllimi, «Lenin» ordeni, «Qələbə» medalı, «Miçurin» medalı, Elmi kitabxana, maddi mükafatlar...,

Bütün sadaladıqlarım Seyfulla müəllimin gərgin əməyinə verilən dövlət mükafatlarının bir hissəsidir. Siyahını artırmaq da olardı. Lakin əsas məqsəd Seyfulla müəllimin bir insan kimi, bir pedaqoq kimi daxili aləmini açmaq və onun pedaqoji təcrübəsi ilə yaxından tanış olmaqdır.

Seyfulla Cəlal oğlu Hüseynov (Seyfi Hüseyn) 1896-cı ildə Nuxa (Şəki) şəhərində anadan olmuşdur. İlk təhsilini ibtidai məktəbdə alıb. 1917-ci ildə ikiaylıq müəllimlər kursunda müdavim olduqdan sonra 9 saylı məktəbə direktor təyin edilir.O, 1921-ci ildə məktəbin nəzdində qızlar şöbəsinin açılmasına müvəffəq olur. Bu müddət ərzində Seyfulla müəllim rayonda açılmış «Savadsızlığın ləğvi» kursunda da fəhlələrin savadlanması üçün dərslər təşkil edir. Şəhərin 18-ci rayonunda məktəb binasının olmaması gənc müəllimi narahat edir və bu ərazidə ictimaiyyətin köməyi ilə yeni məktəb binasının inşa edilməsinə nail olur.

S. Hüseynov 1924-1927-ci illərdə Azərbaycan Ali Pedaqoji İnstitutunda təhsil alır və yenidən doğma rayonuna qayıdır. 1927-ci ildə Şəki Pedaqoji məktəbinə müəllim təyin edilir. 1939-cu ilə qədər Seyfulla müəllimin pedaqoji





fəaliyyəti həmin təhsil ocağı ilə bağlı olur. O, pedaqoji məktəbdə dərs hissə müdiri və direktor vəzifəsində çalışır.

Kimya və biologiya fənlərini tədris etməklə yanaşı, Seyfulla Hüseynov pedaqoji məktəbdə bir çox abadlıq işlərinin görülməsinə müvvəfəq olur. Həyətyanı sahəni tələbələrin köməyi ilə meyvə-tərəvəz bağına çevirən müəllim həmin ərzaq məhsulları vasitəsilə müəllimləri təkmilləşdirmə kursunun müdavimlərinin ailələrinin və pedaqoji məktəb tələbələrinin yay tətilində ehtiyaclarını ödəməyə nail olur.

Həmin illərdə bacarıqlı rəhbər pedaqoji məktəbin nəzdində «Məktəbəqədər tərbiyəçilərin hazırlıq kursu»nun açılmasına müvəffəq olur.

1936-1937-ci illərdə Azərbaycan TN-nin sistemi üzrə aparılan attestasiya komissiyasının sədri olan Seyfulla müəllim Nuxa, Qax, Zaqatala, Oğuz və Qəbələ rayon müəllimlərinin attestasiya işini aparmışdır.O, həmin dövrdə elmi-metodik ədəbiyyatın çatışmazlığı problemini aradan qaldırmaq üçün Pedaqoji məktəbin savadlı, bacarıqlı müəllimləri ilə bütün fənlərə aid elmi-metodiki ədəbiyyatın hazırlanmasına və yerli mətbuatda dərc edilərək çoxaldılmasına nail olmuşdur.

Seyfulla müəllimin 1939-cu ildən 1960-cı ilə qədər olan dövrdəki fəaliyyəti ümumtəhsil məktəbləri ilə bağlıdır.O, bu illər ərzində 7 saylı məktəbdə müəllim, həm də rayon pedaqoji kabinetində müdir, müharibənin ağır illərində isə Bakı şəhərinin bir sıra məktəblərində, həmçinin Balakən rayonunun Xalatala kəndində dərs hissə müdiri və müəllim vəzifələrində çalışmışdır.

1944-cü ildə yenidən doğma rayonuna qayıdaraq 10 saylı orta məktəbdə direktor kimi fəaliyyətə başlamışdır.

Dərs dediyi şagirdlərlə birlikdə Seyfulla müəllim məktəbin həyatində sınaq-təcrübə sahəsi yaratmışdır.

Şagirdlər onlar üçün ayrılmış sahədə və biologiya kabinetində dünyanın ən nadir olan 75 növ gül-çiçək növünü əkib-becərməyə nail olmuşlar.Sonralar həmin sortlarla məktəbin pedaqoji kollektivi 2 dəfə USTN-də iştirak etmiş, sərginin medalına və pul mükafatına layiq görülmüşdür.

Seyfulla müəllim öz xatirələrində yazır: «M.Qorki adına 10 saylı məktəbi bitirən şagirdlərdən bir çoxlarının Moskva, Sankt-Peterburq və Bakı şəhərlərində təhsil almaları üçün yaxından təşəbbüs göstərmişəm.Adları çəkilən şəhərlərdəki ali məktəblərlə müntəzəm əlaqə saxlayıb onların necə oxumalarını və təhsil sistemində bizim kəsirli cəhətlərimizi öyrənmişəm ki, bu da sonrakı illərdə kadr hazırlığı işinə kömək etmişdir.

43 illik müəllimliyim müddətində yüzlərlə alim, yazıçı, ədib, həkim, mühəndis, aqronom hazırlanması işində bütün qüvvəmi sərf etmişəm».

Seyfulla Hüseynov hamı kimi bir insan ömrü yaşadı. Lakin bu şərəfli ömrünü xalqına, onun təhsilinin inkişafına, respublikamızda savadsızlığın ləğv edilməsinə sərf etdi.





## Əbdürəhmanlı Əhməd İsa oğlu



1906-cı ildə Şəki şəhərində fəhlə ailəsində anadan olmuş, 1913-1923-cü illərdə 2 saylı məktəbdə təhsil almış, 1923-1927-ci illərdə Pedaqoji İnstitutun riyaziyyat fakültəsini bitirmişdir. 1929-1938-ci illərdə Nuxa Pedaqoji Texnikumunda müəllim işləmişdir.

2 yanvar 1938-ci ildə Azərbaycan Xalq Maarif Komissarlığının 7 saylı əmrilə Nuxa Stalin adına Pedaqoji Texnikumu və onun ətraf təsərrüfatına müvəqqəti olaraq direktor təyin edilmişdir. 17 yanvar 1939-cu ildə AXMK-nın rəhbəri T.Hacıyevin əmrinə əsasən Nuxa Pedaqoji Texnikumu və Kirov adına pedrabfaktda direktor vəzifəsində saxlanılmışdır.

16 avqust 1939-cu il Azərbaycan XMK-nin 3573 saylı əmrinə əsasən başqa işə keçirilməsi ilə əlaqədar vəzifəsindən azad edilmişdir.

1939-1940-cı illərdə Nuxa Zəhmətkeş Deputatlar Soveti İcraiyyə Komitəsinin sədri vəzifəsində çalışmışdır.

1941-1946-cı illərdə Nuxa Şəhər Partiya Komitəsinin I katibi işləmişdir.

1946-cı ilin 21 fevralında vəfat etmişdir.

Məlumatın əsası:

1. Şəki Pedaqoji Texnikumunun arxiv sənədləri. Əmrlər kitabı 1938-1939-cu illər.

2. Azərbaycan Respublikası Mərkəzi arxivinin Şəki filialı.

3. Qızı Vəzifə Əbdürəhmanovanın müsahibəsi və atası haqqında xatirələri.

## Rəsullu Rəsul Yusif oğlu



Rəsul Rəsullu 1908-ci ildə Nuxada(Şəkidə) fəhlə ailəsində anadan olub. 10-12 yaşlarında ikən atası ilə birlikdə ipək kombinatında fəhlə işləyib. Oxumağa olan həvəsini nəzərə alan atası 1921-ci ildə onu ibtidai məktəbə qoyub. Özünün zirəkliyi və elmə olan sonsuz həvəsi və marağı ilə yaşıdlarından seçilən Rəsul Rəsullu 1924-cü ildə Bakı Pedaqoji Texnikumuna qəbul olundu. 3 illik gərgin təhsildən sonra 1927-ci ildə Qax rayonunun İlisu kəndinə müəllim göndərildi. Bacarığı, məktəbə, təlim-tərbiyəyə olan məhəbbəti onu bir az da irəli apardı. Rəsul Rəsullu 1929-1930-cu illərdə Zaqatala- Nuxa zona maarif şöbəsində inspektor vəzifəsinə irəli çəkilmişdir.

Mərkəzdə olduğu kimi bölgələrdə də əhalinin xeyli hissəsinin savadsız olduğu bir dövrdə gənc Rəsul müxtəlif kurslarda könüllülərə əlifba öyrətməklə də məşğul olmuşdur. 1931-1936-cı illərdə isə, o, Şəkinin bir çox məktəb və texnikumlarında müəllim kimi fəaliyyət göstərmişdir. O, 1936-cı ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna (indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinə) daxil olmuş. 1940-cı ildə oranı fərqlənmə diplomu ilə bitirmişdir.

Rəsullu həm də fəal ictimaiyyətçi idi. O, əhalinin maariflənməsi, qəflət yuxusundan ayılması üçün əlindən gələni əsirgəməmişdir.

Şəkidə İkiillik Dövlət Müəllimlər İnstitutunun açılmasında, onun təşkilində də Rəsul Rəsullunun əvəzsiz xidməti olmuşdur. 1940-1953-cü illərdə fəaliyyət göstərən





bu qabaqcıl təhsil ocağında yüzlərlə oğlan və qız təhsil almış, xalqın maariflənməsində bilik və bacarıqlarını əsirgəməmişlər. Bu gün Şəki-Zaqatala bölgəsində fəaliyyət göstərən tanınmış, adlı-sanlı müəllimlərin tərcümeyi-halında bu qədim elm məbədinin adına rast gəlirik. Rəsul Rəsullu 13 il bu instituta rəhbərlik etmiş, müharibə illərində kişilərin cəbhəyə yollandığı bir dövrdə çox güclü pedaqoji kollektiv toplaya bilmişdi.

Şəki İkiillik Müəllimlər İnstitutunda dörd ixtisas üzrə müəllim kadrları hazırlanmışdır ki, onlar da Şəkinin bir sənaye şəhəri kimi inkişaf etməsində, elmin, mədəniyyətin tərəqqisində öz layiqli töhvələrini vermişlər.

1953-cü ildə Şəki İkiillik Müəllimlər İnstitutu ləğv edilərək H.Zərdabi adına Kirovabad Pedaqoji İnstitutunun (indiki Gəncə Dövlət Universitetinin) tərkibinə verilmişdir.

Rəsul Rəsullunun sonrakı pedaqoji fəaliyyətinin altı ili də bu təhsil ocağı ilə bağlı olmuşdur.

Rəsul Rəsullu 1945-ci ildə Moskvada namizədlik dissertasiyasını müdafiə edərək «Filologiya elmləri namizədi» alimlik dərəcəsi almışdır. O, 1947-ci ildə Azərbaycan SSR Ali Sovetinə Nuxa(Şəki) şəhər üçüncü seçki dairəsindən deputat seçilmişdir. R.Rəsullu həm müəllim, həm deputat, həm də yaşadığı elin adi bir vətəndaşı kimi həmişə xalqının seçilib-sayılan simalarından olmuşdur.

R.Rəsullu 1953-1958-ci illərdə H.Zərdabi adına Pedaqoji İnstitutda (indiki Gəncə DU-də) Azərbaycan ədəbiyyatı kafedrasında dosent vəzifəsində çalışmış, 1958-1959-cu illərdə isə Azərbaycan Pedaqoji İnstitutunda (indiki Azərbaycan DPU-də) «Azərbaycan ədəbiyyatı» kafedrasının dosenti olmuşdur.

R.Rəsullu özündən sonra böyük irs qoyub getmişdir. O, N.Gəncəvinin anadan olmasının 800 illiyinə həsr edil-

miş «Ölməz sənətkar» adlı monoqrafiyanın, S.S.Axundovun dramaturgiyasına həsr edilmiş 4 elmi məqalənin, həmçinin Azərbaycan dilinin və ədəbiyyatının araşdırıcısı kimi 25 elmi məqalənin, rus yazıçıları N.V.Qoqolun, F.N.Radişşevin, L.N.Tolstoyun, A.P.Çexovun, M.Mayakovskinin və M.Qorkinin həyat və yaradıcılıqlarını əks etdirən 20-dən çox elmi məqalənin müəllifidir.

R.Rəsullunun səmərəli fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirilmişdir. O, 1942-ci ildə «Azərbaycan SSR Əməkdar müəllimi» adı ilə, 1944-cü ildə «Əməkdə fərqlənməyə görə», 1945-ci ildə «Qafqazın müdafiəsinə görə» medalı ilə təltif edilmişdir.

Rəsul Yusif oğlu Rəsullu 1962-ci ildə vəfat etmişdir.

***PS.*** *İkiillik Müəllimlər İnstitutu Pedaqoji Texnikumla bir binada, eyni vaxtda fəaliyyət göstərdiyindən onun direktoru haqqında da yazmağı lazım bildik.*





## Salehli Mirzə Məmmədbağır oğlu



Mirzə Salehli 1905-ci ildə Şəki şəhərində anadan olmuş, orta təhsilini başa vurduqdan sonra Azərbaycan Pedaqoji İnstitutun(indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin) coğrafiya fakültəsinə daxil olmuşdur.

Mirzə Salehli ali məktəbi bitirdikdən sonra təyinatla İsmayıllı rayonunun Lahıc kənd orta məktəbinə direktor vəzifəsinə təyin olunmuş, burada 5 il direktor kimi fəaliyyət göstərdikdən sonra 1939-cu ildə Şəkiyə qayıtmış və burada Şəki Pedaqoji məktəbinə direktor təyin olunmuşdur.

Böyük Vətən Müharibəsi illərində Mirzə Salehli də döyüşən orduya getmiş, cəbhənin müxtəlif istiqamətlərində xidmət edərək kapitan rütbəsinə kimi yüksəlmiş və artileriya batareyasının komandiri olmuşdur.

1945-ci ildə Almaniyanın Poznan şəhərinin alınmasında fəal iştirak edərək ayağından ağır yaralanmış və aldığı ağır yaraya görə ordu sıralarından tərxis olunaraq doğma Şəkiyə qayıtmışdır.

Mirzə Salehli müharibə illərində göstərdiyi igidliyə görə dövlət tərəfindən müxtəlif orden və medallarla təltif olunmuşdur.

Həyat yoldaşı Abdurrəhmanova Züleyxa Məmməd qızı (onlar 1939-cu ildə ailə həyatı qurmuşdular və Züleyxa xanım da Şəki Pedaqoji məktəbində kimya və biologiya fənlərini tədris etmişdir) Böyük Vətən Müharibəsi illərində Şəkidə arxa cəbhə təminatı üzrə təşkil edilmiş, Ukrayna və

Belarusiyadan qaçqın düşmüş şəxslərin yerləşdirilməsi və onların maddi təminatı ilə məşğul olan komitəyə rəhbərlik etmişdir. Bununla bərabər Züleyxa xanım müharibə illərinin bütün ağırlıqlarına baxmayaraq 10 nəfər yəhudi qaçqını öz evində yerləşdirmişdir.

Mirzə Salehli müharibədən qayıtdıqdan sonra yenə Şəki Pedaqoji Texnikumunda pedaqoji fəaliyyətini direktor kimi davam etdirmişdir.

1952-1955-ci illərdə Azərbaycan Respublikası Təhsil Nazirliyində Ali və Orta ixtisas üzrə kadrlar şöbəsinin müdiri vəzifəsində çalışmışdır.

1955-ci ildən isə Azərbaycan Dövlət Universitetinin (indiki BDU-nun) coğrafiya fakültəsində geoloji coğrafiya fənninin tədrisi üzrə baş müəllim, sonra dosent vəzifəsində işləmişdir.

Bu dövrlərdə əmək fəaliyyətində əldə etdiyi nailiyyətlərə görə «Şərəf nişanı» ordeni ilə təltif olunmuşdur.

İki övladı olmuşdur.

Oğlu Salehli Edison Mirzə oğlu 1940-cı ildə, qızı Salehli Solmaz Mirzə qızı 1946-cı ildə anadan olmuşdur.

Mirzə Salehli 1963-cü ildə vəfat etmişdir.





## Abbasov Qurban Cabbar oğlu



Abbasov Qurban Cabbar oğlu 1908-ci ildə Şəki şəhərində sənətkar ailəsində anadan olmuşdur. 1926-cı ildə Nuxa Pedaqoji məktəbini, 1932-ci ildə isə Azərbaycan Pedaqoji İnstitutunu bitirmişdir. Böyük Vətən Müharibəsində iştirak etmişdir.

Şəki 10 saylı orta məktəbdə dərs hissə müdiri, 11 saylı orta məktəbdə, 2 saylı internat məktəbində direktor işləmişdir. Uzun illər rayonda rəhbər vəzifələrdə çalışmış, 1973-cü ildə vəfat etmişdir.

Bu qısa arayışdan yəqin ki, nisbətən yaşlı oxucular kimdən söhbət açılacağını bildilər.Çünki sağlığında hamı onu tanıyar, ciddi görkəmindən çəkinər və ona hörmətlə yanaşardılar. Əlbəttə, bütövlüklə ömrünü elmə, təhsilin inkişafına, gənc nəslin tərbiyəsinə həsr etmiş insana xalqın münasibəti başqa cür ola bilməzdi. Uşaqlığı və gəncliyi tarixin sərt və keşməkeşli vaxtlarına təsadüf etmişdir. İlk təhsilini mədrəsədə, 1918-ci ildə rus-tatar məktəbində, sonra isə nümunə-zəhmət məktəbində almışdır. Nuxa Pedaqoji məktəbinin ilk məzunlarından olmuşdur. 1926-ci ildə (18 yaşında) Nuxa şəhər 10 saylı orta məktəbdə ibtidai sinif müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1929-cu ildə (21 yaşında) 9 saylı məktəbin direktoru və müəllimi vəzifələrində işləmişdir. Gənc yaşlarında kifayət qədər nüfuz qazanmasına, rəhbər vəzifələrdə işləməsinə baxmayaraq, alı təhsil almağın nə qədər vacib olduğunu bilirdi. Bu məqsədlə 1929-cu ildə Q.Abbasov Azərbaycan

Pedaqoji İnstitutunun kimya-biologiya fakültəsinə daxil olur və 1932-ci ildə təhsilini uğurla başa vurur.

O, 1932-ci ildə Nuxa Pedaqoji məktəbinə müəllim təyin edilir. İşlədiyi müddətdə tələbələr və pedaqoji kollektiv onu savadlı, öz peşəsini sevən müəllim kimi tanıyırdı. Malik olduğu bu yüksək keyfiyyətlər məktəb rəhbərliyinin də diqqətindən qaçmır. 1939-cu ildə Q.Abbasov irəli çəkilərək tədris hissə müdiri vəzifəsində işə başlayır.

Böyük Vətən Müharibəsi başlanandan iki ay sonra – avqust ayında hərbi səfərbərliyə əsasən cəbhəyə göndərilir.Krım, Şimali Qafqaz cəbhələrində 44-cü ordunun 416-cı Taqanroq diviziyasının tərkibində düşmənə qarşı döyüşlərdə leytenant rutbəsində vzvod komandiri kimi fəal iştirak edir.1942-ci ilin fevral ayında Kerç uğrunda döyüşlərdə baş nahiyəsindən ağır yaralanır. 18 iyul 1943-cü ildə II qrup əlil kimi ordu sıralarından tərxis olunub, əvvəllər işlədiyi Nuxa Pedaqoji məktəbinə qayıdır.

Müharibə illərində hər bir sahədə olduğu kimi təhsildə də kifayət qədər çətinliklər yaranmışdı. Bütün bu çətinliklərə baxmayaraq Qurban müəllim öz üzərinə düşən vəzifənin öhdəsindən ləyaqətlə gəlir və bütün qüvvəsini gənc nəslin tərbiyəsinə yönəldir.

1952-ci ildə isə ona yüksək etimad göstərilərək Pedaqoji məktəbə direktor təyin edilir. 1957-ci ilədək bu vəzifədə çalışır. Qurban müəllimin ömrünün 25 ili pedaqoji məktəblə bağlıdır.

Müəllimlikdən direktorluğadək bütün vəzifələrdə çalışan Qurban müəllimin bu dövrdə Pedaqoji məktəbin yaşamasında, inkişaf etməsində danılmaz xidmətləri olmuşdur.

O, rayonun ictimai həyatında da yaxından işirak etmiş, bir neçə çağırış Nuxa şəhər Zəhmətkeş Deputatlar





Sovetinin deputatı seçilmiş, Zəhmətkeş Deputatlar Sovetinin təbiəti mühafizə və abadlıq işləri daimi komissiyalarının üzvü kimi şəhərin yaşıllaşdırılması və abadlaşdırılması işlərində rəhbərlik etdiyi kollektivlə birlikdə yaxından iştirak etmişdir.

Q.Abbasov 1949-1953-cü illərdə Nuxa rayon Xalq məhkəməsinin iclasçısı seçilərək həmin illərdə eyni zamanda xalq hakimini əvəz edərək özünün ədalətli olması və qanunçuluğa sədaqəti ilə xüsusi fərqlənmişdir.

Elmin, maarifin inkişafında göstərdiyi xidmətlər dövlət rəhbərliyinin də diqqətindən yayınmır.Q.Abbasov 1941-1945-ci illər müharibəsi zamanı arxa cəbhədəki fədakar əməyinə görə bir sıra medallarla təltif edilmişdir.

Qurban müəllimin oğlu İlham Abbasov hazırda respublikanın ədliyyə sistemində çalışır. Müəllimlər İnstitutunda dərs deyir.

Bu gün də Qurban Abbasov onu tanıyanların yaddaşında «Qanun Qurban» kimi xatırlanır və yaşayır. Onun fədakar əməyi bugünkü gəncliyə də örnək ola bilər.

## Əməkdar müəllim – Aminə Babayeva



Aminə Cabbar qızı Babayeva 1914-cü ildə Şəki şəhərində anadan olub. O, Şəki İkiillik Müəllimlər İnstitutunun və Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Tarix fakültələrini bitirib. 10 saylı orta məktəbdə müəllim, Şəki rayon İcraiyyə Komitəsində sədr müavini işləyib.Azərbaycan SSR Ali Sovetinin deputatı seçilib. 1957-1967-ci illər ərzində Şəki Pedaqoji Məktəbinin direktoru olub. 1977-ci ildə Bakı şəhərində vəfat edib.

Hörmətli oxucu! Sizlərə təqdim olunan bu yazı 1957-1967-ci illərdə Şəki Pedaqoji Məktəbinə rəhbərlik etmiş, bu çətin, məsuliyyətli vəzifəni ləyaqətlə yerinə yetirən, Azərbaycanın «Əməkdar müəllimi» adına layiq görülən Aminə xanım Babayeva haqqındadır. Hələ gənc yaşlarından həyatın sərt sınaqları ilə üzləşən Aminə xanım bu çətin imtahanların hamısından şərəflə, üzüağ çıxmışdır. Böyük Vətən Müharibəsinin respublikamıza vurduğu zərbə Aminə xanımın da ailəsindən yan keçməmişdir. 29 yaşında (1943-cü ildə) həyat yoldaşı Məhəmməd Mustafayevi itirən gənc qadın iki körpə qızı ilə qardaşının himayəsində qalmışdır. Bu ağır zərbədən sarsılmayan Aminə xanım öz ömrünü gənclərin təlim-tərbiyəsi ilə məşğul olmağa həsr edir. Müharibənin qızğın vaxtlarında dərs dediyi şagirdlərdə qələbə əzmi tərbiyə etməyə çalışmışdır.

Azərbaycan Pedaqoji İnstitutunu bitirən Aminə müəllimə müəllimlik fəaliyyətini şəhər 10 saylı orta məktəbdə davam etdirir. Müharibədən sonrakı illərdə Aminə xanım





Şəki Rayon İcraiyyə Komitəsində sədr müavini işləmişdir. Aminə xanımın əməyinə verilən ən yüksək qiymət isə onun Azərbaycan SSR Ali Sovetinin deputatı seçilməsi idi.

İcra etdiyi hər iki vəzifə çətin və məsuliyyətli olsa da, Aminə xanımın yüksək intellekti, idarəetmə bacarığı ona imkan verirdi ki, bu şərəfli missiyanı ləyaqətlə yerinə yetirsin. Aminə xanım həmin illərdə xalqının böhrandan çıxarılması, ərzaq qıtlığının aradan qaldırılması üçün əlindən gələni etmişdir. Əzizlərini müharibə cəbhələrində itirənlərin yaxın köməkçisi, yaralı döyüşçülərin mənəvi dayağı olmuşdur.

1957-ci ildə Aminə Cabbar qızı Babayeva Şəki Pedaqoji Məktəbinə direktor təyin edilir.Onu da qeyd edək ki, Aminə müəllimə Şəki Pedaqoji Məktəbinə təyin edilən ilk qadın direktoru olmuşdur. Gənclərin, xüsusilə də qızların savadlanması həmin illərdə ən vacib dövlət proqramı idi.

İlk əvvəl savadlı müəllim kadrlarını Pedaqoji Məktəbə cəlb etməklə təhsilin keyfiyyətinin yüksəldilməsinə nail oldu və bu da tezliklə məktəbdə hazırlanan kadrların ideya-siyasi səviyyəsinin yüksəlməsinə səbəb oldu.

Aminə xanımın direktor təyin edilməsi Pedaqoji Məktəbdə yeni ab-hava yaratdı. Məktəbdə təhsil alan qızlar daim Aminə müəllimənin analıq qayğısını öz üzərlərində hiss edirdilər. Həmin illərdə təhsil alan tələbələr Aminə xanımın öz paltarlarını belə, tələbələrə bağışlaması faktını da söylədilər.

Beləliklə, kollektiv onun simasında bacarıqlı rəhbər, tələbələr qayğıkeş ana tapmışdılar. Pedaqoji Məktəbə rəhbərlik etdiyi müddətdə respublika rəhbərliyi tərəfindən yüksək fəxri ada – «Əməkdar müəllim» adına layiq görülmüşdür.

Aminə xanım ömrünün sonuna yaxın Bakıda yaşamış, 1977-ci ildə orada da dünyasını dəyişmişdir.

İki övladı – Elmira və Ofeliya hal-hazırda Bakı şəhərində yaşayır və analarının sənətini şərəflə davam etdirirlər.

Ömrünü bütövlüklə gənc nəslin təlim-tərbiyəsinə, elmin, maarifin inkişafına həsr etmiş Aminə müəllimənin ölümündən 33 il keçsə də, daima yad edilir, ən xoş duyğularla xatırlanır.





## Məmmədova Zinyət Cabbar qızı



1928-ci ildə Nuxa şəhərində anadan olub. Orta təhsilini başa vurduqdan sonra 1942-ci ildə Nuxa İkiillik Müəllimlər İnstitutunun Azərbaycan dili və ədəbiyyatı, sonra isə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU-nun) müvafiq fakültəsini bitirib. 1944-cü ildə Zinyət Məmmədova əmək fəaliyyətinə Şəki rayonunun Böyük Dəhnə kənd orta məktəbində müəllim kimi başlamış, 1946-cı ilə qədər burada çalışmışdır.

1948-1963-cü illərdə isə müəllimlik fəaliyyətini 11 nömrəli şəhər orta məktəbində davam etdirmişdir. Zinyət Məmmədovanın yaxşı işi şəhər ictimaiyyəti tərəfindən qiymətləndirilmiş, müxtəlif məsul vəzifələrə irəli çəkilmişdir. O, şəhər Komsomol Komitəsində bir sıra məsul işlərdə çalışmış, şöbə müdiri, birinci və ikinci katib vəzifələrində çalışmışdır. Bu illərdə Zinyət müəllimə gənclərlə işləmək qabiliyyəti, işgüzarlığı, təşəbbüskarlığı və bacarığı ilə böyük hörmət qazanır.

Zinyət Məmmədova bu illərdə həmçinin Azərbaycan Lenin Komsomol Cəmiyyətinin plenum üzvü olmuşdur.

1963-cü ildə Z.Məmmədova Şəki Tibb məktəbinə tədris işləri üzrə direktor müavini təyin edilir və 1967-ci ilə kimi bu vəzifədə çox uğurla çalışır. O, bu illərdə Rayon Birləşmiş xəstəxanasının partiya təşkilatı katibi vəzifəsində də çalışmışdır.

Bu illərdə o, özünü daha prinsipial mövqedən göstə-

rir, özünə və ətrafdakılara olan ciddi münasibəti ilə də ictimaiyyətin böyük hörmətini qazanır.

1967-ci ildə Zinyət Məmmədova daha məsul vəzifəyə – Şəki Pedaqoji Məktəbinə direktor vəzifəsinə təyin edilir. O, bütün var qüvvəsi ilə işə başlayır. Ancaq 1972-ci ildə Zinyət müəllimə öz ərizəsinə əsasən (heç kəsin gözləmədiyi halda) bu vəzifədən gedir. 1972-ci ildə o, şəhər 7 nömrəli orta məktəbə direktor müavini vəzifəsinə təyin olunur və müəllim kimi də fəaliyyətini davam etdirir.

Şəhər ictimaiyyəti arasında böyük hörmət və nüfuz sahibi olan Zinyət Məmmədova 1963-1972-ci illərdə Şəki Şəhər Qadınlar Şurasının sədri kimi də ictimai iş aparmışdır.

Zinyət Məmmədova səhhəti ilə əlaqədar 1990-cı ildən fəal əməkdən ayrılır və təqaüdə çıxır.





## Naibov Məmmədsadıx Yaqub oğlu



Naibov Məmmədsadıx Yaqub oğlu 1923-cü ildə Nuxada(Şəkidə) anadan olub. 11№li şəhər orta məktəbini bitirib. Orta məktəbdə oxuduğu illərdə ədəbiyyat və riyaziyyat fənlərinə böyük maraq göstərib. Bunun nəticəsi olaraq da Məmmədsadıx Naibov 1940-cı ildə Azərbaycan Dövlət Darülfününün (indiki Bakı Dövlət Universitetinin), Fizika-riyaziyyat fakultəsinə daxil olub. Lakin Böyük Vətən Müharibəsinin başlanması minlərlə gənc kimi onun da təhsilini yarımçıq qoyub. Vətəni qorumaq üçün cəbhəyə gedib. Digər həmyaşıdları kimi vətənin azadlığı üçün əlində silah, sinəsini düşmən gülləsinə sipər edib. Onun iki qardaşı da cəbhəyə yollanıblar. Məmmədsadığın böyük qardaşı Məmməd Naibov Krım uğrunda gedən döyüşlərdə qəhrəmancasına həlak olub. Ölümündən sonra Məmməd Sovet İttifaqı Qəhrəmanı kimi yüksək ada layiq görülüb. İkinci qardaşı Naib isə 1944-cü ildə ağır döyüşlərdən birində itkin düşüb.

Məmmədsadıx Naibov müharibənin sonuna qədər döyüşən orduda olub, Vətənin yüksək orden və medalları ilə təltif olunub. Müharibədən qayıtdıqdan sonra yenə oxumaq arzusunun arxasıyca Moskvaya gedib. 1947-ci ildə Məmmədsadıx Naibov Moskva Dövlət Universitetinin Riyaziyyat fakültəsinə daxil olub, ancaq üçüncü kursdan təhsilini Bakı Dövlət Universitetində davam etdirib.

1951-ci ildə universiteti müvəffəqiyyətlə bitirib və elə

həmin ildə də Nuxa Dövlət Müəllimlər İnstitutuna baş müəllim vəzifəsinə təyin edilib.

Məmmədsadıx Naibov Nuxa Dövlət Müəllimlər İnstitutu bağlandıqdan sonra şəhər 8 nömrəli rus məktəbində, sonralar isə 5 və 11 nömrəli orta məktəblərdə direktor işləyib.

1966-cı ildə Şəki şəhər Maarif şöbəsinə müdir təyin edilib. O, bu vəzifədə altı il səylə çalışıb.

1972-ci ildə Məmmədsadıx Naibov Şəki Pedaqoji Məktəbinə direktor vəzifəsinə irəli çəkilib. O, bu vəzifədə qısa bir müddətdə işlədi. Cəmi iki il. Ancaq müəllim və tələbələrin sevimlisinə çevrilə bildi.

1974-cü ildə vaxtsız ölüm onu əbədiyyətə qovuşdurdu.





## Süleymanov Cəmil Məmmədəmin oğlu



Cəmil Süleymanov 1927-ci ildə Şəki şəhərində anadan olub. 1945-ci tədris ilində Şəki Pedaqoji Məktəbini bitirib, elə həmin ildə də ali məktəbə daxil olub. Azərbaycan Dövlət Pedaqoji İnstitutunun – indiki Azərbaycan Pedaqoji Universitetinin Kimya-biologiya fakültəsini bitirib. Təhsil illərində ictimai fəallığı ilə seçilən Cəmil Süleymanov ali məktəbdə oxuduğu illərdə qrup həmkarlar təşkilatının sədri kimi ictimai iş aparıb.

1950-ci ildə Şuşa şəhərində 1№li uşaq evində tədris hissə müdiri işləməklə, orta məktəbdə də ixtisası üzrə dərs deyib.

23 avqust 1951-ci il tarixdən Şəki İpək kombinatının boyaq-bəzək istehsalatında kimyaçı mühəndis kimi işə qəbul olunub. 1951-54-cü illərdə boyaq- bəzək istehsalatı komsomol komitəsinin katibi işləyib. 1953-cü ildə Moskva şəhərində kimyaçıların təkmilləşməsi institutunda ixtisasartırma kursunda olub. Elə həmin ildə də Ipək kombinatının boyaq- bəzək sexinə rəis vəzifəsinə təyin olunub. 1959-cu ildə isə Şəki Yerli Sənaye Kombinatının boyaq-bəzək sexinə rəis təyin edilib. 1961-ci ildən həmin kombinatda baş mühəndis vəzifəsində çalışıb. İşlədiyi müddətdə dövlət plan və keyfiyyət tapşırıqlarını layiqincə yerinə yetirib.

1963-cüilədək sənaye müəssisələrində işlədiyi illərdə Şəki Toxuculuq Texnikumunda əvəzçilik üzrə müəllim işləyib.

1963-cü ildə isə Şəki Toxuculuq Texnikumuna direktor vəzifəsinə təyin olunub. 1974-cü ildən isə Şəki Toxuculuq Texnikumundan Şəki Pedaqoji Texnikumuna direktor vəzifəsinə köçürülüb.

1975-ci ildən 1981-ci ilədək Şəki şəhər XDS-nin deputatı olub.30 yanvar 1974-cü il tarixdə Azərbaycan Ali təhsil nazirliyi və respublika həmkarlar ittifaqı tərəfindən sosializm yarışının qalibi döş nişanı, 1980-ci ildə SSRİ Ali Təhsil Nazirliyinin 100 №li əmrinə əsasən Orta ixtisas təhsilində əla müvəffəqiyyətlərə görə döş nişanı və bir sıra hökumət və dövlət təltiflərinə layiq görülüb, əməyi yüksək qiymətləndirilmişdir.

1982-cı ildə Şəkidə vəfat etmişdir.





**İsmayılova Mədinə Mustafa qızı**



Mədinə İsmayılova 31 dekabr 1928-ci ildə Qəbələ rayonunun Beyli kəndində qulluqçu ailəsində anadan olub. O, ibtidai təhsilini Şəki şəhərindəki 10№li məktəbdə alıb,təhsilini şəhər 7№li məktəbdə başa çatdırıb. Sonra Şəki Pedaqoji Texnikumuna daxil olaraq 1945-ci ildə texnikumu bitirmişdir.

1945-ci ilin oktyabr ayının 1-dən 1946-cı il 1avqusta kimi Şəki 2№li uşaq evində tərbiyəçi işləmiş, 1946-cı ildən ali təhsil almaq üçün Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsinə daxil olmuş, 1951-ci ildə təhsilini başa vuraraq Şəki şəhərinə qayıtmış, şəhər 5 №-li məktəbində dil-ədəbiyyat müəllimi və müəllimlər evində müdir kimi işləmişdir. Ailə vəziyyəti ilə əlaqədar 1953-cü ildən 11№li orta məktəbə dil-ədəbiyyat müəllimi və tədris işləri üzrə direktor müavini təyin edilmişdir.

Mədinə İsmayılova 1956-cı ildən Şəki şəhər 12№li məkətəbə dil-ədəbiyyat müəllimi və tədris işləri üzrə direktor müavini təyin olunur.Səhhəti və ailə vəziyyəti ilə əlaqədar olaraq öz ərizəsinə əsasən 1958-ci ilin may ayından tədris işləri üzrə direktor müavini vəzifəsindən azad edilir və həmin məktəbdə dil-ədəbiyyat müəllimi kimi fəaliyyətini davam etdirir.

1969-cu ilin oktyabr ayının 21-dən Azərbaycan Maarif Nazirliyinin 1176№li əmrinə əsasən Şəkidəki 2№li uşaq evinə direktor təyin olunur. Çox keçmir ki, yəni 1971-ci ilin noyabr ayından həmin vəzifədən azad edilib Şəki Pe-

daqoji Texnikumuna tədris işləri üzrə direktor müavini vəzifəsinə təyin olunur.

1983-cü ilin fevral ayından isə Şəki Pedaqoji Texnikumunun direktoru vəzifəsinə təyin edilir və 1988-ci ilə qədər bu vəzifədə çalışır.

1965-ci ildən partiya sıralarına qəbul edilib.1967-ci ildə kütlələr arasında fəal təbliğatçılıq işi apardığı üçün Azərbaycan SSR Ali Sovetinin Fəxri fərmanı ilə təltif olunub.

1986-cı ildə «Əməkdə fərqlənməyə görə» medalı ilə təltif olunub. Bir neçə dəfə sosializm yarışının qalibi döş nişanı və bir sıra Fəxri fərmanlarla təltif edilmişdir.

Mədinə İsmayılova dörd övlad – iki oğul, iki qız böyüdüb. Onların hər birinə ali təhsil almaları üçün diqqət və qayğı göstərib.

1995-ci ildə vəfat edib.





## Şükürov Rafiq Şükür oğlu



1952-ci ildə Şəki rayonunun Aşağı Küngüt kəndində anadan olub. 1969-cu ildə indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin riyaziyyat fakültəsinə daxil olub. 1973-cü ildə həmin universiteti bitirərək Şəki rayonunun Baş Kəldək səkkizillik və Aşağı Küngüt orta məktəblərində riyaziyyat-fizika müəllimi işləyib.

1978-1983-cü illərdə Şəki rayonunun Aşağı Daşağıl kənd məktəbinin direktoru vəzifəsində çalışıb.

1983-1988-ci illərdə Şəki Pedaqoji Texnikumunun tədris işləri üzrə direktor müavini, 1988-ci ildən Şəki Məişət Xidməti Texnikumunun, 1993-cü ildən Şəki Texnologiya Texnikumunun direktoru işləyib. 1994-cü ildən Şəki Pedaqoji Texnikumunun direktorudur.

Rafiq Şükürov beş dərs vəsaitinin, 20-dən cox elmi məqalənin müəllifidir.

Respublika Müəllimlərinin I və II qurultaylarının nümayəndəsi olub.

Respublika Təhsil Şurasının üzvüdür.

Müxtəlif illərdə respublika Təhsil Nazirliyinin və Şəki Şəhər İcra Hakimiyyəti aparatının «Fəxri fərman»ları ilə təltif olunub.

Ailəlidir, üç övladı var.

## Özü-özünə müxalif

***«Təhsil dövlətin ən mühüm strateji xəttidir və bu onun gündəlik nəzarətindədir»***

**- Rafiq müəllim, söhbətimizə nədən başlayaq?**

- Hardan istəsəniz, ordan da başlaya bilərik.

**- Elə isə, növbəti dərs ilini pedaqoji kollektiv hansı uğurlarla başa vurur? Ümumiyyətlə, başa vurmaqda olduğumuz dərs ilini necə xarakterizə edərdiniz?**

- Başa vurmaqda olduğumuz tədris ili, şəxsən mənim üçün əvvəlki tədris illərindən xeyli dərəcədə fərqlənir. Bunun da bir neçə səbəbi var. Bu il bizdə dərs ilinə hazırlığın vəziyyəti ilin əvvəlindən yüksək olub. Bütün yay müddətində biz başa vurmaqda olduğumuz dərs ilinə hazırlaşmışıq. Maddi-texniki bazanı möhkəmlətdik, kabinet laboratoriyaları zənginləşdirdik, tikinti-təmir və bərpa işlərini gücləndirdik. Ən ümdəsi odur ki, gənc kadrları işə qəbul etdik, müəllim kontingenti formalaşdı. Əvvəlki illərdə bizə problem olan bəzi kadr məsələlərini həll etdik. Məsələn, ingilis dili müəllimləri dəvət etdik, müəllimlərin bir neçəsinin ixtisasını dəyişməyə şərait yaratdıq, müəyyən kurslardan keçməsini təmin etdik. Digər tərəfdən, cari dərs ilində ümumilikdə texnikumda demokratik dəyərlərə geniş meydan verildi. Tələbə özünüidarəsini gücləndirdik, tələbə təşkilatları sözün tam mənasında texnikumun qaynar həyatına daxil oldu, onların nüfuz dairəsi genişləndi. Onu da əlavə edim ki, direktor kimi heç bir bölmə rəhbərinin, müəllimin fəaliyyətini məhdudlaşdıran tədbirlərə yol verməmişəm. Bütün bu görülən tədbirlərin nəticəsi olaraq bu dərs ilində texnikumda təlimin keyfiyyəti yüksəlib. «4» və «5» qiymətlərlə oxuyan tələbələrimizin sayı artıb. Ən





ümdəsi də odur ki, dövlətin bizim qarşımızda qoyduğu vəzifələri, texnikum pedaqoji şurasının dərs ilinin əvvəlində planlaşdırdığı vəzifələrin həlli istiqamətində xeyli işlər görülüb.

**- Şəki Pedaqoji Texnikumu respublikamızda fəaliyyət göstərən texnikumlar sırasında yaranma tarixinə görə birincilərdən olmaqla, öz dəst-xətti olan, şərəfli tarixi yol keçmiş, şöhrətli bir texnikumdur. Sizin pedaqoji fəaliyyətinizin böyük bir hissəsi də bu texnikumun tarixi ilə bağlıdır. Şəxsiyyətləri tarix yaratdığı kimi, şəxsiyyətlər də tarix yaradır. Siz bu gündən geriyə boylanaraq Şəki Pedaqoji Texnikumunun şanlı tarixi haqqında ilk öncə nələri söyləyərdiniz?**

- Bu texnikum haqqında mənim öz şəxsi fikrim var. Mən hələ şagird olanda bu texnikum haqqında xoş sözlər eşidirdim və buna qibtə edirdim. Buraya işə gələndən sonra da səhv etmədiyim qanaətindəyəm. Şəki Pedaqoji Texnikumu 20-ci əsrin birinci rübündə yaranan texnikumdur. Böyük tarixi keçmişi, ənənələri var. İstər kadr hazırlığı sahəsində, istər dövlətçilik sahəsində apardığı işlərdə və digər sahələrdə. Bu texnikum təkcə Şəki şəhəri və rayonu üçün deyil, ölkəmizin şimal bölgəsi üçün, hətta sovetlər dönəmində qonşu respublikaların azərbaycanlılar yaşayan bölgələri üçün də müəllim kadrları hazırlayıb. Bu mənada bu texnikumun coğrafi mövqeyi, kadr hazırlığı həmişə diqqət mərkəzində olub. Digər tərəfdən burada həmişə nüfuzlu, bölgədə tanınan insanlar işləyiblər. Ölkəmizdə bu təmayüldə bir neçə texnikum var. Məsələn, Bakıda, Gəncədə, Lənkəranda, Şirvanda, Astarada və s. Çox gözəl tədris binası olan məktəblərimiz də var. Ancaq onların elələri var ki, idman zalı, idman meydançası, kitabxanası, zəngin fənn kabinə və loboratoriyaları, atıcılıq

tiri yoxdur, baza müəssisələri çatışmır. Şəki Pedaqoji Texnikumu müstəsna texnikumlardan biridir ki, dediklərimin hamısına malikdir – həm maddi-texniki bazası, həm baza müəssisələri var, 30 minə yaxın kitab fondu olan (onlardan 10 mindən çoxu dərslik və dərs vəsaitidir) kitabxanası, idman zalı və idman meydançası, böyük və kiçik iclas zalları, iki tələbə kafesi, nəhayətdə, güclü kadr korpusu var. Təcrübi məşğələləri aparmaq üçün təkcə Şəki şəhərində 20-dən çox orta məktəb var və s.

Bir sözlə, Şəki Pedaqoji Texnikumunun məzunlarını ictimaiyyət qəbul edirsə, bu gün onlar iş yerləri ilə təmin edilirsə, ünvanımıza məzunlarımızın yaxşı işləri haqqında çoxlu sayda məktublar gəlirsə, deməli, Şəki Pedaqoji Texnikumunun kollektivi onların qarşısında qoyulmuş vəzifələrin öhdəsindən gəlir. Məncə, ictimaiyyətin rəyi əsas olmalıdır.

**- İndi texnikum həyatının ən qaynar çağıdır desəm, yanılmaram: semestr imtahanları, Dövlət imtahanları, məzunların təyinat bölgüsü, başa çatmaqda olan dərs ilinin yekunlaşdırılması, yeni dərs ilinə hazırlıq, şəhər həyatı, ailə qayğıları, bir tərəfdən də yayın istiləri. Bütün bunları həyata keçirmək sizin üçün çətin deyil ki?**

- Düzünü desəm, çətindir. 1973-cü ildən pedaqoji fəaliyyətdəyəm. Pedaqoji fəaliyyətimin 32 ilinin 29 ilini də direktor müavini və direktor kimi fəaliyyət göstərirəm. İstər təhsil aldığım illərdə, istərsə də pedaqoji fəaliyyətimin dövründə bir çox maarifçiliklə, təhsillə bağlı islahatların iştirakçısı olmuşam. Ancaq bu gün də islahatlara böyük ehtiyac var. Tədris müddəti 9 ayı əhatə edir. Sovetlər dövründə 2 ayı kənd təsərrüfatı işləri ilə məşğul olurduq. Sonra da tədris proqramlarında sıxlaşmalar aparılırdı. Ağırlıq mərkəzi də düşürdü beş-altı aya. İndi də bunun bir hissəsini tələbə qəbulu ilə məşğuluq. Yeni komplektləşmə





oktyabr ayına qədər davam edir. Hazırda texnikumda beş komissiya fəaliyyət göstərir və mənim fikrimcə, komissiyaların çoxluğu hələ işlərin keyfiyyətindən xəbər vermir. Yenə də 9 aylıq işlərin ağırlıq yükünün doqquzda dörd hissəsi may-iyun aylarına düşür. Bax, bu mənada da çətinliklər var.

**- Texnikumda həm orta təhsil bazasından (11 illik), həm də əsas təhsil bazasından (9 illik) tələbə qəbulu aparılır. Keyfiyyətcə onları necə dəyərləndirmək olar? Ümumiyyətlə, 11-ci sinfi qurtaran məzunların əsas təhsil bazasından (9 illik) sənəd verməlarinə münasibətinizi bilmək istərdik.**

- Tələbə qəbulu dövlətin nəzarətindədir və təhsil dövlətin strateji sahələrindən biridir. Tələbə qəbulunun test üsulu ilə aparılmasına da çox müsbət bir hal kimi baxıram, bunu ictimaiyyət də qəbul edir. Ancaq bu proses təkmilləşdirilməlidir. Tələbə qəbul olunur, ancaq qeydiyyata gəlmir. Bəzən də qeydiyyata düşür, sonra oxumaqdan imtina edir. Tələbə qəbulunda ikipilləliyin də əleyhinəyəm. Necə ola bilər ki, birinci mərhələdə qəbul yerlərini doldurmaq olmasın? Elə ötən il 90 min abituryentdən 27 min tələbəni seçmək olmazdı? İkinci bir tərəfdən texnikumlara qəbul olunmaq istəyən abituriyentlərin qəbul imtahanlarında iştirak etmədiklərindən hüquqları pozulur. Ona görə ki, az bal toplayıb ali məktəblərə qəbul oluna bilməyən abituriyentlərlə texnikumlarda qəbul yerləri doldurulur, boş yerlər qalmır və formal olaraq orta təhsil bazasında texnikumlara qəbul imtahanları aparırlar. Burada da müəyyən hədd gözlənilməlidir. Digər tərəfdən yazı savadı aşağı olan, nitqi qüsurlu, təfəkkürü zəif inkişaf etmiş abituriyentlər də pedaqoji təmayüllü ixtisaslara qəbul olunurlar. Onlardan necə yüksək keyfiyyətli kadr hazırlamaq olar? Bu və ya digər səbəbdən də tələbə qəbulunun təkmilləşdi-

rilməsinə ehtiyac var və bu proses gedir. Qaldı sualınızın ikinci hissəsinə, orta təhsil bazasını bitirib əsas təhsil bazasından sənəd vermək istəyənlərə də pis baxmıram. Hərə öz qabiliyyətini bilir. Ancaq dövlətin mənafeləri üstün tutulmalıdır. Ona görə də məhdudiyyətlərin qoyulmasını düzgün hesab edirəm. Ancaq onların da hüquqlarına hörmətlə yanaşılmalıdır.

**- Ödənişli əsaslarla təhsil alan tələbələrdən təhsil xərclərinin yığılmasında çətinliklər yoxdur ki? Bir qədər də açıqlasaq, təhsil xərcləri yüksək deyil ki?**

- Ümumiyyətlə bu sahədə problemlər var. Abituriyent özünü yoxlamaq üçün ərizəsində ödənişli yerləri də qeyd edir. Qəbul olunduqdan sonra isə əl-ayağa düşür. Valideynlərin də maddi imkanı buna çatmır. Ancaq bizdə illik təhsil xərci 400-600-manat həddindədir. Müqayisə üçün deyim ki, Azərbaycanda fəaliyyət göstərən özəl Türk liseylərində illik təhsil xərci 2500 ABŞ dolları həcmindədir. Bütün bunlara baxmayaraq çoxlu sayda çətinliklərlə üzləşirik. Ancaq bu problemlərin də həlli yolları var və bunu dövlət səviyyəsində həll etmək lazımdır. Dünyanın bir sıra ölkələrində ödənişli əsaslarla oxuyan tələbələr üçün kreditlər verən banklar var. Belə tələbələr kredit götürərək təhsil xərclərini ödəyərək, normal təhsil alırlar, sonra onlar işlədikcə faizsiz həmin kreditləri banklara qaytarırlar. Bizdə də buna getmək lazımdır. Məndə olan məlumata görə artıq bu istiqamətdə ölkəmizdə də hazırlıq işləri aparılır.

**- Rafiq müəllim, Siz texnikuma müəllim və işçiləri hansı prinsiplə, hansı keyfiyyətlərinə görə işə qəbul edirsiniz? Ümumiyyətlə, deyirlər ki, pedaqoji texnikumda işgüzar bir kollektiv formalaşıb. Siz müəllimlərinizdən doğrudanmı razısınız? Cari dərs ilində hər hansı kadr islahatı gözlənilirmi?**




- İctimaiyyətə, hamıya bəlli olan bir məsələni bildirim. Harada təmizlik var, orada işləmək çox rahatdır. Biz də kadrları seçim yolu ilə, tam şəffaf aparırıq. Boş yerləri tutmaq üçün elanlar veririk, sənədlər qəbul olunur, kadrların iş keyfiyyətləri öyrənilir və kollegial yolla bu məsələni həll edirik. Ələbaxımlıq haqqında söhbət gedə bilməz. Belə olsa, işləmək çətin olar. Deyim ki, işə qəbul zamanı yüksək intellektə malik, peşəsinə vurğun adamlara və gənclərə daha çox üstünlük veririrk. Mən pedaqoji kollektivin işindən də razıyam. Ancaq cəmiyyət inkişaf edir, bu baxımdan yeni təfəkkürlü kadrların irəli çəkilməsinə, kadr islahatına da ehtiyac var. Biz bu işi ardıcıl aparmışıq, bundan sonra da bu islahatları aparacağıq. Bu, günün tələbidir. Bəli, kadr islahatları da gözlənilləndir. İndi gənclərə daha geniş meydan verilməlidir.

**- Müəllim və tələbələriniz öz hüquqlarını bilirlərmi? Texnikumda hüquqi biliklərin təbliği nə vəziyyətdədir?**

- Mən ümumiyyətlə geniş təbliğat və təşviqat işinin tərəfdarıyam və vətəndaş hüquqlarının təbliği də fəaliyyətimizin tərkib hissələrindən biridir. Biz bu sahədə qlobal, düşünülmüş və ardıcıl tədbirlər həyata keçiririk. Dərsdənkənar tədbirlərə, rəğbətləndirməyə geniş yer veririk. Maarifləndirmə sahəsində «Təhsil uğrunda» qəzetinin, texnikumun radio qovşağının bu sahədəki işini yüksək dəyərləndirirəm. Şəhər hüquq mühafizə orqanları ilə əməkdaşlığımız, onların rəhbərləri və nümayəndələrinin iştirakı ilə keçirilən tədbirlər, görüşlər hüquqi biliklərin genişləndirilməsində bizim böyük yardımçımızdır. İstər müəllim olsun, istər tələbə olsun, öz hüquq və vəzifələrini bilmədən necə fəaliyyət göstərə bilər? Mən bu sahədəki işimizi də müsbət qiymətləndirirəm.

**- Yeniləşən cəmiyyətdə yeni təhsil qanununa ciddi ehtiyac var. Ancaq yeni «Təhsil haqqında qanun» Milli**

**Məclisdə ilişib qalıb. Elə bu səbəbdən də cəmiyyətdə təhsillə bağlı müxtəlif fikirlər səslənir. Sizin bu məsələlərə münasibətiniz necədir?**

- Ölkəmiz müstəqillik əldə edəndən sonra çox böyük inkişafın olduğu göz qabağındadır. Baxmayaraq ki, biz keçid dövründə yaşayırıq. Bu gün təhsilimiz də öz keçid dövrünü yaşayır. Bu gün tələbatdan çox kadr hazırlanır. Ancaq bundan qorxmaq lazım deyil. Vaxt, zaman, şərait özü hər şeyi tənzimləyir. «Təhsil qanunu»nun qəbul edilməsinin gecikməsini də facıə kimi qəbul etmək lazım deyil. Gec qəbul olunsun, ancaq işlək qanun qəbul edilsin. Gecikmə o qədər də qorxulu deyil, təki ictimaiyyət tərəfindən qəbul edilən qanun qəbul edilsin, onun bütün müddəaları işləsin, kağız üzərində qalmasın. Mən deyim ki, bu gün respublikamızda təhsilin səviyyəsi qənaətbəxş bir səviyyədədir. Onun keyfiyyətcə yüksəlməsi, qabaqcıl ölkələrin təhsilinə inteqrasiya olması istiqamətində Təhsil Nazirliyi çox işlər görür. Ancaq təhsildən, onun problemlərindən xəbərsiz bir para adamların populist çıxışları təhsilimizi gözdən salmağa yönəlib. Təhsil problemləri meydanlarda, küçələrdə, qəzet səhifələrində və «mən də varam» prizmasından söz demək xatirinə edilən çıxışlarda həll edilmir. Beləlləri faydalı bir işlə, heç olmazsa, öz işləri ilə məşğul olsalar, daha yaxşıdır.

**- Bu gün siz böyük bir kollektiv başçısı kimi işinizdən razısınızmı və müəllim kimi Rafiq müəllim öz peşəsindən zövq alırmı?**

- Mən həmişə fəxr edirəm ki, müəllim kadrları hazırlayan bir müəssisədə işləyirəm və onun rəhbəriyəm. Bu, ikiqat şərəflidir, bölgədə bu müəssisənin yeganə olması, ictimaiyyətin diqqət mərkəzində olması, işimizi təhlil edib, qiymətləndirilməsi və s. bizim məsuliyyətimizi ikiqat artırır. Bizim pis işləməyə haqqımız yoxdur. Şükürlər olsun





ki, işimizə də yaxşı qiymət verirlər. Mən bu gün bir çox arzularıma çatmışam: indi bizim müəllimlər proqramlar yazır, dərs vəsaitləri, kitablar çap elətdirir, çətin də olsa qəzet buraxırıq. Bütün bunlar mənə ruh verir və mən öz peşəmdən zövq alır, görülən işlərdən qürurlanıram. Bacım da, həyat yoldaşım da müəllimədir. Müəllimliyi də şərəf işi hesab edirəm.

**- Sizin üçün ədalət meyarı nədir? Niyə Şəkidə Sizi «Küngütlü Şükür kişinin oğlu Rafiq müəllim», – deyə çağırırlar? Özünüzə qarşı ədalətsizlik hiss edirsinizmi?**

- Ədalət anlayışı şərtidir və mücərrəd anlayışdır. Müqayisədə deyirlər ki,, filankəs nisbətən yaxşı adamdır, ədalətlidir. Ümumiyyətlə, adam öz vicdanının səsi ilə işləyəndə, seçimi düzgün edəndə, düzgün qərarlar qəbul edəndə rahat yatır, rahat gəzir, ictimaiyyət arasında görünməkdən çəkinmir. Mən həmişə çalışmışam ki, müəllim də, tələbə də öz direktoruna inansın. Buna nə qədər nail olmuşam, qarşı tərəf söyləyə bilər. Sualınızın o biri hissəsinə cavab verim ki, biz ailədə beş uşaq olmuşuq. Atam sadə əmək adamı olub. Ancaq ailəsində, qohum və qonşulara, bütün adamlara qarşı diqqətli, insanın halına yanan olub. Məsələn, kasıb yaşasaq da, beş uşağına da atam ali təhsil verib, həmişə kimsəsizlərə əl tutub. Şükür kişinin oğlu kimi çağrılmağım da yəqin ki, buradan qaynaqlanır və mən bununla fəxr edirəm. Özümə qarşı ədalətsizlik məsələsini açıb-ağartmaq istəmirəm.

**- 85 yaşını qeyd edəcəyimiz bir texnikumun müəllimlərindən heç birinin fəxri adı yoxdur. Siz Təhsil Nazirliyinin başçılıq etdiyiniz kollektivə qarşı bu sahədə ədalətsizliyini hiss eləmirsiz ki?**

- Mən başqa cür fikirləşirəm. Əgər hardasa biz bunu edə bilməmişiksə, mən səmimiyyətlə deyirəm, bu bizim günahımızdır. Kimisə inandıra bilməmişik, kiməsə fəaliy-

yətimizi təqdim edə bilməmişik. Biz bəzən yaxşı işlərimizi də təqdim etmirik və yaxud az təqdim edirik. Özümüzü təbliğ etmirik. Mən burada Təhsil Nazirliyində də, yerli icra hakimiyyətində də günah görmürəm. Əgər biz bu sahədə iş aparsaydıq, bu gün nəticəsi göz qabağında olardı. Texnikumumuzun 85 illik yubileyi də qeyd ediləcək. Ancaq biz bu tədbirləri yubiley tədbirləri kimi yox, Azərbaycanda pedaqoji təhsilin şanlı bir tarixi kimi sərgiləyəcəyik. Elə düşünürəm ki, onda bu məsələlər də öz həllini tapacaq.

**- Bu gün istehlak bazarında adambaşına bazar səbəti 194 manatla ölçülür. Qazın, suyun, enerji daşıyıcılarının və kommunal xərclərinin də bir neçə dəfə artdığı bir vaxtda müəllimlərin dolanışığı necədir? Rafiq müəllim bir kollektiv rəhbəri kimi bu barədə düşünürmü?**

- Düşünmək azdır, mən bununla yaşayıram. Hər gün düşünürəm ki, müəllimlərin maaşını necə artırmaq olar. Deyim ki, məndən əvvəl ölkə başçısı, təhsil nazirliyi hər gün bu barədə düşünür və ardıcıl olaraq müvafiq addımlar da atılır. Ancaq yenə də bunlar kifayət etmir, tələb təklifi üstələyir. Biz də öz tərəfimizdən bu məsələlərə qayğı ilə yanaşırıq. Hər bir müəllimi kifayət qədər dərs yükü ilə təmin edirik ki, çox maaş alsın. Hər bir müəllim və işçiyə büdcədən kənar vəsaitlərdən əlavə əmək haqqı veririk, onların əməyini ildə bir neçə dəfə mükafatlar şəklində dəyərləndiririk. Yəni, əlimizdən nə gəlirsə, onu da edirik. Bəli, bu gün müəllim əməyinə verilən qiymət onun zəhməti müqabilində deyil və heç bir dövrdə də kifayət qədər olmayıb. Ancaq mən bir şeyi bilirəm ki, müəllim həmişə orta səviyyədə yaşayıb və bu gün də belə yaşayır. Bir həqiqəti də deyim ki, əmək haqqından asılı olmayaraq müəllimlik peşəsinə ürəkdən bağlı olan adamlar yaxşı işləyib, bu gün də yaxşı işləyirlər. Bir sözlə, əsl müəllim müəllimlik peşəsində qulluq göstərir, əmək haqqının yedəyində getmir. Təcrübəmə əsasən bir şeyi də qeyd edim ki, savadlı adamlarla işləmək daha rahatdır. Onlar son anda etiraz bildirir, yenə öz işinin dalısıyca gedir. Ancaq ən çətini savadsız adamla işləməkdir. Var, yox, başa düşmək istəmir, dediyini deyib durur, təkid edir, savadsız hərəkətlərə yol verir.



İşıq məbədi

**- Həm də sizi özü-özünə müxalif kimi də dəyərləndirirlər. Bəlkə, bu məsələyə də aydınlıq gətirəsiniz?**

- Bəzən adam öz içində düşündüyünü həyatda tətbiq edə bilmir. Ya mövcud şərait buna imkan vermir, ya da digər obyektiv və subyektiv səbəblər buna mane olur. Tez-tez düşünürəm ki, mən bu işi belə etməliydim, bəs niyə belə oldu, niyə bunu gec elədim? Mən bəzən düşündüklərimin hamısını edə bilmirəm. Düşüncələrimlə bəzən icra etdiyim işlər üst-üstə düşmür. Ancaq kollektiv məni belə də qəbul edir, dəstəkləyir, köməklik göstərir.Ona görə də pedaqoji kollektivimdən çox razıyam. Elə bu və ya digər səbəblərdən də kollektiv məni özü-özünə qarşı müxalif adlandırır. Tənqidi də sevirəm. Ancaq ən böyük tənqidçim də elə özüməm. Bunu niyə eləmədim, bunu niyə belə elədim, belə etsəydim daha yaxşı olardı və s. Bütün bunlara görə də özüm-özümə qarşı müxalifətdəyəm. Bax, bu da mənim gündəlik fəaliyyətimə öz təsirini göstərir.

**- Gələcək planlarınız haqqında oxucularımıza nələri deyərdiniz?**

- Gələcək planlarımız çoxdur. Birinci növbədə çalışacağam ki, daha yaxşı işləyək və bunun üçün indi hər cür şərait var. Bizə də böyük etimad göstərilir. Bu etimadı doğrultmalıyıq. İkincisi, mənim atam həmişə deyərdi ki, dövlət yanında, ailə qarşısında başıaşağı olma. Bunların üçünü də uyğunlaşdırmağı başlıca vəzifə hesab edirəm.

**- Rafiq müəllim mənim ona ünvanlamadığım hansı sualı özü cavablandırmaq istəyərdi?**

- Yəni, yerimizi dəyişsək, sən hansı sualı verərdin?

**- Mən sual verərdim ki, siz bu texnikumda müəllim işləsəydiniz, bu gün Rafiq müəllimi direktor kimi qəbul edərdinizmi?**

- Bəli, mən qəbul edərdim və ikiəlli dəstəkləyərdim.

**- Yox, mən özüm-özümə belə sual verərdim.**

- Hə, aydındır, buyurun.

**- Yəni, Rafiq müəllim, təsəvvür edin ki, siz bu gün müəllim işləyirsiniz və sizə seçim imkanı verilib. Siz indiki direktor Rafiq müəllimə dəstək verərdinizmi?**

- Mən belə də cavab verərdim. Bəzi xarakterlərini dəyişmək şərti ilə dəstək verərdim. Bəzən daha ciddi olmaq lazımdır. Lazım gələndə uzun illərdə yaranmış münasibətlər qəbul edəcəyin qərarlara əngəl olmamalıdır. Qəbul etdiyin qərarlarda qətiyyətli olmaq lazımdır.

- Deyəsən, sizi çox yordum.

- Yox, mən hələ yorğunluq hiss etmirəm.

- Onda, növbəti görüşə qədər. Müsahibə üçün çox sağ olun.

- Siz də sağ olun!

*Müsahibə Şəki Pedaqoji Texnikumunun «Təhsil uğrunda» qəzetinin 25 iyun 2005-ci il tarixli 6-cı nömrəsindən götürülmüşdür.*

***PS:** Biz texnukumda işləyən bəzi direktorlar haqqında qısa müddətdə geniş məlumat toplaya bilmədik. Ancaq inanırıq ki, ikinci kitabda onların hamısı haqqında oxucularımıza daha geniş məlumat verə biləcəyik.*





# VI bölmə

## Şəki Pedaqoji Texnikumunu ayrı-ayrı tədris illərində bitirən məzunlar haqqında

| | | |
|---|---|---|
| 1. | 1924-1925-ci tədris ilində | – 22 nəfər |
| 2. | 1925-1926-cı tədris ilində | – 36 nəfər |
| 3. | 1926-1927-ci tədris ilində | – 35 nəfər |
| 4. | 1927-1928-ci tədris ilində | – 45 nəfər |
| 5- | 1928-1929-cu tədris ilində | – 72 nəfər |
| 6. | 1929-1930-cu tədris ilində | – 60 nəfər |
| 7. | 1930-1931-ci tədris ilində | – 64 nəfər |
| 8. | 1931-1932-ci tədris ilində | – 68 nəfər |
| 9. | 1932-1933-cü tədris ilində | – 62 nəfər |
| 10. | 1933-1934-cü tədris ilində | – 45 nəfər |
| 11. | 1934-1935-ci tədris ilində | – 55 nəfər |
| 12. | 1935-1936-cı tədris ilində | – 66 nəfər |
| 13. | 1936-1937-ci tədris ilində | – 64 nəfər |
| 14. | 1937-1938-ci tədris ilində | – 73 nəfər |
| 15. | 1938-1939-cu tədris ilində | – 92 nəfər |
| 16. | 1939-1940-cı tədris ilində | – 163 nəfər |

| | | |
|---|---|---|
| 17. | 1940-1941-cı tədris ilində | – 185 nəfər |
| 18. | 1941-1942-ci tədris ilində | – 55 nəfər |
| 19. | 1942-1943-cü tədris ilində | – 36 nəfər |
| 20. | 1943-1944-cü tədris ilində | – 33 nəfər |
| 21. | 1944-1945-ci tədris ilində | – 75 nəfər |
| 22. | 1945-1946-cı tədris ilində | – 90 nəfər |
| 23. | 1946-1947-ci tədris ilində | – 77 nəfər |
| 24. | 1947-1948-ci tədris ilndə | – buraxılış olmayıb |
| 25. | 1948-1949-cu tədris ilində | – 76 nəfər |
| 26. | 1949-1950-ci tədris ilində | – 80 nəfər |
| 27. | 1950-1951-ci tədris ilində | – 56 nəfər |
| 28. | 1951-1952-ci tədris ilində | – 27 nəfər |
| 29. | 1952-1953-cü tədris ilində | – 33 nəfər |
| 30. | 1953-1954-cü tədris ilində | – 43 nəfər |
| 31. | 1954-1955-ci tədris ilində | – 50 nəfər |
| 32. | 1955-1956-cı tədris ilində | – 80 nəfər |
| 33. | 1956-1957-ci tədris ilində | – 60 nəfər |
| 34. | 1957-1958-ci tədris ilində | – 27 nəfər |
| 35. | 1958-1959-cu tədris ilində | – 87 nəfər |
| 36. | 1959-1960-cı tədris ilində | – 58 nəfər |
| 37. | 1960-1961-ci tədris ilində | – 60 nəfər |
| 38. | 1961-1962-ci tədris ilində | – 68 nəfər |
| 39. | 1962-1963-cü tədris ilində | – 87 nəfər |
| 40. | 1963-1964-cü tədris ilində | – 89 nəfər |
| 41. | 1964-1965-ci tədris ilində | – 20 nəfər |





| | | |
|---|---|---|
| 42. | 1965-1966-cı tədris ilində | – 98 nəfər |
| 43. | 1966-1967-ci tədris ilində | – 140 nəfər |
| 44. | 1967-1968-ci tədris ilində | – 175 nəfər |
| 45. | 1968-1969-cu tədris ilində | – 184 nəfər |
| 46. | 1969-1970-ci tədris ilində | – 179 nəfər |
| 47. | 1970-1971-ci tədris ilində | – 186 nəfər |
| 48. | 1971-1972-ci tədris ilində | – 199 nəfər |
| 49. | 1972-1973-cü tədris ilində | – 98 nəfər |
| 50. | 1973-1974-cü tədris ilində | – 60 nəfər |
| 51. | 1974-1975-ci tədris ilində | – 117 nəfər |
| 52. | 1975-1976-cı tədris ilində | – 111 nəfər |
| 53. | 1976-1977-ci tədris ilində | – 187 nəfər |
| 54. | 1977-1978-ci tədris ilində | – 165 nəfər |
| 55. | 1978-1979-cu tədris ilində | – 249 nəfər |
| 56. | 1979-1980-ci tədris ilində | – 214 nəfər |
| 57. | 1980-1981-ci tədris ilində | – 156 nəfər |
| 58. | 1982-1983-cü tədris ilində | – 189 nəfər |
| 59. | 1983-1984-cü tədris ilində | – 208 nəfər |
| 60. | 1984-1985-ci tədris ilində | – 240 nəfər |
| 61. | 1985-1986-cı tədris ilində | – 240 nəfər |
| 62. | 1986-1987-ci tədris ilində | – 209 nəfər |
| 63. | 1987-1988-ci tədris ilində | – 182 nəfər |
| 64. | 1988-1989-cu tədris ilində | – 207 nəfər |
| 65. | 1989-1990-cı tədris ilində | – 150 nəfər |
| 66. | 1990-1991-ci tədris ilində | – 83 nəfər |

| | | |
|---|---|---|
| 67. | 1991-1992-ci tədris ilində | – 25 nəfər |
| 68. | 1992-1993-cü tədris ilində | – 26 nəfər |
| 69. | 1993-1994-cü tədris ilində | – 69 nəfər |
| 70. | 1994-1995-ci tədris ilində | – 103 nəfər |
| 71. | 1995-1996-cı tədris ilində | – buraxılış olmayıb |
| 72. | 1996-1997-ci tədris ilində | – buraxılış olmayıb |
| 73. | 1997-1998-ci tədris ilində | – buraxılış olmayıb |
| 74. | 1998-1999-cu tədris ilində | – 115 nəfər |
| 75. | 1999-2000-ci tədris ilində | – 193 nəfər |
| 76. | 2000-2001-ci tədris ilində | – 324 nəfər |
| 77. | 2001-2002-ci tədris ilində | – 279 nəfər |
| 78. | 2002-2003-cü tədris ilində | – 482 nəfər |
| 79. | 2003-2004-cü tədris ilində | – 419 nəfər |
| 80. | 2004-2005-ci tədris ilində | – 382 nəfər |
| 81. | 2005-2006-cı tədris ilində | – 377 nəfər |
| 82. | 2006-2007-ci tədris ilində | – 279 nəfər |
| 83. | 2007-2008-ci tədris ilində | – 262 nəfər |
| 84. | 2008-2009-cu tədris ilində | – 244 nəfər |
| 85. | 2009-2010-cu tədris ilində | – 294 nəfər |





# VII bölmə

## Müxtəlif illərdə Şəki Pedaqoji Texnikumunda fəaliyyət göstərmiş müəllimlər haqqında

### 1920-1928-ci illər arası işləyənlər

1. Rəcəb Əfəndiyev
2. Ələşrəf Hacızadə
3. Məmmədəli Xəlfəzadə
4. Əhməd Bayramzadə
5. Əbdürrəşid Əfəndiyev
6. Mahmud Bayramzadə
7. Nəsirbəy
8. Məmməd Mədətzadə
9. Baba Qabulov
10. Fyodorov
11. Əhməd Nəbiyev
12. Xanım Mahmudova
13. Mahtaban Əfəndiyeva
14. Südabəxanım

### 1929-cu ildə işləyənlər

1. Musa Hacızadə - Ədəbiyyat
2. İsmayıl Vəlicanov - Ədəbiyyat
3. Əhməd Əbdürrəhmanlı - Riyaziyyat
4. Mustafa Cabbarlı - Fizika
5. Ziya Əfəndizadə - Riyaziyyat
6. Əbdürrəhman Bilallı - Rəsm

7. Əli Əlibəyov – Coğrafiya-ictimaiyyat
8. Məmməd Məmmədov - İctimaiyyat
9. Seyfulla Hüseyn – Kimya-biologiya
10. Hüseyn Məhəmmədzadə - Coğrafiya
11. Ədhəm Mustafazadə - Nabatat- gigiyena
12. Qaracanov - Hərbi dərs
13. Nataşa - Əl işi
14. Uşolnaninov - Dülgərlik
15. Bəxtiyar Rzayev - İdman
16. Ələkbər Ələkbərov - İdman
17. Şıxlinski - İdman
18. Abdulla Paşabəyov - Rus dili
19. Maliçenski Pyotr - Rus dili

## 1930-cu ildə işləyənlər

1. Talıbzadə - Türk dili
2. Saleh Məmmədzadə - Türk dili
3. Maliçenski Pyotr - Rus dili
4. Abdulla Paşabəyov - Təcrübə dərsləri
5. Əhməd Əbdürrəhmanlı - Riyaziyyat
6. Əli Şahməmmədov - Fizika və riyaziyyat
7. Zahid Cabbarlı - İctimaiyyat
8. İsmayıl Vəlicanov - İctimaiyyat və iqtisadi coğrafiya
9. Məhərrəm Qarayev - İctimaiyyat
10. Həşim Məmmədzadə - Pedaqogika
11. Ədhəm Mustafazadə - Kimya-anatomiya
12. Həmid - Zoologiya, gigiyena, coğrafiya
13. Səfərbəyov - Kənd təsərrüfatı
14. Sumolyanov - Dülgərlik





15. Nataşa - Əl işi
16. Ələkbər Ələkbərov - İdman
17. Bağırov - Rəsm
18. Qaragözəlov - Hərbi dərslər
19. Əhməd Hüseynzadə - Musiqi dərsləri

## 1931-ci ildə işləyənlər

1. Saleh Məhəmmədzadə - Türk dili
2. Maliçenski Pyotr - Rus dili
3. Əlibəyli - İctimaiyyat
4. Salehcanov - İqtisadi-coğrafiya
5. Zahid Cabbarlı - Təcrübə dərsləri
6. Seyfi Hüseynov - Kimya-biologiya
7. Əhmədov - Təbiət
8. Bəxtiyar Rzayev - Bədən tərbiyəsi
9. Cahangirov - Pedaqogika
10. Əli Həsənzadə - Riyaziyyat
11. M.İsmayılzadə - Fizika
12. M.Cabbarzadə - Fizika
13. Tiyajelanko - Zəhmət
14. Axundov - Cilidxana rəhbəri
15. Əsgərov - Hərbi rəhbər
16. Qasımov - Kənd təsərrüfatının əsasları
17. Ocaqov - Gigiyena

## 1932-ci ildə işləyənlər

1. Mustafa İsmayılzadə - Fizika
2. Cəlal Əfəndizadə - Riyaziyyat
3. Nuriyyə Əlizadə - Riyaziyyat
4. Ziya Əfəndizadə - Fizika

5. Qədir Əfəndizadə - Təbiyyat
6. Qurban Abbasov - Coğrafiya fənni və rəsm
7. Seyfi Hüseynzadə - Kimya-biologiya
8. Pyotr Maliçenski - Rus dili
9. Rəşidbəy Əfəndizadə - Rus dili
10. Cabbar Xəlilov - Hərbi dərslər
11. Bəxtiyar Rzayev - Bədən tərbiyəsi
12. Yusif Məmmədzadə - Tarix
13. Məhəmməd Saniyə - Siaysi iqtisad və dialektika fənləri
14. Qiyazinova - Zəhmət dərsləri

## 1933-cü ildə işləyənlər

1. Məhəmməd İsgəndərov - Tarix
2. Davud - Tarix və siyasi iqtisad
3. Cəlal Əfəndizadə -
4. Ziya Əfəndizadə - Fizika
5. Mustafa Cabbarzadə - Fizika
6. Qurban Abbasov - Təbiət-coğrafiya
7. Həsən Əfəndi - Coğrafiya
8. Əyyub Əhmədov - Pedaqogika
9. Seyfi Hüseynov - Kimya-biologiya
10. Pyotr Maliçenski - Rus dili
11. Musa - Rus dili
12. Bəxtiyar Rzayev - Bədən tərbiyəsi
13. Xələfov - Hərbi rəhbər

## 1934-cü ildə işləyənlər

1. Musa Hacızadə - Ədəbiyyat
2. Yusif Əfəndizadə - Fizika-riyaziyyat
3. Ziya Əfəndizadə - Riyaziyyat





4. Kərim Kərimzadə - Fizika
5. Mustafa İsmayılzadə - Fizika
6. Qurban Abbasov - Təbiət
7. Həsən Əfəndizadə - Təbiət
8. Seyfi Hüseynov - Kimya-biologiya
9. Əyyub Əhmədov - Pedaqogika
10. Əlihüseyin Hacıkişiyev - Siyasi iqtisad
11. Rza Cəlilov - Tarix
12. Cabbar Xəlilov - Hərbi dərslər
13. Bəxtiyar Rzayev - Bədən tərbiyəsi
14. Balabəy Sultanov –
15. Yaqub Əfəndizadə - Rəsmxət
16. Pyazenkov - Əmək dərsi
17. Alya Muradova - Alman dili
18. Mirzə Salehli

## 1935-ci ildə işləyənlər

1. Qurban Abbasov
2. Ziya Əfəndizadə
3. Əyyub Əhmədov
4. Məmməd İsmayılov
5. Əlihüseyin Atakişiyev
6. Məmməd Əzizov
7. Rza Cəlilov
8. Qədir Əhmədov
9. Həsən Əfəndiyev
10. Balabəy Sultanov
11. Kərim Kərimov
12. Bəkir Muradov
13. Mustafa Cabbarzadə
14. Seyfi Hüseynov

## 1936-1937-ci tədris ilində işləyənlər

1. Hüseynov Seyfulla Cəlal oğlu
2. İsmayılov Mustafa Mahmud oğlu
3. Hacıkişiyev Əlihüseyn Salam oğlu
4. Cəlilov Rza Əli oğlu
5. Məsimov Həsən Salam oğlu
6. Əfəndizadə Həsən Əhməd oğlu
7. Əhmədli Əhməd Əlirza oğlu
8. Hacızadə Yusif Cəlal oğlu
9. Əzizov Məhəmməd İlyas oğlu
10. İbrahimov İsmayıl Mehdi oğlu
11. Abdurahmanlı Züleyxa
12. Əhmədov Əyyub Adışirin oğlu
13. Əfəndizadə Ziya Abdulla oğlu
14. Ağayev Cəmil İbrahim oğlu
15. Abbasov Qurban Cabbar oğlu
16. Kərimov Kərim Cərulla oğlu
17. Yusifzadə Mahtaban
18. Əhmədov Qədir Ramazan oğlu
19. Salehli Mirzə
20. Soltanov Balabəy Aslan oğlu
21. Cəlilov Cabbar Abdulla oğlu
22. Yaqo Liliboviç
23. Yelena Aleksandra
24. Muradov Bəkir Abdulla oğlu
25. Mirzəyeva Tavus
26. Əlisəddar Yusif oğlu
27. Əfəndizadə Yusif Həsən oğlu
28. Cavanşirov Məhərrəm Qüdrət oğlu





## Şəki Pedaqoji Texnikumunda 2010-cu ildə - yubiley ilində çalışan müəllim və işçilər haqqında.

| Sıra №-si | Müəllimlərin adı, soyadı və atasının adı | Daşıdığı vəzifə |
|---|---|---|
| 1 | 2 | 3 |
| | **Rəhbər işçilər və struktur bölmə rəhbərliyi** | |
| 1. | Şükürov Rafiq Şükür oğlu | Direktor, riyaziyyat müəllimi |
| 2. | Məmmədov Teymurçin Muxrəddin oğlu | Tədris işləri üzrə direktor müavinın, fizika müəllimi |
| 3. | Salamova Səbahət Qazalı qızı | Tərbiyə işləri üzrə direktor müavini, fizika müəllimi |
| 4. | Əhmədov Ağabala Muxtar oğlu | Təsərüfat işləri üzrə director müavini, müəllim |
| 5. | Süleymanov İlqar Yolcu oğlu | Baş mühasib |
| 6. | İbrahimzadə Aytən Rasim qızı | Kadr üzrə mütəxəssis, müəllim |
| 7. | Kərimov Yusif Abdulrəhman oğlu | Fiziki hazırliq rəhbəri, müəllim |
| 8. | Səmədov Rafiq Tofiq oğlu | Hərbi rəhbər, müəllim |
| 9. | İsmayılov Şahid Nəzir oğlu | İstehsalat təcrübəsi rəhbəri, müəllim |
| 10. | Səmədov Nəriman Vahid oğlu | Şöbə müdiri, müəllim |
| 11. | Kərimova Günay Nəriman qızı | Şöbə müdiri (ictimai əsaslarla), müəllim |
| 12. | Qasımov Müşfiq Rauf oğlu | Şöbə müdiri (ictimai əsaslarla), müəllim |
| 13. | Rəsulov Rafiq Nütvəli oğlu | Qiyabi şöbə müdiri, müəllim |
| 14. | Hüseynova Təngiz Şükür qızı | Qiyabi şöbədə metodist, müəllim |
| 15. | Məmmədov Nizami Saddədin oğlu | Metod kabinet rəhbəri, fənn birləşmə sədri, müəllim |
| 16. | Əhmədov İsmayıl Pirməmməd oğlu | Mülkü müdafiə qərargahının rəisi |
| 17. | Zeynalov Pərviz Qnyaz oğlu | Texnikumun tarix muzeyinin rəhbəri, müəllim |

| | | |
|---|---|---|
| | **Əsas müəllimlər** | |
| 1 | 2 | 3 |
| 18. | Yusifov Ramiz Rəhim oğlu | Əsas müəllim, fənn birləşmə sədri |
| 19. | İlyasov İlyas Fərrux oğlu | Əsas müəllim, fənn birləşmə sədri |
| 20. | Quliyeva Şərafət Kamal qızı | Əsas müəllim, fənn birləşmə sədri |
| 21. | Paşayeva Leyla Cəfər qızı | Əsas müəllim, fənn birləşmə sədri |
| 22. | Bağbanlı Arif Ələkbər oğlu | Əsas müəllim, fənn birləşmə sədri |
| 23. | Camalov Qurbanəli Əhməd oğlu | Əsas müəllim |
| 24. | Musayev Cavanşir Üzeyir oğlu | Əsas müəllim |
| 25. | Vəliyev Faiq Xəlil oğlu | Əsas müəllim |
| 26. | Ramazanova Sədaqət Abubəkir qızı | Əsas müəllim |
| 27. | Əzizova Elmira Əliəfsər qızı | Əsas müəllim |
| 28. | Abbasov Bəşarət Əhmədalı oğlu | Əsas müəllim |
| 29. | Cabbarzadə Sevil Muxtar qızı | Əsas müəllim |
| 30. | Namazov Tofiq Bəxtiyar oğlu | Əsas müəllim |
| 31. | Əfəndiyeva Şəfa Cəmaləddin qızı | Əsas müəllim |
| 32. | Məhərrəmov Mahir Məhərrəm oğlu | Əsas müəllim |
| 33. | İsrafilova Rəna Abid qızı | Əsas müəllim |
| 34. | Ağayeva Bahar İsgəndər qızı | Əsas müəllim |
| 35. | Bayraməliyev Şahin Kamil oğlu | Əsas müəllim |
| 36. | Əhmədova Pərvanə Sabit qızı | Əsas müəllim |
| 37. | Mustafayev Məmməd İsgəndər oğlu | Əsas müəllim |
| 38. | Abbasov Tahir Abbas oğlu | Əsas müəllim |
| 39. | Mustafayeva Aygün Vəli qızı | Əsas müəllim |
| 40. | Nəbiyeva Elnarə Rafiq qızı | Əsas müəllim |
| 41. | Yunusova İradə Mürsəl qızı | Əsas müəllim |
| 42. | Məmmədova Aynurə Cabbar qızı | Əsas müəllim |
| 43. | Qaffarova Nübar Xanlar qızı | Əsas müəllim |
| 44. | Həmidova İradə Nəzir qızı | Əsas müəllim |
| 45. | Əliyeva Aynur Mahmudəli qızı | Əsas müəllim |
| 46. | Rəsulov Cahid Abduləli oğlu | Əsas müəllim |
| 47. | Məmmədova Mətanət Məmməd qızı | Əsas müəllim |
| 48. | Nağıyeva Xəyalə Bəkir qızı | Əsas müəllim |
| 49. | Mikayılov Sahib İsmayıl oğlu | Əsas müəllim |
| 50. | Rzayev Rasim İslam oğlu | Əsas müəllim |
| 51. | Səmədova İlahə Rasim qızı | Əsas müəllim |
| 52. | İsmayılova Nərgiz Yasir qızı | Əsas müəllim |
| 53. | Nadirova Rəmziyyə Aydın qızı | Əsas müəllim |
| 54. | Bayramova Şəlalə Məmməd qızı | Əsas müəllim |
| 55. | Səfərova Məhsətixanım Ayaz qızı | Əsas müəllim |
| 56. | Nəbiyev Sahib Niyazi oğlu | Əsas müəllim |
| 57. | İdriszadə Vüsalə Oktay qızı | Əsas müəllim |
| 58. | İsmayılova Şəbnəm Hikmət qızı | Əsas müəllim |





| 1 | 2 | 3 |
|---|---|---|
| 59. | Məmmədova Samirə Ramiz qızı | Əsas müəllim |
| 60. | İsmayılova Aytən Aydın qızı | Əsas müəllim |
| 61. | Rəhimova Yaqut Sadəddin qızı | Əsas müəllim |
| 62. | Eminova Güləyaz Həsən qızı | Əsas müəllim |
| 63. | Sədiyeva Sevinc Ələddin qızı | Əsas müəllim |
| 64. | Zəkəryəyev Davud Şahid oğlu | Əsas müəllim |
| 65. | Mahmudov Akif Məmməd oğlu | Əsas müəllim |
| 66. | Cabbarova Almaz Siracəddin | Əsas müəllim |
| 67. | Mahmudova Nəcibə Nəbi qızı | Əsas müəllim |
| 68. | İlyasova Şəhla Yusif qızı | Əsas müəllim |
| 69. | Abdurahmanov Sabir Paşa oğlu | Əsas müəllim |
| 70. | Qaffarova Ulduz Rafiq qızı | Əsas müəllim |
| 71. | Xudiyeva Ulduz Əmir qızı | Əsas müəllim |
| 72. | Səmədov Rəşid Umar oğlu | Əsas müəllim |
| 73. | Rəsulov Asif Məmməd oğlu | Əsas müəllim |
| 74. | Məmmədova Səbinə Teymurçin qızı | Əsas müəllim |
| 75. | Vəliyeva Vüsalə Nurməmməd qızı | Əsas müəllim |
| 76. | Şükürova Sevinc Kamil qızı | Əsas müəllim |
| | **Saat hesabı işləyən və əvəzedici müəllimlər** | |
| 77. | Hacıyeva Fatma Məmməd qızı | Saat hesabı müəllim |
| 78. | İbrahimova Səmayə Heydər qızı | Saat hesabı müəllim |
| 79. | Əsgərova Vəfa Ələsgər qızı | Saat hesabı müəllim |
| 80. | Hacıyev Maarif Abduləziz oğlu | Saat hesabı müəllim |
| 81. | Məmmədova Arzu Ramiz qızı | Saat hesabı müəllim |
| 82. | İslamova Aynur Nərbala qızı | Saat hesabı müəllim |
| 83. | Əsgərova Şəmsiyyət Məmməd qızı | Saat hesabı müəllim |
| 84. | Qədirbəyova Xəyalə Abid qızı | Saat hesabı müəllim |
| 85. | Uğurluyeva Güldanə Rahim qızı | Saat hesabı müəllim |
| 86. | Əliyeva İlahə Tofiq qızı | Saat hesabı müəllim |
| 87. | Abbasova Tamella Rahim qızı | Saat hesabı müəllim |
| 88. | Şirinova Samirə Hikmət qızı | Saat hesabı müəllim |
| 89. | Abbasova Fərdanə Əjdər qızı | Saat hesabı müəllim |
| 90. | Cəlilova Xatirə Natiq qızı | Saat hesabı müəllim |
| 91. | Quliyeva Elnurə Niyazi qızı | Saat hesabı müəllim |
| 92. | Abdullayeva Sevinc Kazım qızı | Saat hesabı müəllim |
| 93. | Həsrətov Ramin Fərahim oğlu | Saat hesabı müəllim |
| 94. | Əsədullayeva Aygün Ələddin qızı | Saat hesabı müəllim |
| 95. | Zeynalova Aygün Məmməd qızı | Saat hesabı müəllim |
| 96. | Əliyev Rövşən Nağı oğlu | Saat hesabı müəllim |
| 97. | Mustafayeva Aynurə Tahir qızı | Saat hesabı müəllim |
| 98. | İsgəndərova Gülnarə Qurban qızı | Əvəzedici müəllim |
| 99. | Lətifova Vüsalə Mehdi qızı | Əvəzedici müəllim |

| 1 | 2 | 3 |
|---|---|---|
| 100. | Məmmədova Afiqə Bünyad qızı | Əvəzedici müəllim |
| 101. | Zeynalov Zeynal Cəbrayıl oğlu | Əvəzedici müəllim |
| 102. | Uğurliyeva Könül Yaşar qızı | Əvəzedici müəllim |
| 103. | Cabbarova Leyla Şəmsəddin qızı | Əvəzedici müəllim |
| 104. | Məhərrəmov Tahir Məhərrəm oğlu | Əvəzedici müəllim |
| 105. | Əsgərova Gülnar Adil qızı | Əvəzedici müəllim |
| | **Texniki heyyət** | |
| 106. | Bəkirova Adilə Müslüm qızı | Arxiv müdiri |
| 107. | Səmədova Sədaqət Bayraməli qızı | Kitabxana müdiri |
| 108. | Həsənova Sariyə Adı qızı | Mühasib |
| 109. | Məmmədova Təranə Ənvər qızı | Kitabxanaçı |
| 110. | İsmayılova Yeganə İslam qızı | Operator |
| 111. | Fərzəliyeva Sevda Əli qızı | Laborant |
| 112. | Sədirova Tahirə Hacıməmməd qızı | Laborant |
| 113. | Abbasov Yusif Rasim oğlu | Laborant |
| 114. | Abbasova Gülşən Ənvər qızı | Laborant |
| 115. | Camalova Yaqut Salman qızı | Katibə, makinaçı |
| 116. | Əliyeva Zərifə Fikrət qızı | Tədris hissəsi üzrə katibə |
| 117. | Rəsulov Ruslan Aslan oğlu | Komendant |
| 118. | Əhmədov Yusif İsbəndiyar oğlu | Bina və qurğuların carı təmiri üzrə fəhlə |
| 119. | Zeynalova Nörəstə İsmət qızı | Dalandar |
| 120. | Məmmədova Kərimə Ağaməmməd qızı | Xadimə |
| 121. | Hacıyeva Simuzər Əhməd qızı | Xadimə |
| 122. | Ələkbərova Rəna Möhubbəli qızı | Xadimə |
| 123. | Mirzəyeva Leylan Sərdar qızı | Xadimə |
| 124. | Axundov Kənan Soltan oğlu | Gözətçi |
| 125. | Abbasov Hənifə Sadiq oğlu | Gözətçi |
| 126. | Rəsulova Ceyhun Qafil qızı | Xadimə |
| 127. | Mustafayeva Rasimə Natiq qızı | Gözətçi |
| 128. | Mahmudov Vaqif Mənsur oğlu | Gözətçi |
| 129. | Əhmədov Şahin Hüseyn oğlu | Anbardar |
| 130. | Süleymanov Bəxtiyar Şəhliyar oğlu | Yataqxana komendantı |
| 131. | Hacıyev Elşən Fikrət oğlu | Dalandar |
| 132. | Nəsifov Elşad Nəsif oğlu | Dalandar |
| 133. | Əhmədov Əhməd Bayram oğlu | Yataqxana gözətçisi |
| 134. | Şabanova Almaz Umar qızı | Gözətçi |
| 135. | Həsənova Çimnaz Məməş qızı | Gözətçi |
| 136. | Həsənova Yeganə Qiyasəddin qızı | Xadimə |
| 137. | Məhərrəmov Ramin Abdulcəlil oğlu | Gözətçi |
| 138. | Abdullayeva Rühangiz Əfsər qızı | Yardımçı korpusda xadimə |





# VIII bölmə

## Şərəfimizə şərəf qatanlar – Bizim məzunlar

### Dəmirçizadə Əbdüləzzəl Məmməd oğlu



Darülmüəllimin ilk məzunlarındandır.

XX əsr Azərbaycan dilçiliyinin ən böyük dühalarından biridir.

Ə.Dəmirçizadə 1944-cü ildən filologiya elmləri doktoru, 1945-ci ildən professor, 1955-ci ildən Azərbaycan EA-nın müxbir üzvü, 1973-cü ildən Azərbaycan SSR Əməkdar elm xadimi, 1974-cü ildən Azərbaycan SSR Dövlət mükafatı laureatı olmuşdur.

Ə.Dəmirçizadənin 20-dən çox kitabı, 200-dən artıq elmi və elmi- metodik məqaləsi çap olunmuşdur.

Professor Ə.Dəmirçizadə Azərbaycan dilçiliyi üzrə yüksək ixtisaslı elmi kadrların hazırlanmasında böyük rol oynamış, 50-dən çox elmlər namizədi və doktoru yetişdirmişdir.

«Qırmızı Əmək Bayrağı» ordeni və medallarla təltif olunmuşdur.

## Əbdürrəhmanov Yusif Ələkbər oğlu



1929-cu il məzunu.

Böyük Vətən Müharibəsi iştirakçısı olmuş, görkəmli sovet ixtioloqudur. 1964-cü ildən Biologiya elmləri doktoru, 1965-ci ildən professor olmuş, 1968-ci ildə Azərbaycan EA-nın müxbir üzvü seçilmişdir.

100-dən çox elmi əsərin, o cümlədən 10-dan çox monoqrafiyanın müəllifidir. «Şərəf nişanı» ordeni və medallarla təltif edilmişdir.

## Əfəndiyev Heydər Xəlil oğlu

1925-ci il məzunu.



Heydər Əfəndiyev 1941-ci ildə dissertasiya müdafiə edərək geologiya-minerologiya elmləri namizədi alimlik dərəcəsini almışdır. 1949-cu ildə Azərbaycan EA Kimya İnstitutuna direktor təyin edilən Heydər Əfəndiyev ömrünün axırına qədər bu vəzifədə işləmişdir. 1958-ci ildə geologiya-minerologiya elmləri doktoru elmi adını almış, 1959-cu ildə professor adına layiq görülmüş, 1962-ci ildə isə Azərbaycan EA-nın müxbir üzvü seçilmişdir.

Professor Heydər Əfəndiyevin çoxtərəfli elmi axtarışları 8 monoqrafiya və kitabda, 216-ya qədər elmi əsərdə öz əksini tapmışdır. Onun rəhbərliyi ilə 10 kimya elmləri namizədi hazırlanmışdır.İki dəfə «Şərəf Nişanı» ordeni və digər medallarla, Azərbaycan SSR Ali Sovetinin Fəxri Fərmanı ilə təltif olunmuşdur.



## Rəsulov Məcid Lətif oğlu



1916-cı ildə anadan olub. 1928-ci ildə ailəsi əvvəlcə Gürcüstana, sonra isə Qazaxıstanın Aral dənizindəki Kokaral adasına sürgün edilmişdir. Şəkiyə qayıdandan sonra onun təhsilinə Qori seminariyasının məzunu, Şəkidə müəllim işləyən böyük qardaşı Əbdüləli Rəsulov qayğı göstərmişdir.

1934-cü ildə indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin fizika-riyaziyyat fakültəsinə qəbul olunur. Universiteti əlaçı diplomu ilə bitirib. 1938-ci ildə Azərbaycan Dövlət Universitetinin aspiranturasına daxil olmuşdur.

M.Rəsulov 1939-cu ildə ordu sıralarına çağırılmış, 1943-cü ildə ehtiyata buraxılmışdır. Aspiranturaya bərpa olunan M.Rəsulov öz təhsilini Ukrayna Elmlər Akademiyasının Lvov filialında davam etdirir.

1949-cu ildə namizədlik dissertasiyasını müdafiə edir. 1950-60-cı illərdə İ.Franko adına Lvov Dövlət Universitetinin dosenti vəzifəsində çalışır.

1960-cı ildə keçmiş SSRİ EA B.A.Steklov adına Riyaziyyat İnstitutunun Elmi Şurasında doktorluq dissertasiyasını müdafiə edir və həmin ildə də Bakıya qayıdır və indiki Bakı Dövlət Universitetinin Umumi riyaziyyat kafed-

rasının müdiri vəzifəsində çalışmağa başlayır, 1961-cı ildən professor adına layiq görülmüşdür.

M.Rəsulov 1968-ci ildən Azərbaycan EA-na müxbir üzv, 1983-cü ildən isə həqiqi üzv seçilir. O, bir sıra beynəlxalq riyaziyyat konqresində mühazirələr oxumuşdur.

1964-cü ildə Moskvanın «Nauka» nəşriyyatında «Kontur» inteqral üsulu metodu adlı fundamental monoqrafiyası çapdan çıxmışdır.

1967-ci ildə İngiltərə Kral Riyaziyyat Cəmiyyətinin sifarişi ilə monoqrafiya ingilis dilinə tərcümə olunur və Hollandiyada, Amerika Birləşmiş Ştatlarında və Kanadada çap edilir.

1975-ci ildə «Nauka» nəşriyyatında «Kontur inteqral üsulunun tətbiqi» adlı ikinci sanballı monoqrafiyası çapdan çıxır.

M.Rəsulov 80-dən artıq elmi məqalənin müəllifidir. Onun rəhbərliyi ilə 3 elmlər doktoru və 25 elmlər namizədi yetişdirilmişdir.

1989-cu ildə Azərbaycan Respublikasının Əməkdar elm xadimi adına layiq görülmüşdür.

M.Rəsulov müxtəlif illərdə Azərbaycan SSR Ali Sovetinin və Orta İxtisas Təhsili Nazirliyinin Fəxri fərmanları ilə, «Şərəf nişanı» ordeni, bir çox medalla təltif olunmuş və «Əmək veteranı» fəxri adını almışdır.

Məcid Rəsulov 1993-cü ildə dünyasını dəyişmişdir.





## Zülfüqarov Zülfüqar Hüseynqulu oğlu



1913-cü ildə Şəkidə anadan olub, ilk təhsilini də burada alıb.

1936-cı ildə Azərbaycan Sənaye İnstitutunun Kimya-texnologiya fakültəsini fərqlənmə diplomu ilə bitirmişdir.

1941-ci ildə dissertasiya müdafiə edərək elmlər namizədi alimlik dərəcəsinə layiq görülmüşdür.

Z.Zülfüqarov 1941-1946-cı illərdə İkinci Dünya Müharibəsinin iştirakçısı olmuşdur.

1957-ci ildə SSRİ EA Neft İnstitutunda doktorluq dissertasiyası müdafiə etmişdir. 1959-cu ildə Fizika-kimya ixtisası üzrə professor adını almışdır.

1970-1983-cü illərdə QÜFKİ-nin direktoru olmuşdur.

1974-cü ildə Azərbaycan SSR-in Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür.

1978 və 1980-ci illərdə 2 dəfə Azərbaycan SSR Dövlət Mükafatı laureatı adına layiq görülmüşdür.

Z.Zülfüqarov 1948-ci ildən indiki Azərbaycan Dövlət Pedaqoji Universitetində və Bakı Dövlət Universitetində mühazirələr oxumuşdur.

Onun apardığı elmi-tədqiqat işlərinin nəticələri 400-ə qədər elmi əsərdə və 2 monoqrafiyada ümumiləşdirilmişdir.

Professor Zülfüqarov 62 müəlliflik şəhadətnaməsinin müəllifidir. Onun rəhbərliyi altında 45 nəfər namizədlik

dissertasiyası müdafiə etmişdir. O, 7 nəfərin doktorluq dissertasiyasının məsləhətçisi olmuşdur.

Z.Zülfüqarov Azərbaycan EA-nın müxbir üzvü seçilmişdir. O, ikinci dərəcəli Vətən müharibəsi ordeni və 16 müxtəlif medallarla təltif olunmuşdur.

Z.Zülfüqarov 1992-ci ildə vəfat etmişdir.

## Əliyev Vəli Hüseyn oğlu



1954-cü il məzunu.

1955-59-cu illərdə Bakı Dövlət Universitetinin tarix fakültəsində oxumuşdur.

1966-cı ildə «Azərbaycanın tunc dövrü boyalı qablar mədəniyyəti» mövzusunda namizədlik dissertasiyası, 1984-cü ildə isə Tiflisdə «Azərbaycanın orta tunc dövrü tayfalarının mədəniyyəti» adlı doktorluq dissertasiyası müdafiə etmiş, tarix elmləri doktoru adını almışdı. 1994-cü ildən professordur.

1990-cı ildən Azərbaycan EA-nın Arxeologiya və Etnoqrafiya İnstitutunda şöbə müdiri vəzifəsində calışmışdır.

1997-ci ildən Azərbaycan Dövlət Pedaqoji Universitetində «Ümumi tarix» kafedrasının müdiri işləyir.

Azərbaycan EA-nın baş planında olan «Naxçıvan» MR-ın maddi mədəniyyəti», mövzusunun tədqiqinə, eləcə də Naxçıvan Arxeoloji ekspedisiyasına rəhbərlik edir.

Əsərləri Azərbaycanda, eləcə də xarici ölkələrdə – Rusiya, Ukrayna, Pakistan, Gürcüstan, Özbəkistan və digər ölkələrdə nəşr edilmişdir.



«Tarixin izləri ilə», «Azərbaycanın tunc dövrü boyalı qablar mədəniyyəti», «Qədim Naxçıvan», «Azərbaycanın orta tunc dövrü mədəniyyəti», «Naxçıvan» kitablarının, 200-dən cox elmi və elmi-publisistik məqalənin müəllifidir.

V.Əliyevin elmi təşkilatçılıq və elmi-pedaqoji fəaliyyəti təqdirə layiqdir. O, Naxçıvan MR maddi mədəniyyətinin tədqiqi üzrə elmi məktəb yaratmışdır.

Onun rəhbərliyi altında 5 nəfər tarix elmləri namizədi alimlik dərəcəsi diplomları almışdır.

Vəli Əliyev 2003-cü ildə Azərbaycan EA-nın müxbir üzvü seçilmişdir. O, «Pakistan və Mərkəzi Asiya Elmi Assosiasiyası»nın Azərbaycanşünaslar Müstəqil Birliyi Şurası»nın üzvüdür.

## Əfəndiyev Hüseyn Əhməd oğlu



Şəki darülmüəllimin ilk məzunlarındandır.

1932-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin fizika fakültəsinə daxil olmuş, 1942-ci ildə həmin universitetdə namizədlik dissertasiyası müdafiə etmişdir.

1958-ci ildən Azərbaycan EA-nın Fizika İnstitutunda işləməyə başlamış və ömrünün son günlərinə qədər burada çalışmışdır.

1967-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir.

50-dən çox elmi əsərin və bir monoqrafiyanın müəllifidir.

Hüseyn Əfəndiyevin rəhbərliyi ilə 7 elmlər namizədi hazırlanmışdır.

## İsmayılov Fuad Mustafa oğlu



Əvvəlcə Şəkidəki 5№li məktəbdə oxuyub, sonra Şəki Pedaqoji Texnikumuna daxil olub. 3-cü kursda oxuyarkən ailəvi Bakı şəhərinə köçüblər. 1950-ci ildə Azərbaycan Tibb Universitetini bitirib.

1963-cü ildə namizədlik, 1968-ci ildə isə Simferopolda doktorluq dissertasiyasını müdafiə etmişdir.

Türkmənistanda işlədiyi illərdə «SSRİ tibb əlaçısı», Türkmənistanın əməkdar həkimi adlarına layiq görülmüşdür.

1971-ci ildə professor adına layiq görülmüşdür.

Fuad İsmayılov 140 elmi məqalənin, 6 toplunun, 2 dərsliyin, 5 dərs vəsaitinin, 2 monoqrafiyanın müəllifidir. Onun rəhbərliyi ilə iki elmlər doktoru, 5 elmlər namizədi yetişdirilmişdir.

F.M.İsmayılov birinci və ikinci dərəcəli «Vətən müharibəsi» ordenləri, 16 medal, o cümlədən, «Qafqazın müdafiəsi», «Varşavanın azad edilməsi»,»Berlinin alınması», «1941-1945-ci illər Vətən müharibəsi iştirakçısı» medalları ilə təltif edilmişdir.

Azərbaycanın Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür.





## Abdullayeva Nabat Cumay qızı



1941-ci il məzunu.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin professorudur. 3 doktorluq (Azərbaycan, türkmən, qazax), 14 namizədlik dissertasiyasına rəsmi opponentlik etmişdir.

Ali məktəblərin filologiya və dil-ədəbiyyat fakültələri üçün dərs vəsaitinin – B.1975, «Sadə cümlə» – B.1979, «Müasir Azərbaycan dilinin morfologiyası» dərs vəsaitinin – B.1993, «Müasir Azərbaycan dilinin sintaksisi», Ali məktəblər üçün dərsliyin – B.1999, «Müasir Azərbaycan dilinin morfologiyası»nın (təkrar, ikinci nəşri) B.1999 və s. dərslik, dərs vəsaiti, proqramlarının və 50-dən çox elmi məqalənin müəllifidir.

## Rəhimli Əhməd Əli-Rza oğlu



1925-ci il məzunu.

1942-1944-cü ildə Şəki Şəhər Partiya Komitəsinin birinci katibi, sonra isə Azərbaycan Kommunist Partiyasının məsul təşkilatçısı vəzifəsində calışmış, 1951-ci ilə qədər Xaçmaz rayon Partiya Komitəsinin I katibi işləmişdir.

1953-60-cı illərdə Azərbaycan SSR Maarif Nazirliyində birinci müavin,

1963-cü ildən Bakı Yerli Sənaye Texnoloji Texnikumun direktoru olmuşdur.

1959-cu ildə onun rus dilindən tərcüməsi və redaktorluğu nəticəsində 6-8-ci siniflər üçün ilk «Həndəsə» dərsliyi hazırlanmış və çapdan çıxmışdır.

«Qırmızı Əmək Bayrağı» ordeni ilə təltif edilmişdir.

## Hüseynov Şirməmməd Ağaməmməd oğlu



1941-1943-cü illərdə Şəki ikiillik Müəllimlər İnstitutunun fizika-riyaziyyat fakültəsində təhsil alıb.

1950-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU-nun) filologiya-jurnalistika şöbəsini bitirib. 1954-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetində böyük müvəffəqiyyətlə namizədlik dissertasiyası müdafiə edib.

Ş.Hüseynov 1962-1969-cu illərdə ADU-nun (indiki BDU) filologiya fakültəsinin dekan müavini, 1971-1976-cı illərdə ADU-nun (indiki BDU) jurnalistika fakültəsinin dekanı, 1976-1980-ci illərdə Mətbuat tarixi və ideoloji iş metodları kafedrasının müdiri, 1988-2009-cü illərdə isə həmin kafedranın professoru vəzifəsində çalışmışdır.

Ş.Hüseynov 1966, 1972-ci illərdə «Qızıl qələm» mükafatına, 1988-ci ildə «Respublikanın əməkdar jurnalisti» adına layiq görülmüş, 1991-ci ildə Zərdabi mükafatını, 1992-ci ildə Y.Məmmədəliyev adına mükafat, 1998-ci ildə M.Ə.Rəsulzadə adına mükafat almışdır.



Professor Şirməmməd Hüseynov 5 dissertantın elmi rəhbəri,14 dissertasiya işinin rəhbəri, 14 dissertasiya işinin rəsmi opponenti olmuşdur.

## İbadzadə Qafar Məmməd oğlu



1925-ci il məzunu.

1940-cı ildə SSRİ Elmlər Akademiyasının Azərbaycan filialının Botanika İnstitutunda aspiranturaya daxil olmuşdur.

1942-1945-ci illərdə Böyük Vətən Müharibəsində iştirak edib, müxtəlif medallarla təltif edilmişdir.

Müharibədən sonrakı illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU-də) Botanika kafedrasında baş müəllim işləmişdir.

1964-cü ildən Azərbaycan Sovet Ensiklopediyasında biologiya şöbəsinə rəhbərlik etmiş, bir çox elmi əsərlərin və metodik monoqrafiyaların müəllifi olmuşdur.



## Xəlifəzadə Çingiz Müzəffər oğlu

1947-ci il məzunu.

1955-ci ildə namizədlik dissertasiyası, 1972-ci ildə isə SSRİ EA-nın Geologiya İnstitutunda doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə etmişdir.

BDU-nin geologiya fakültəsinin

faydalı qazıntılar kafedrasında 1981-ci ilə kimi professor vəzifəsində çalışmışdır.

1993-cü ildən Azərbaycan Beynəlxalq Ekoenergetika Akademiyasının həqiqi üzvüdür.

1980-ci ildə Azərbaycan Respublikasının Əməkdar geoloqu fəxri adını almış, 1981-ci ildə Azərbaycan Ali və Orta İxtisas Təhsili Nazirliyinin fəxri medalı ilə təltif olunmuşdur.

200-dən çox elmi məqaləsi, monoqrafiyaları, kitabları, müəlliflik şəhadətnaməsi vardır

Çingiz Xəlifəzadə bir elmlər doktoru, 15 elmlər namizədi yetişdirmişdir ki, onlardan da beşi xarici ölkə vətəndaşıdır.

## İsmayılov Fərrux Cabbar oğlu



1932-ci il məzunu.

1939-1945-ci illərdə hərbi qulluqda olmuşdur. 1949-1951-ci illərdə Azərbaycan KP MK-də təlimatçı, sonra Nuxa Şəhər Partiya Komitəsinin ikinci katibi, 1953-1955-ci illərdə Azərbaycan KP Nuxa Şəhər Partiya Komitəsinin birinci katibi vəzifələrində çalışmışdır.

1966-cı ildən ömrünün sonuna kimi Fərrux İsmayılov 19№li məktəbə rəhbərlik etmişdir.





## İmanzadə Səidə Nəbi (Əhməd) qızı



1916-26-cı illərdə təhsilini əvvəlcə Şəki şəhərindəki qızlar məktəbində, sonra Bakı şəhər Sənaye məktəbində almışdır.

Səidə İmanzadə 1943-cü ildən ömrünün axırınadək Azərbaycan Dövlət Universitetində(indiki BDU-da) dosent vəzifəsində işləmişdir.

1954-cü ildə namizədlik dissertasiyası müdafiə edərək tarix elmləri namizədi alimlik dərəcəsi almışdır.

Müxtəlif mətbuat orqanlarında 40-dan artıq elmi məqaləsi və 5 kitabı çap olunmuşdur. O, 35 namizədlik işinin elmi rəhbəri olmuşdur.

Səidə xanımın əməyi yüksək qiymətləndirilmiş, «Lenin ordeni», «Şərəf nişanı» otdeni, «Böyük Vətən Müharibəsində qələbə», «Qafqazın müdafiəsi uğrunda» medalları ilə təltif olunmuş, iki dəfə Əməkdar müəllim adı almış, Azərbaycan SSR Ali Sovetinin Fəxri Fərmanları ilə təltif edilmişdir.

## Bağbanlı İsgəndər Lətif oğlu



Darülmüəllimin ilk məzunlarındandır.

1933-cü ildən ömrünün axırınadək keçmiş SSRİ EA Azərbaycan filialının Kimya İnstitutunda, 1959-cu ildən Azərbaycan EA Qeyri Üzvi və Fiziki Kimya institutunda çalışmışdır.

Professor İsgəndər Bağbanlının elmi tətqiqat işlərinin nəticələri 4 dəyərli monoqrafiyada, 175 elmi əsərdə öz əksini tapmışdır. O, respublikamızda analitik kimya məktəbi yaradanlardan biridir. İ.Bağbanlının rəhbərliyi ilə 3 elmlər doktoru və 15 elmlər namizədi yetişdirilmişdir.

Professor İ.L.Bağbanlının əməyi yüksək qiymətləndirilmiş, «Qırmızı Əmək Bayrağı» ordeni, «Qafqazın müdafiəsi uğrunda», «Fədakar əməyə görə» medalları ilə təltif olunmuşdur.

## Qasımov Məmməd Əhməd oğlu



1925-ci il məzunu.

1930-cu ildə ADU-nu bitirmişdir. M.Qasımov 1937-ci ildə müdafiə etmədən elmi yaradıcılığına görə ona biologiya elmləri namizədi, eyni zamanda dosent adı verilmişdir.

1957-ci ildə SSRİ Elmlər Akademiyasının V.L.Komarov adına Leninqrad Botanika İnstitutunda doktorluq dissertasiyası müdafiə etmiş, biologiya elmləri doktoru alimlik dərəcəsi adına layiq görülmüşdür. Müxtəlif illərdə Azərbaycan Pedaqoji İnstitutunda, BDU-da, Azərbaycan Tibb Universitetində müxtəlif vəzifələrdə çalışmışdır.

Onun rəhbərliyi ilə bir elmlər doktoru, 24 elmlər namizədi yetişdirilmişdir.

Əməyi yüksək qiymətləndirilmiş, «Qırmızı Əmək Bayrağı» ordeni, «Əmək igidliyinə görə», «Qafqazın müdafiəsinə görə» və s. medallarla təltif edilmişdir.



## Hacıyev Nazim Məmmədiyə oğlu



1940-ci il məzunu.

1940-ci ildə Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsinə daxil olub. 1947-ci ildə Nazim Hacıyev Bakı şəhər komsomol komitəsinin katibi seçilib.

1950-ci ildə isə o, partiya işinə keçir, Azərbaycan KP BK aparatında təbliğat şöbəsinə təlimatçı təyin edilir. Elə həmin ildə də Azərbaycan Dövlət Tibb İnstitutunun partiya bürosunun katibi seçilir.

1956-1958-ci illərdə Nazim Hacıyev Azərbaycan KP MK-da elm və təhsil şöbəsinə rəhbərlik edir. Elə həmin ildə Sov.İKP MK-da məsul işə qəbul edilir.

O, bir sıra taleyüklü məsələlərin həllində yaxından iştirak etmişdir.

1960-cı ildə Nazim Hacıyev Azərbaycan KP MK-nın ideoloji məsələlər üzrə katibi seçilir. 1960-cı ilin dekabrında Sov.İKP MK-nın Rəyasət heyətində Nazim Hacıyev Qarabağın və Naxçıvanın tarixi və hüququ cəhətdən Azərbaycana məxsusluğunu hərtərəfli əsaslandırır. Erməni lobbisini, başda A.Mikoyan olmaqla, həmçinin ABŞ-dakı erməni diasporasının bütün cəhdlərinin qarşısını alır. Qarabağ və Naxçıvan əraziləri Azərbaycanın tərkibində saxlanılır.

Bu uğuru da onun sonrakı taleyində əsas rol oynayır. Səhhəti ilə əlaqədar Kreml xəstəxanasında cərrahiyyə stoluna çıxarılan Nazim Hacıyev üzərində erməni professoru Abramyan erməni lobbisinin yaratdığı şəraitdə səhv

cərrahiyyə əməliyyatı aparır. Nəticədə Nazim Hacıyev 1962-ci ilin iyul ayında 38 yaşında faciəli surətdə ölür.

O, 50-dən çox kitab və məqalənin müəllifidir. Bakıda Fəxri Xiyabanda torpağa tapşırılıb.

Bakıda mərkəzi küçələrdən biri, Şəkidə mərkəzi klub onun adını daşıyır.

## Abdullayev Lütfəli Əmir oğlu



1914-cü ildə Şəkidə anadan olmuşdur. Nuxa Pedaqoji Məktəbini bitirib. 1960-cı ildə Azərbaycan SSR Xalq artisti fəxri adını, 1946-cı ildə Azərbaycan SSR Dövlət mükafatı laureatı adını qazanmışdır. Onun yaradıcılığı Azərbaycan Musiqili Komediya Teatrı ilə sıx bağlı olmuşdur. O, Azərbaycan teatr səhnəsində Möhsün («Beş manatlıq gəlin», S.Rüstəmov), Qoşun («Toy kimindir», A.Məşədibəyov), Dursun («Durna», S.Rüstəmov), Qəhrəman («Gözün aydın», F.Əmirov), Mitoş («Hicran», E.Sabitoğlu) və s. bir-birindən maraqlı obrazlar yaratmış, «Ulduz», «Arşın mal alan», «O olmasın, bu olsun», «Əhməd haradadır?» və s. filimlərdə çəkilmişdir.

Lütfəli Abdullayev «Qırmızı əmək bayrağı» ordeni və medallarla təltif olunmuşdur.





## Bəkirov Məmmədəmin Yaqub oğlu



1947-ci il məzunu.

1951-ci ildə ADU-nun fizika-riyaziyyat fakültəsini bitirib.

M.Bəkirov 1976-cı ildə fizika-riyaziyyat elmləri üzrə namizədlik dərəcəsini, 1981-ci ildə isə doktorluq dərəcəsini almışdır.

Məmmədəmin Bəkirov 200-dən çox məqalənin, 5 monoqrafiyanın, 70 müəlliflik şəhadətnaməsinin müəllifidir.

## Məmmədov Əbdülrəhim Əbdülrəhman oğlu



1940-cı il məzunu.

1942-ci ildə Şəki ikiillik Müəllimlər İnstitutunu bitirib. 1958-ci ildə Azərbaycan KP Şəki Şəhər Komitəsinin birinci katibi seçilib, 1967-ci ilin əvvəllərinə kimi həmin vəzifədə çalışıb.

1967-ci ildə Azərbaycan SSR Nazirlər Soveti Sovet orqanları şöbəsinin baş referenti vəzifəsinə təyin olunub və 20 il sonrakı müddətdə həmin vəzifədə işləyib.

Azərbaycan SSR Ali Sovetinin 2 çağırışına deputat seçilib. «Qırmızı Əmək Bayrağı» ordeni və medallarla təltif edilmişdir.

## Əyyubov Əsgər Cabbar oğlu



1944-cü il məzunu.

Əsgər Əyyubov 1954-cü ildə Moskvada namizədlik, 1971-ci ildə Bakıda doktorluq dissertasiyası müdafiə etmişdir. 1978-ci ildə professor adı almışdır. O, çap olunmuş 230-dan çox elmi əsər, o cümlədən 11 monoqrafiya, 5 elmi-kütləvi kitabın, iki 1:600000 miqyaslı xəritə və bir atlasın müəllifidir. Müxtəlif xarici ölkələrdə Ə.Əyyubovun 40-a qədər elmi əsəri dərc olunmuşdur.

Əsgər Əyyubov bir elmlər doktorunun, iki elmlər namizədinin yetişdirilməsində böyük əmək sərf etmişdir.

## Mustafazadə Məmməd Abdulkərim oğlu



Şəkidə təhsilini başa vurduqdan sonra Azərbaycan Pedaqoji İnstitutunun fizika-riyaziyyat fakültəsini fərqlənmə diplomu ilə bitirmişdir.

1948-ci ildə fizika-riyaziyyat ixtisası üzrə namizədlik, 1973-cü ildə isə «İqtisadi tədqiqatlarda riyazi üsullar» mövzusu üzrə doktorluq dissertasiyası müdafiə etmişdir.

1960-cı ildən ömrünün sonunadək Azərbaycan EA Kibernetika İnstitutunda «Riyazi-iqtisadi modellər» laboratoriyasının müdiri vəzifəsində çalışmış, onun rəhbərliyi altında 12 nəfər namizədlik dissertasiyası müdafiə etmişdir.





1984-cü ildə Azərbaycan Respublikası Dövlət mükafatına layiq görülmüşdür.

Onun əməyi respublika hökuməti tərəfindən yüksək qiymətləndirilmiş, «Qırmızı Əmək Bayrağı», «Şərəf nişanı» ordeniləri və bir sıra medalla təltif olunmuşdur.

## Əhmədov Nəzir Laçın oğlu



1943-cü ildə Şəki Pedaqoji Texnikumundan (17 yaşında) könüllü əsgər gedib.

1944-cü ildə Xarkov Hərbi Kəşfiyyat məktəbində oxuyub. Rusiyanın Sankt-Peterburq Universitetini bitirib və Leninqrad Vilayət Partiya komitəsində çalışıb.

1963-1974-cü illərdə Zaqatala Rayon Partiya Komitəsinin, sonra Abşeron Rayon Partiya Komitəsinin I katibi olmuş, daha sonralar Şəki Şəhər İcra Hakimiyyətinin başçısı, Azərbaycan Dövlət Plan Komitəsinin İqtisadiyyat İnstitutunda baş elmi işçi, şöbə müdiri vəzifəsində işləmişdir.

N.Əhmədov iqtisad elmləri namizədi, 3 elmi, 5 şeirlər toplusunun müəllifidir. Ədəbi ictimaiyyətdə Nəzir Eltəkin kimi tanınıb. 2 çağırış Azərbaycan SSR Ali Sovetinin deputatı olmuş, 4 orden və 14 medalla təltif edilmişdir.

## Fərəcova Əsmayə Şirin qızı



1929-cu ildə Şəki şəhərində anadan olub. Orta məktəbi gümüş medalla bitirib, Şəki Müəllimlər İnstitutunun Azərbaycan dili və ədəbiyyatı fakültəsinə daxil olub.

1950-ci ildə təyinatla Böyük Dəhnə kənd orta məktəbinə müəllim təyin edilib. 36 il fasiləsiz olaraq həmin məktəbdə müəllimə işləmiş, «Qabaqcıl maarif xadimi» döş nişanı ilə təltif olunmuşdur.

2004-cü ildə Əsmayə Fərəcovanın həyat və fəaliyyətini əks etdirən jurnalist-yazıçı Sadiq Zamanoğlunun «Ağ günlər sorağında» adlı sənədli romanı çap olunmuşdur.

Şəkidə xeyriyyəçiliyi ilə məşhur olan iş adamı, eyni zamanda fəlsəfə elmləri namizədi, oğlu Cavanşir Feyziyevin Böyük Dəhnə kəndində öz vəsaiti hesabına tikdirdiyi 620 yerlik orta məktəb kənd sakinlərinin çoxsaylı kollektiv və təşkilatlanmış xahişlərindən sonra Əsmayə Fərəcovanın adını daşıyır.

## Əsgərzadə (Əliyeva) Rəqiyyə Yusif qızı



1942-ci ildə Nuxa ikiillik Pedaqoji İnstitutuna daxil olmuş və bir il ərzində təhsilini bitirib 12 №li məktəbə direktor vəzifəsinə təyin edilmişdir.

1949-cu ildə Azərbaycan Sənaye





İnstitutunun Kimya- texnologiya fakültəsini bitirib Neft Emalı Nazirliyinin «Giproazneft» layihə institutuna göndərilib. Burada 30 ildən çox çalışaraq texnoloji şöbənin rəisi vəzifəsinə qədər yüksəlmişdir.

Azərbaycanın neft emalı müəssisələrinin rekonstruksiyası, SSRİ-nin mühüm neft emalı müəssisələrinin, Polşanın neft emalı qurğularının, Əfqanıstanın neft emalı zavodunun layihə işlərinə rəhbərlik etmişdir.

Rəqiyyə Əsgərzadə «Əməkdar neftçi» fəxri adına layiq görülmüş, bir sıra medallarla təltif edilmişdir.

## Cəfərov Nurəddin Camaləddin oğlu



1953-cü il məzunu.

1965-ci ildə fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almışdır. 1992-ci ildə Azərbaycan EA Dərin Neft və Qaz yataqları Problemləri İnstitutunda müvəffəqiyyətlə doktorluq dissertasiyası müdafiə edib texnika elmləri doktoru alimlik dərəcəsi almışdır. Onun rəhbərliyi ilə 7 elmlər namizədi hazırlanmışdır. 24 çap vərəqi həcmində monoqrafiyası, 130-dan artıq elmi məqaləsi çap olunmuşdur.

## Əliyev Manaf Mustafa oğlu



1935-ci il məzunu.

1941-ci ildən 1945-ci ilə kimi Böyük Vətən Müharibəsində iştirak etmiş, Kenisberqə qədər şərəfli döyüş yolu keçmişdir.

1952-61-ci illərdə Şəki şəhər Partiya Komitəsində təlimatçı vəzifəsində işləmişdir.

M.Əliyev 1961-1975-ci illərdə Şəki şəhər 17№li məktəbində dərs hissə müdiri və direktor vəzifələrində çalışmışdır.

Manaf Əliyevin xidmətləri dövlət tərəfindən qiymətləndirilmiş, bir çox orden və medallarla təltif edilmişdir.

## Əliyev Vilayət Hüseyn oğlu



1956-ci il məzunu.

1965-ci ildə Daşkənd şəhərində namizədlik, 1990-cı ildə Bakıda doktorluq dissertasiyası müdafiə etmişdir. Professordur. 60-cı illərdən dilçilik sahəsində səmərəli fəaliyyət göstərir. Dilçiliyə dair bir neçə kitabın müəllifidir.





## Əliyev İdris Fərəc oğlu



1953-cü il məzunu.

1968-ci ildə riyaziyyatın tədrisi metodikası ixtisası üzrə pedaqoji elmlər namizədi alimlik dərəcəsi almışdır.

90-a qədər elmi və metodik vəsait, kitab, kitabça və məqalələrin müəllifidir. Namizədlik dissertasiyasının mövzusu «Riyaziyyatın həyatla əlaqəli tədrisi» olmuşdur.

## Əfəndiyev Ramiz Məcid oğlu



Şəki Pedaqoji Texnikumundan sonra 1939-cu ildə M.Əzizbəyov adına Azərbaycan Sənaye İnstitutunu bitirmişdir.

1955-ci ildə namizədlik dissertasiyası müdafiə etmişdir. 2 nəfər elmlər namizədi hazırlamışdır.



## Abbasova Baxşı Əhməd qızı

1936-cı il məzunu.

«Qırmızı Əmək Bayrağı» ordeni, «1941-1945-ci illərdə arxa cəbhədəki fədakar əməyinə görə», «Əməkdə fərqlənməyinə görə» və digər medallarla təltif edilmişdir.

## Abdullayev Əbdürəhman Məmməd oğlu



1933-cü il məzunu.

1944-cü ildə Şəki şəhər Maarif şöbəsinin müdiri, Azərbaycan SSR Maarif Nazirliyi İbtidai-Orta Məktəblər İdarəsinin baş müfəttişi vəzifəsində işləmişdir.

1957-ci ildə Şəki Şəhər Partiya komitəsinə katib seçilmişdir.

1963-cü ildən pedaqoji elmlər namizədi adına layiq görülüb.

Beş kitabın və 30 elmi məqalənin müəllifi olmuşdur. «Qırmızı Əmək Bayrağı» ordeni, «Qafqazın müdafiəsi» və «1941-1945-ci illərdə əməkdə fərqlənməyə görə» medalı ilə təltif olunmuş, respublikanın «Əməkdar mədəniyyət işçisi» fəxri adına layiq görülmüşdür.





## Əhmədov Lətif Məhəmməd oğlu



1941-ci il məzunu.

Moskvada İqtisadiyyat İnstitutunun Elmi şurasında namizədlik dissertasiyası müdafiə etmişdir. Maaliyyə-kredit məsələləri haqqında 40-dan artıq məqalənin, müəssisələrin və xalq təsərrüfatı sahələrinin maliyyə məsələləri haqqında bir dərs vəsaitinin müəllifidir.

Böyük Vətən Müharibəsində iştirak edən Lətif Əhmədov bir sıra orden və medallarla təltif olunmuşdur.

L.Əhmədov 5 elmlər namizədi yetişdirmişdir.

## Əfəndiyeva Şəfiqə Məcid qızı



1932-ci ildə orta təhsilini pedaqoji texnikumda almışdır.

1956-cı ildə namizədlik dissertasiyası müdafiə etmişdir.

1959-cu ildə dosent vəzifəsinə seçilmiş və 1987-ci ilə qədər bu vəzifədə işləmişdir. Pedaqoji fəaliyyəti dövründə 50 elmi əsərin müəllifi olmuşdur.

## Həmidov Şəmsəddin Qafur oğlu



1944-cü il məzunu.

1971-ci ildə namizədlik dissertasiyası müdafiə edərək fizika elmləri namizədi alimlik dərəcəsi almışdır. BDU-nun dosentidir. 40-a yaxın elmi-metodik məqalənin, «Fizikadan olimpiada məsələləri»(1987), «Fizika məsələləri» dərs vəsaitinin müəllifidir.

## Hümmətov Nurpaşa Ömər oğlu



1941-ci il məzunu.

1941-1943-cü illərdə Böyük Vətən Müharibəsində iştirak etmiş, ağır yaralandığına görə döyüşən ordudan tərxis edilmişdir.

1954-cü ildə indiki Pedaqoji Universitetin Azərbaycan dili və ədəbiyyatı fakültəsini bitirib.

1969-cu ildən 1985-ci ilədək Oxud kənd orta məktəbinin direktoru işləyib.

1971-ci ildə namizədlik dissertasiyası müdafiə edərək pedaqoji elmlər namizədi alimlik dərəcəsinə layiq görülmüşdür.







## Ağasıyev Fərrux Fərhad oğlu (Ağasıbəyli)

1954-cü il məzunu.

VI sinif ədəbiyyat dərsliyinin müəlliflərindən biridir.

«Təzə həyat» qəzetinin baş redaktorudur.

3 kitab müəllifidir.

## İmamverdiyev Mürsəl Həbibillah oğlu



1947-ci il məzunu.

1954-cü ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu – indiki Azərbaycan Kənd Təsərrüfatı Akademiyasını bitirib. 1972-ci ildə dissertasiya müdafiə edib kənd təsərrüfatı elmləri namizədi alimlik dərəcəsi almışdır.

Seleksiyaçı alimdir.

## Əbdürrəhmanov Mirəli İbrahim oğlu

1941-ci il məzunu.

1958-ci ildə Daşkənddə namizədlik dissertasiyası müdafiə etmişdir. 1964-cü ilə qədər Azərbaycan EA-nın Energetika İnstitutunda baş elmi işçi, 1964-cü ildən indiki Neft Akademiyasında dosent vəzifəsində işləyir.

## Məmmədov Nadir Cəlil oğlu



1941-1942-ci tədris ilinin məzunu.

1958-ci ildə SSRİ EA Şərqşünaslıq İnstitutunda müdafiə edib filologiya elmləri namizədi alimlik dərəcəsi almışdır. «M.F.Axundovun bədii yaradıcılığı» və «M.F.Axundovun realizmi» monoqrafiyaları çap edilmişdir. Eyni zamanda Azərbaycan, rus və Avropa yazıçıları barədə Azərbaycan və rus dillərində 300-ə yaxın məqalə, rəy və portret yazılar dərc etdirmişdir.

## Məmmədov Sabir Cəlil oğlu

1941-ci il məzunu.

1967-ci ildə namizədlik dissertasiyası müdafiə etmiş və alimlik dərəcəsi almışdır. 1951-1960-cı illərdə Dövlət Təhlükəsizliyi Komitəsində işləmiş, 1969-cu ildən ömrünün sonunadək N.Gəncəvi adına Azərbaycan Ədəbiyyatı Muzeyinin elmi-kütləvi şöbəsinin müdiri vəzifəsində çalışmışdır.







## Mustafazadə Həsən Bəkir oğlu



1936-cı il məzunu.

1966-cı ildə fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə etmişdir. Müdafiə etdikdən sonra ömrünün axırına qədər Azərbaycan Dövlət Universitetinin «Riyazi-fizika tənlikləri» kafedrasında müəllim, baş müəllim və dosent vəzifələrində işləmiş, 30-dan artıq elmi məqalə çap etdirmişdir.

## Mustafayeva Səmayə Məmməd qızı

1967-ci il məzunu.

1971-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu (indiki ADPU-ni) fərqlənmə diplomu ilə qurtarıb. Oranı Lenin təqaüdü ilə oxuyub.

1985-ci ildə namizədlik dissertasiyası müdafiə edib tarix elmləri namizədi alimlik dərəcəsi alıb.

ADPU-da dosent vəzifəsində çalışır.



## Nəbibəyov Rüstəm Hüseynbəy oğlu



1942-ci il məzunu.

Bakıda ADU-nun mexanika-riyaziyyat fakültəsini əla qiymətlərlə bitirib. Atası podpolkovnik Hüseyn bəy Qasım bəy oğlu, əmiləri polkovnik Bəhram bəy, kapitan Vahid bəy və Zahid bəy 30-cu illərdə sovet quruluşuna qarşı aparılan mübarizənin fəal iştirakçıları olduqlarından repressiyaya məruz qalmışlar.

Rüstəm müəllim özü də repressiyaya məruz qalmış, uzun illər ərzində üzərində çalışdığı elmi işinə rəy ala bilməmişdir.

Ömrünün son illərində Şəki Pedaqoji Texnikumunda müəllim işləmişdir.

## Rəşidov Məmməd İsmayıl oğlu



1932-ci ildə Şəki Pedaqoji fəhlə fakültəsinə daxil olub. 1937-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirib.

1939-1945-ci illərdə orduda olmuş, bir sıra döyüş orden və medalları ilə təltif olunmuşdur. Stalin rejiminin süqutundan sonra Azərbaycan Pedaqoji İnstitutunun fəlsəfə kafedrasında baş





müəllim vəzifəsinə bərpa olunmuş və ömrünün sonuna kimi orada çalışmışdır.

1973-cü ildə müsabiqə yolu ilə kafedranın dosenti vəzifəsinə seçilmişdir.

## Rəsulov Abuzər Məmməd oğlu



1925-ci il məzunu.

1952-ci ildə fizika-riyaziyyat elmləri namizədi, 1976-cı ildə texnika elmləri doktoru adını almaq üçün doktorluq dissertasiyası müdafiə etmiş, həmin ildən də professor vəzifəsində işləmişdir.

Professor Abuzər Rəsulovun 90-dan çox elmi məqaləsi çap olunmuş, müxtəlif konfrans və seminarlarda 100-dən çox elmi məruzə ilə çıxış etmişdir.

Gənc mütəxəssis fizik kadrların hazırlanmasında, eləcə də universitetin ictimai-siyasi həyatında aktiv iştirak etdiyinə görə «Qırmızı Əmək Bayrağı» ordeninə və 3 medala, 4 fəxri fərmana layiq görülmüşdür.

Böyük Vətən Müharibəsi iştirakçısı kimi ikinci dərəcəli Vətən müharibəsi ordeni, 9 medal, 2 döş nişanı ilə təltif edilmişdir.

1986-cı ildə professor Abuzər Rəsulovun «Optikadan laboratoriya işlərinə rəhbərlik» kitabı nəşr olunmuşdur.

## Salmanova Dilarə Hüseyn qızı



1947-cu il məzunu.

1954-cü ildə ADU-nun fizika-riyaziyyat fakultəsini bitirimişdir.

1970-ci ildə namizədlik dissertasiyası müdafiə etmişdir. Namizədlik dissertasiyası müdafiəsindən sonra Riyaziyyat İnstitutunda baş elmi işçi vəzifəsində çalışmış, 11 elmi məqalə çap etdirmiş, «Əmək veteranı» medalı ilə təltif edilmişdir.

## Abdullayev Qəni Abdulcəmil oğlu



1946-cı il məzunu.

1962-ci ildə indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin dil-ədəbiyyat fakültəsini bitirib. VI-VII Respublika Müəllimləri qurultayının nümayəndəsi olmuş, 20-dən çox elmi pedaqoji məqalənin müəllifidir.

Ali kateqoriyalı metodist müəllimdir. «Tərəqqi» medalı ilə təltif edilmişdir.





## İbrahimova Rəxşəndə Yaqub qızı



Şəki Pedaqoji Texnikumunu bitirdikdən sonra ilk əvvəl 7№li qızlar məktəbində pioner baş dəstə rəhbəri, sonralar Qoxmuq kənd məktəbində ibtidai sinif müəllimi işləmişdir. Sonralar Azərbaycan Dövlət Universitetinin (indiki BDU) qiyabi yolla tarix fakültəsini bitirmiş, 1956-cı ildən Bakı şəhərinin Kirov rayonundakı (indiki Binəqədi) 99 nömrəli məktəbdə 35 il tarix fənnini tədris etmiş, «Əmək veteranı» medalı, çoxsaylı Fəxri fərmanlar və mükafatlarla təltif edilmişdir.

## Kərimov Cəfər Məcid oğlu



1942-cı il məzunu.

1950-ci ildə Azərbaycan Dövlət Kənd Təsərrüfatı İnstitutunu (indiki Azərbaycan Dövlət Kənd Təsərrüfatı Akademiyası) bitirib.

1973-cü ildə namizədlik dissertasiyasını müdafiə edərək baytarlıq elmləri namizədi alimlik dərəcəsinə layiq görülmüşdür.

Bir çox elmi əsərlərin müəllifidir.

## Qasımov Abuzər Fərəc oğlu



1945-ci il məzunu.

1950-cı ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) filologiya fakültəsini bitirmişdir.

1962-1965-ci illərdə Şəki rayon Partiya Dövlət Nəzarəti Komtəsinin sədri, 1966-1967-ci illərdə Şəki rayon Xalq Nəzarəti Komitəsinin sədri vəzifəsində çalışıb.

Ömrünün çox böyük hissəsi pedaqoji fəaliyyətlə bağlı olmuşdur.

## Qasımova Bilqeyis Əli qızı



1938-ci il məzunu.

1942-ci ildən Böyük Vətən Müharibəsində iştirak edib. O, «Döyüş xidmətlərinə görə», «Qafqazın müdafiəsinə görə», «1941-1945-ci illər Böyük Vətən Müharibəsində Almaniya üzərində qələbəyə görə» medalları ilə təltif edilmişdir.

Müharibədən sonra Zaqatala rayonunda yaşamış, uzun illər Zaqatala şəhər 1 nömrəli uşaq bağçasına rəhbərlik etmiş, «Qabaqcıl maarif xadimi» döş nişanına layiq görülmüşdür.





## Mustafayeva Rəhimə İsmayıl qızı



1943-cü il məzunu.

1952-ci ildə indiki Azərbaycan Dövlət Neft Akademiyasını bitirib.

1955-ci il Bakı şəhər Sovetinin V çağırış deputatı seçilmişdir.

R.Müstafayeva namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə etmiş, 15 mart 1968-ci ildə Moskvada geologiya-minerologiya elmləri namizədi alimlik dərəcəsi almışdır.

Bir çox orden və medallarla təltif edilmişdir.

## Naibov Nurməmməd Hacıməmməd oğlu



1929-cu il məzunu.

Nurməmməd Naibov 1966-cı ildə «Qırmızı əmək bayrağı» ordeni ilə təltif edilmiş, həmin ildə Azərbaycan SSR-in Əməkdar müəllimi fəxri adına layiq görülmüşdür.

## Rəcəbov Musa Mustafa oğlu



1941-ci ildə Şəki ikiillik Müəllimlər İnstitutundan Böyük Vətən Müharibəsi cəbhəsinə yola düşüb. Müharibədən qayıtdıqdan sonra qiyabi yolla Azərbaycan Dövlət Universitetinin (indiki BDU) tarix fakültəsini bitirib.

Döyüşən orduda bir çox orden və medallarla, 1971-ci ildə isə SSRİ Ali Sovetinin qərarı ilə «Şöhrət ordeni» ilə təltif olunmuşdur.

Musa Rəcəbova 1976-cı ildə Azərbaycan SSR Əməkdar müəllimi fəxri adı verilmişdir.

## Əfəndiyev Şakir Tahir oğlu



1922-ci ildə anadan olub. Şəki Pedaqoji Texnikumunu bitirdikdən sonra Qax məktəblərində müəllimlik etmiş, 1939-cu ildə hərbi xidmətə çağırılmışdır. Moskvada komandirlər məktəbində oxumuş, Böyük Vətən Müharibəsində şərəfli bir yol keçmişdir.

Şakir Əfəndiyevin döyüş xidmətləri yüksək qiymətləndirilmiş, «Qızıl ulduz» ordeni, «İgidliyə görə» medalı və digər medallarla təltif edilmiş, kapitan rütbəsində, rota komandiri olmuşdur. O, rus, alman, gürcü, fars və ləzgi dillərində sərbəst danışırdı.

Müharibədən sonra qiyabi yolla ali təhsil almış, Qax rayon müəllimləri onu həmkarlar təşkilatı rayon Komitəsinin sədri seçilmişlər.





## Məmmədov Akif Yaqub oğlu



1983-cü il məzunu.

1983-cü ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) tarix fakültəsini bitirib. 1986-cı ildən kolxoz komsomol kamitə katibi, sonra kolxoz partiya komitə katibi, daha sonra isə Oğuz Rayon İcra Hakimiyyətində baş məsləhətçi vəzifəsində çalışıb.

1996-cı ildən Oğuz Rayon Əhalinin Sosial Müdafiəsi Mərkəzinin direktoru vəzifəsində işləyir.

## Abdullayeva Binyət İbrahim qızı



1950-ci il məzunu.

1954-cü ildə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU-nin) «Azərbaycan dili, məntiq və psixologiya» fakültəsini bitirib. Müəllimlik fəaliyyətinə Yevlax rayonunda başlayıb. Sonralar Şəki rayonunun Suçma kənd orta məktəbində direktor, Şəhər komsomol komitəsində II katib işləmişdir.

B.Abdullayeva 1961-cı ildən 1988-ci ilə qədər Şəki Pedaqoji Məktəbində pedaqogika və psixologiya fənlərindən dərs demişdir.

## Allahverdiyev Mustafakamal Hacıbala oğlu



1929-cu ildə Şəki şəhərində anadan olub. 1951-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) fizika-riyaziyyat fakültəsini bitirib. 1951-1954-cü illərdə Nuxa Dövlət Müəllimlər İnstitutunda baş müəllim kimi riyaziyyatdan dərs deyib.

NDMİ bağlandıqdan sonra ömrünün sonuna kimi Şəki Təhsil şöbəsində müxtəlif vəzifələrdə çalışmışdır.

1967-1972-ci illərdə Şəki şəhər Xalq Maarif şöbəsində müdir, 1972-1974-cü illərdə şəhər 17 nömrəli məktəbdə, 1974-1989-cu illərdə şəhər 20 nömrəli məktəbdə direktor, 1989-1991-ci illərdə yenidən Şəki Təhsil şöbəsində müdir, 1991-ci ildən isə Şəki şəhər və rayon təhsil şöbələri birləşdikdən sonra ömrünün sonuna qədər təhsil şöbəsində metodmərkəzin müdiri olmuşdur.

## Rəsulov Hüseyn Bəxtiyar oğlu



1941-ci il məzunu.

3 il döyüşən orduda olub, aldığı ağır yaradan sonra tərxis olunub, Nuxa Dövlət İkiillik Müəllimlər İnstitutunu bitirib. Bütün həyatı boyu müəllimliklə məşğul olub. 30 ilə yaxın 6, 10 nömrəli məktəblərdə dərs hissə müdiri, direktor, rayon və şəhər maarif şöbələrində müdir vəzifələrində çalışmışdır.





Hüseyn Rəsulovun əməyi dövlət tərəfindən yüksək qiymətləndirilmiş, respublikanın «Əməkdar müəllimi» və «Qabaqcıl maarif xadimi» kimi fəxri adlara layiq görülmüşdür.

H.Rəsulovun Lütvəli Həsənovla birlikdə yazdığı «Bağışla məni, əzizim» adlı dram əsəri Şəki Dövlət Dram Teatrının səhnəsində müvəffəqiyyətlə tamaşaya qoyulmuşdur.

## Həsənbəyov Məmməd Məmmədəli oğlu



Əvvəlcə Şəki Pedaqoji Məktəbinin məzunu olub.

1951-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Fizika-riyaziyyat fakültəsini bitirərək təyinatla Nuxa Dövlət Müəllimlər İnstitutuna göndərilib.

M.Həsənbəyov sonralar şəhər 8,11,2 və 10 №li məktəblərində müəllim işləyib.

## Mustafayev Mustafa Çələbi oğlu



1928-ci il məzunu.

1938-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Dil və Ədəbiyyat fakültəsini bitirib. Əvvəllər Oxud və Kiş məktəblərinə, sonralar şəhər 2 və 11 saylı məktəblərinə rəhbərlik etmiş, Şəki Pedaqoji Məktəbində müxtəlif vəzifələrdə çalışmışdır.

M.Mustafayevin səmərəli pedaqoji fəaliyyəti yüksək qiymətləndirilmiş, 1954-cü ildə «Qırmızı əmək bayrağı» ordeni, 1962-ci ildə «Qabaqcıl maarif xadimi» döş nişanı ilə təltif edilmişdir. Böyük Vətən Müharibəsi cəbhəsindəki iştirakına görə də bir sıra orden və medallarla təltif edilmişdir.

## Yusifzadə Mahtəban Əhməd qızı



1912-ci ildə Nuxada (Şəkidə) anadan olub.

Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU-ni) Filologiya fakültəsini bitirəndə ona təhsil aldığı ali təhsil ocağında baş müəllim vəzifəsi təklif edilsə də, o, doğma yurduna qayıdaraq bütün mənalı ömrünü, bilik və bacarığını Şəki Pedaqoji Məktəbində müəllim kadrlarının hazırlanmasına sərf etmişdir.

Mahtəban Yusifzadənin əməyi dövlət tərəfindən yüksək qiymətləndirilmiş, Azərbaycan Respublikasının «Əməkdar müəllim»i fəxri adına və «Qabaqcıl maarif xadimi» döş nişanına layiq görülmüşdür.

M.Yusifzadə «Əmək veteranı», həm də fərdi təqaüdçü idi.





## Müəllimlər sülaləsi

Şəki rayonunun Kiş kəndində yaşayıb fəaliyyət gösrərən müəllimlər sülaləsinin üst-üstə 1400 ildən çox pedaqoji stajı var.



***Hüseyn Əfəndi Kişli (ortada), qardaşları Seyid Əfəndi (solda) və Həsən müəllimlə birlikdə***

Hacı İsaq Əfəndi Qarayev ilk dəfə olaraq Kiş kəndində dini məktəb açmış, yaşadığı dövrə məxsus təlimlə məşğul olmuşdur. Onun övladları da atalarının yolu ilə gedərək müəllimlik sənətinə yiyələnmişlər.

Hacı İsaq Əfəndinin oğlu Hüseyn Qarayev Türkiyənin İstanbul şəhərində təhsil almışdır. Hüseyn Qarayev Türkiyədə müəllimlik sənətinə yiyələndikdən sonra doğma kəndinə qayıtmış, 1928-ci ildə kənd əhalisini səfərbər edərək Kiş kəndindəki 6№-li məktəbi iməcilik yolu ilə inşa etdirmişdir. Məktəbin ilk direktoru Hüseyn müəllimin qardaşı Məmməd Qarayev olmuşdur. Hüseyn Qarayev özü isə Nuxa Pedaqoji Texnikumunda müəllimlik etmiş, sonra isə şəhərdə yerləşən 5№-li məktəbə direktor təyin edilmişdir.

Məmməd Qarayev 1937-ci ildə İnstitutu bitirdikdən sonra Göyçay rayonunda əvvəlcə dərs hissə müdiri, məktəb direktoru, sonra isə Göyçay rayonunda Maarif Şöbəsinin müdiri işləmiş, xeyriyyəçiliklə məşğul olmuşdur. Üzeyir Hacıbəyov, Müslüm Maqomayev dəfələrlə Qarayevlər ailəsinin qonağı olmuşlar.

Məmməd Qarayev Səməd Vurğunla da dostluq edirdi. Müharibədən sonrakı illərdə S.Vurğun dəfələrlə Kiş kəndində Qarayevlərin qonağı olmuş, kənd camaatı ilə görüşmüş, hətta ova da getmişdilər.

Hüseyn Qarayev 1944-cü ildə dünyasını dəyişib. O öləndə pencəyinin döş cibindən iki qara kağız tapılmışdı, oğlanlarının idi. Oğlu Acar Qarayev Stalinqrad, Fərrux Qarayev isə Mozdok uğrunda gedən döyüşlərdə həlak olubmuş. O, bu xəbərləri heç kəsə deməmiş, ancaq o qara kağızları ürəyinin başında əzizləyə-əzizləyə gəzdiribmiş.





Hüseyn Qarayevin dəfni Kiş kəndində üc müəllimin dəfni kimi – atanın və iki cəbhəçi oğlunun dəfni kimi yas verilmişdi

Moskvanın «Molodaya qvardiya» nəşriyyatının buraxdığı «Bolşoy pedsovet» adlı kitabında sülalənin ənənələri haqqında maraqlı oçerk verilmişdir.

Sülalə üzvləri 1983-cü ildə müəllimlərin Moskvada keçirilən Ümumittifaq toplantısında respublikamızı təmsil etmişlər.

Nəvəsi Müzəkkir Qarayev isə Kiş kəndindəki indiki Heydər Əliyev adına 6№-li məktəbin milli öndərimizin tapşırığı və bilavasitə nəzarəti ilə tikintisinə nail olmuşdur.

Sülalə üzvləri yalnız müəllimlik peşəsini seçməklə kifayətlənməmişlər. Onların arasında həkimliyi, ipəkçiliyi, mühəndisliyi və digər peşələri özlərinə sənət seçənlər də var.

Müəllimlər sülaləsinin əksəriyyəti hal-hazırda Kiş kəndindəki məktəblərdə pedaqoji fəaliyyətlərini davam etdirirlər. Onlardan 23 nəfəri Şəki Pedaqoji Texnikumunun məzunlarıdır.

| Sıra №-si | Soyadı, adı və atasının adı | İxtisası | İş stajı |
|---|---|---|---|
| 1 | 2 | 3 | 4 |
| 1. | Hacı İsaq Əfəndi Qarayev | Dini təhsil | |
| 2. | Qarayev Hüseyn İsaq oğlu | İstanbulda müəllimlik oxuyub | 30 il |
| 3. | Qarayev Seydi İsaq oğlu | Dini təhsil | 40 il |
| 4. | Qarayev Həsən İsaq oğlu | Sinif müəllimi (ŞPT) | 28 il |
| 5. | Qarayev Məmməd İsaq oğlu | Sinif müəllimi (ŞPT) | 35 il |
| 6. | Qarayeva Zülfü İsaq qızı | Dini təhsil | 30 il |
| 7. | Qarayev Əjdər Hüseyn oğlu | Sinif müəllimi (ŞPT) | 2 il |
| 8. | Qarayeva Fatma Hüseyn qızı | Tarix | 44 il |
| 9. | Yusifov Əyyub Qaffar oğlu | Ədəbiyyat | 46 il |
| 10. | Qarayeva Zivər Hüseyn qızı | Sinif müəllimi (ŞPT) | 42 il |
| 11. | Qarayeva Fəridə Seydi qızı | Sinif müəllimi (ŞPT) | 1 il |
| 12. | Qarayeva Dilşad Seydi qızı | Sinif müəllimi (ŞPT) | 51il |
| 13. | Qarayev Müzəkkir Seydi oğlu | Kimya-biologiya (ŞPT) | 45 il |
| 14. | Qarayeva Məryəm Bəxtiyar qızı | Tərbiyəci müəllim, ali | 24 il |
| 15. | Qarayeva Xuraman Bəxtiyar qızı | Ped-psixoloq | 21 il |
| 16. | Qarayeva Şərafət Sabir qızı | Sinif müəllimi (ŞPT) | 32 il |
| 17. | İslamov Səbuhi Vahid oğlu | Musiqi | 20 il |
| 18. | İslamova Günel Səbuhi qızı | Sinif müəllimi, ali | |
| 19. | İslamova Aysel Səbuhi qızı | Sinif müəllimi, ali | |
| 20. | Mirzəyev Abdulkərim Süleyman oğlu | Sinif müəllimi (ŞPT) | 35 il |
| 21. | Feyzullayev Təmraz Cumay oğlu | Sinif müəl.(ŞPT), Riyaziyyat | 65 il |



| 1 | 2 | 3 | 4 |
|---|---|---|---|
| 22. | Feyzullayev Məntiq Təmraz oğlu | Riyaziyyat | 31 il |
| 23. | Feyzullayev Cumay Məntiq oğlu | Bədən tərbiyəsi | 5 il |
| 24. | Vəliyev Nadir Yusif oğlu | Fizika | 16 il |
| 25. | Kərimiv Vüqar Nəzir oğlu | Kimya-biologiya | 15 il |
| 26. | Qarayeva Afət Tofiq qızı | Ped-psixologiya | 12 il |
| 27. | Qarayev Nüsrət Məmməd oğlu | Biologiya | 46 il |
| 28. | Qarayeva Gülçin Nüsrət qızı | | 14 il |
| 29. | Qarayeva Aynur Nüsrət qızı | Rus dili | 12 il |
| 30. | Yusiova Nigar Əyyub qızı | Sinif müəllimi (ŞPT) | 40 il |
| 31. | Yusifova Zülxumar Əyyub qızı | Sinif müəllimi (ŞPT) | 39 il |
| 32. | Muradov Qüdrət Quzu oğlu | Fransiz dili | 37 il |
| 33. | Yusifov Qaffar Əyyub oğlu | Ədəbiyyat | 31 il |
| 34. | Yusifova Sevda Famil qızı | Ədəbiyyat | 31 il |
| 35. | Musayev Elxan Əhməd oğlu | Ədəbiyyat (ŞPT) | 39 il |
| 36. | Musayeva Xatirə Əhməd qızı | Coğtafiya | 22 il |
| 37. | Baxışova Bahirə Ramis qızı | Sinif müəllimi (ŞPT) | 42 il |
| 38. | Kərimiv Cumay Zahid oğlu | Riyaziyyat | 39 il |
| 39. | Kərimov Zeynal Cumay oğlu | Riyaziyyat | 9 il |
| 40. | Kərimov Laçın Cumay oğlu | Riyaziyyat | 8 il |
| 41. | Kərimova Günel Ziyad qızı | Riyaziyyat | 6 il |
| 42. | Kərimova Xəyalə Elmar qızı | Coğrafiya | 2 il |
| 43. | Baxışov Anar Ramis oğlu | Rus dili | 15 il |
| 44. | Baxışova Aygün Aydın qızı | Riyaziyyat | 12 il |
| 45. | Muradova Tahirə Qüdrət qızı | Sinif müəllimi (ŞPT) | |
| 46. | Qarayeva Sevda Müzəkkir qızı | Sinif müəllimi (ŞPT) | 17 il |

| 1 | 2 | 3 | 4 |
|---|---|---|---|
| 47. | Qarayev Elçin Müzəkkir oğlu | Kimya-biologiya | 15 il |
| 48. | Qarayeva Aynur Əjdər qızı | Biologiya | 11 il |
| 49. | Qarayeva İradə Müzəkkir qızı | Sinif müəllimi | 15 il |
| 50. | Feyzullayeva Alagöz Məntiq qızı | Sinif müəllimi (ŞPT) | 10 il |
| 51. | Məmmədov Gülməmməd Gülü oğlu | Ədəbiyyat | 50 il |
| 52. | Məmmədova Türkan Gülməmməd qızı | Sinif müəllimi | 15 il |
| 53. | Bayramova Afət Binyamin qızı | Fizika | |
| 54. | Bayramova Ülkər Binyamin qızı | Əmək təlimi (ŞPT) | |
| 55. | Əhmədova Aynur Qurban qızı | Sinif müəllimi (ŞPT) | |
| 56. | Əhmədova Samirə Qurban qızı | Sinif müəllimi (ŞPT) | 1 il |
| 57. | Muradova Sevinc Qüdrət qızı | Sinif müəllimi | 2 il |
| 58. | Muradova Dinar Nazim qızı | Xarici dil | |
| 59. | Əfəndiyeva Vüsalə Çingiz qızı | Sinif müəllimi (ŞPT) | 10 il |
| 60. | Qarayeva İlhamə Ənvər qızı | Riyaziyyat | 10 il |
| 61. | Yusifova Tangiz Ramiz qızı | Sinif müəllimi (ŞPT) | |
| 62. | Mabudova Natəvan Nəzir qızı | Sinif müəllimi (ŞPT) | 10 il |
| 63. | Qarayev Vasif Malik oğlu | Tarix | 1 il |
| 64. | Yusifova Ülviyyə Qaffar qızı | Xarici dil | 1 il |
| 65. | Abdullayeva Zemfira Qurban qızı | Ədəbiyyat | 1 il |
| 66. | Məmmədova Gövhər Məmməd qızı | Ədəbiyyat | 10 il |





## Süleymanov Saleh Yusif oğlu



1923-cü ildə Nuxa rayonunun Təpəcənnət kəndində ziyalı ailəsində anadan olub.

1941-ci ildə Nuxa Pedaqoji Məktəbini bitirib.

1941-ci ilin yanvarında ordu sıralarına çağrılıb. 1945-ci ildə müharibə başa çatdıqdan sonra ordu sıralarından tərxis olunub.

1945-ci ildən 1954-cü ilə qədər rayonun Təpəcənnət, Şirinbulaq məktəblərində müəllim və direktor işləyib.

1960-cı ildə indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinin fizika-riyaziyyat fakültəsini bitirib.

1963-cü ildən 1970-ci ilədək Cəfərabad kənd orta məktəbinin direktoru olmuş, sonralar partiya və sovet orqanlarında çalışmışdır.

İkinci Dünya Müharibəsində bir sıra orden və medallarla təltif edilmişdir.

## Bədəlov Əhməd Abdu oğlu



1956-cı il məzunu.

1970-ci ildə indiki Bakı Dövlət Universitetinin geoloji- coğrafiya fakültəsini bitirib.

1975-ci ildən 2002-ci ilədək Təpəcənnət kənd əsas məktəbində direktor işləyib.

Hazırda da pedaqoji fəaliyyətini davam etdirir.

## Məmmədov Bəhərçin Mehdi oğlu



1954-cü il məzunu.

1971-ci ildə indiki Gəncə Dövlət Pedaqoji Universitetini bitirib.

Hərbi xidmətdən əvvəl Sabirabad rayonunun Qasımbəyli kəndində, ordu sıralarından tərxis edildikdən sonra isə Şəki rayonunun Suçma və Təpəcənnət kənd məktəblərində müəllim işləyib.

İndi də pedaqoji fəaliyyətini davam etdirir.

## Yusifov Nazim Ulubəy oğlu



1949-cu ildə Şəki rayonunun Oravan kəndində anadan olub. 1968-ci ildə Şəki Pedaqoji Məktəbini bitirib.

1972-ci ildən Sumqayıt şəhərində yaşayır və pedaqoji fəaliyyətini davam etdirir. N.Yusifov sonralar Azərbaycan Dövlət Pedaqoji Rus dili və Ədəbiyyatı (indiki Azərbaycan Slavyan Universiteti) İnstitutunu bitirmişdir.

1988-ci ildən Sumqayıt şəhərinin ən böyük məktəblərindən biri olan 35 №li məktəbin direktoru vəzifəsində işləyir.

Üç qızı var, hər biri ali təhsillidir.





## Mikayılzadə Ənvər İsmayıl oğlu



1951-ci il məzunu.

1933-cü ildə Şəki şəhərində ziyalı ailəsində anadan olub. Şəhər 4 nömrəli məktəbi, Nuxa Pedaqoji Texnikumunu, Bakı Dövlət Universitetinin jurnalistika fakültəsini və Ali Partiya məktəbini fərqlənmə diplomu ilə bitirmişdir.

Şəki Şəhər Partiya Komitəsində texniki katib, katib köməkçisi, təlimatçı, partiya komissiyasının sədri, «Lenin bayrağı» qəzetinin məsul katibi, «Şəki fəhləsi» qəzetinin redaktoru, «Vışka» qəzetinin və AzərTAc-ın bölgə müxbiri, Şəki Kənd Təsərrüfatı Texnikumunda direktor müavini vəzifələrində çalışmışdır.

Ə.Mikayılzadənin əməyi yüksək qiymətləndirilmiş, 4 may 1990-cı il tarixdə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanı ilə təltif edilmiş, Azərbaycanın «Əməkdar jurnalisti» fəxri adına layiq görülmüşdür.

2009-cu ildə Şəkidə vəfat etmişdir.

## Qaffarov Xalid Məmməd oğlu



1951-ci il məzunu.

1950-ci ildən Aşağı Küngüt yeddiillik məktəbində sinif müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1953-cü ildən 1954-cü ilə kimi Çapağan ibtidai məktəbinə müdir və müəllim təyin edilmiş, 1954-cü ildən 1962-ci ilədək Aşa-

ğı Küngüt kənd yeddiillik məktəbində coğrafiya müəllimi (o sonradan Azərbaycan Dövlət Pedaqoji Universitetinin coğrafiya fakültəsini bitirmişdir) işləmişdir.

X.Qaffarov sonralar Aşağı Küngüt kənd yeddiillik məktəbində dərs hissə müdiri, Baş Zəyzid kənd səkkizillik məktəbində, 5 nömrəli fəhlə-gənclər məktəbində direktor işləmişdir.

1972-ci ildən 1979-cu ilədək Şəki şəhər Xalq Maarifi Şöbəsinin məktəblər üzrə inspektoru vəzifəsində çalışmışdır.1979-cu ildən isə ömrünün sonuna qədər şəhər 17 nömrəli məktəbdə direktor vəzifəsində işləmişdir.

Bir sıra medal və fəxri fərmanlarla təltif edilmişdir.

## Qəhrəmanov Abbas Alxas oğlu



1926-cı ildə Şəki rayonunun Aşağı Küngüt kəndində anadan olub.

1938-1941-ci illərdə Nuxa Pedaqoji Məktəbində, 1948-1952-ci illərdə Nuxa Dövlət Müəllimlər İnstitutunda, 1954-1958-ci illərdə isə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunda oxuyub.

1941-ci ildə Nuxa Rayonu Çapağan kənd ibtidai məktəbində müəllimlik fəaliyyətinə başlamış, 1943-cü ildə könüllü olaraq cəbhəyə getmiş, 1945-ci ilin mayına kimi Böyük Vətən Müharibəsində 33-cü ordunun 757-ci atıcı alayında bölmə komandiri olub. Döyüşlərdə göstərdiyi şücaətlərə görə «Qırmızı Bayraq Ordeni», «Böyük Vətən Müharibəsində Almaniya üzərində Qələbə» medalı «1941-1945-ci illər Böyük Vətən Müharibəsində qələbənin 30,40,50,60-cı illiyi» Yubiley me-





dalları, «Vətən Müharibəsi Ordeni» və digər medallarla təltif edilib.

Hərbi Xidmətdən Tərxis edildikdən sonra 26.12.1945-ci ildən Aşağı Küngüt kənd yeddiillik məktəbinə direktor təyin edilib və bu vəzifədə 1979-cu ilədək fasiləsiz fəaliyyət göstərib.

1979-1982-ci illərdə Şəki Kənd Təsərrüfatı Texnikumunun direktoru vəzifəsində işləyib.

1982-1987-ci illərdə Şəki Şəhər 3 saylı orta məktəbinin direktoru olub, 1987-1993-cü illərdə Azərbaycan Tarixi Mədəniyyət Abidələrinin qorunması cəmiyyətinin Şəki şöbəsinin məsul katibi vəzifəsinə təyin edilib.

1993-1997-ci illərdə Şəki rayon Öryət məktəbinin, 1997-2000-ci illərdə Çeşməli kənd orta məktəbinin direktoru olub.

Abbas Qəhrəmanov pedaqoji fəaliyyətlə yanaşı, ictimai işlər də aparmışdır. Buna görə də Azərbaycan Respublikası Ali Sovetinin Fəxri Fərmanları ilə təltif edilib.

Şərəfli bir ömür yaşamış Abbas müəllim 26 iyun 2008-ci il tarixində ömrünün müdrik çağında dünyasını dəyişmişdir.

## Əyyubov Sabir Cabbar oğlu



1929-cu ildə Şəki şəhərində anadan olub.

1943-1947-ci illərdə Şəki Pedaqoji Məktəbində, 1947-1949-cu illərdə Nuxa Dövlət ikiillik Müəllimlər İnstitutunda təhsil alıb.1956-cı ildə Azərbaycan Pedaqoji İnstitutunun tarix fakül-

təsinə daxil olub, 1960-cı ildə müvəffəqiyyətlə təhsilini başa vurub.

1 sentyabr 1960-cı ildən Şəki rayonunun Şirinbuılaq kənd məktəbinə direktor təyin olunub. Sabir Əyyubov bütün mənalı ömrünü müqəddəs müəllimlik peşəsinə həsr edib.

Əməyi yüksək qiymətləndirilib. Respublikanın «Əməkdar müəllimi», «Əmək veteranı» fəxri adlarına layiq görülüb, «Qabaqcıl maarif xadimi» döş nişanı və bir sıra medallarla təltif olunub.

1988-ci ildə vəfat edib.

## Məmmədova Ədilə Səttar qızı



1943-cü il məzunu.

1974-cü ildə namizədlik dissertasiyası müdafiə etmiş, alimlik dərəcəsi almışdır. 1991-ci ildən Bakı Dövlət Universitetinin «Xarici ölkələrin iqtisadi və siyasi coğrafiyası» kafedrasında dosent vəzifəsində çalışır. 20-ə yaxın məqalə, o cümlədən, şərqşünaslıq fakültəsi tələbələri üçün «Türkiyə, İran və Əfqanıstanın coğrafiyası» dərs proqramlarını tərtib və çap etdirmişdir.

«Əmək veteranı» medalı ilə təltif olunub.





## Çələbiyev Məmməd Musa oğlu



1940-cı il məzunu.

Məmməd Çələbiyev 1956-cı ildə ədəbiyyata gəlmişdir. «Qızlar bəzək sevir», «Təmkin» povestlərinin, «Bir yay günü», «Zoğal ağacları», «Haronnaya gəlin gəlir» əsərlərinin, «Hökm», «Fədai» və «Yaşıl işıq» dramlarının müəllifidir.

# IX bölmə

## Ötən günlərin marağında-
## Şirin xatirələr sorağında

### Bir məktubun tarixçəsi

*Arxiv materiallarını araşdırarkən 1970-ci ildə yazılmış və texnikuma ünvanlanmış bir yazı diqqətimizi çəkdi və nəfəs dərmədən onu oxuduq. Xatirələrinin, səmimiyyətinin və texnikuma olan sevgisinin işığında yazan Xəlilov Sadəddin Əhməd oğlunun qeydlərini nöqtə və vergülünə belə toxunmadan oxucuların diqqətinə təqdim edirik.*

Mən Xəlilov Sadəddin Əhməd oğlu, 1910-cu ildə Şəki şəhərində anadan olmuşam. Şəki seminariyasının IV buraxılışını (43 il bundan qabaq) 1927-28-ci tədris ilində bitirmişəm. Şəki seminariyasını (indiki pedaqoji məktəbin) 50 illiyi münasibətilə bu xatirələrimi yazıram.

Bizim buraxılış 30 nəfərdən ibarət idi. Bunlardan 20 nəfəri oğlan, 10 nəfəri isə qız idi. Biz qurtaran ili qız seminariyası ilə oğlan seminariyası/ darülmüəllimin ilə darülmüəllimat/ birləşmişdi, həmin illər məktəbimiz müttəhid Pedaqoji texnikumu adlanırdı. Bu nöqteyi-nəzərdən də bizi qız-oğlan seminariyasının 1-ci buraxılışı adlandırdılar. Bir nəfər xəstə yoldaşımız olmaqla, yerdə qalan 29 nəfərin hamısı könüllü olaraq sabiq Şamaxı, Göyçay, Ağdaş, Şəki və Zaqatala qəzalarının kəndlərinə işə getdik. O zaman şəhər və kənd məktəblərində dərs deyənlərin çoxu pedaqoji





kursları bitirmiş müəllimlər idi. Orta təhsilli müəllimlərə çox ehtiyac vardı.

### 1. Özüm haqqında

1928-ci ildən indiyə qədər 43 il müəllimlik etmişəm. Kənd ibtidai məktəbindən pedaqoji institutuna qədər hazırda M.F.Axundov adına Pedaqoji Dillər İnstitutunda Azərbaycan dilçiliyi kafedrasında dosent vəzifəsində işləyirəm.

Son illər ağır xəstəlik keçirdiyimdən elmi-tədqiqat işimi davam etdirə bilməmişdim. Gec olsa da filoloji elmlər doktoru elmi dərəcəsini almaq üçün üzərində çoxdan bəri işlədiyim elmi işimi bu il tamamlamışam.

Böyük Vətən Müharibəsinin iştirakçısı olmuş və müxtəlif cəbhələrdə düşmənə qarşı vuruşmuşam. İndi yenə də ən çox sevdiyim şərəfli müəllimlik işini davam etdirirəm.

### 2. Məzun yoldaşlarım haqqında

Mənimlə birlikdə 1928-ci ildə seminariyanı qurtaranlardan:

1. Əsgərzadə Yusif Şirvan oğlu – şair, S.M.Kirov adına ADU-nun Şərq fakültəsinin dosenti;
2. Abbaszadə İslam – Bakının ali məktəblərində tarix müəllimi;
3. Əfəndizadə Lətif – əməkdar müəllim, Azərbaycan Maarif Nazirliyində şöbə müdiri;
4. Mustafazadə Məmməd – Elmlər Akademiyasının

Fizika İnstitutunda baş elmi işçi, fizka-riyaziyyat elmləri namizədi, dosent;

5. Paşazadə Mehralı – Bakının orta məktəbində riyaziyyat müəllimi;

6. Qədirzadə Əhəd – Şəki şəhər orta məktəblərində fizika müəllimi;

7. Əhmədzadə Cabbar – kimya elmləri namizədi, Azərbaycan Elmlər Akademiyasının Neft-Kimya Prosesləri İnstitutunda elmi işçi;

8. Şamxalov Məmməd – həkim, tibb xidməti podpolkovniki;

9. İsmayılov Məmməd – Şəki şəhər 1№-li orta məktəbin biologiya müəllimi;

10. Hacızadə Güllü – Təqaüdçü;

11. Salamzadə Saqibət – Təqaüdçü;

12. Yusifzadə Mahtaban – Şəki pedməktəbində müəllim;

13. Əhmədova Sitarə – Təqaüdçü;

14. Xəlilov Sadəddin – M.F.Axundov adına Dillər İnstitutunun dosenti, filoloji elmlər namizədi.

## 3. Məktəbimizin ölkə bə respublikamız daxilindəki mövqeyi və onun yetişdirmələri haqqında

1920-ci ildə Azərbaycanda Sovet hakimiyyətinin ilk illərində 8 seminariya təsis edilmişdir.

Onlardan ikisi Bakıda qız və oğlan seminariyaları, ikisi Qazaxda qız və oğlan seminariyaları: bu seminariya Firidun bəy Köçərlinin təşəbbüsü ilə məşhur Qori seminariyasının Azərbaycana köçürülmüş tatar şöbəsi əsasında yaranmışdır: ikisi Şuşada, ikisi isə darülmüəllimin və darülmüəllimat olmaqla Şəkidə açılmışdır.





Zəngin maddi bazası bina, kabinet, emalatxana, laboratoriya və təsərrüfat sahələri və yaxşı müəllim kollektivi etibarı ilə Şəki seminariyası, Hüseyin Cavidlərin, Abdulla Şaiqlərin, Azad bəy Əmirovların dərs dediyi Bakı seminariyasından sonra ikinci, bəzi sahələrdə isə bağçılıq, arıçılıq və kənd təsərrüfat sahələri etibarilə 1-ci yeri tutmuşdu.

Mənim yaxşı xatirimdədir ki, Bakıda, Qazaxda, Şuşada, sonralar isə Göyçay və Şamaxıda seminariya olduğu halda, çox ailələr bizim seminariyanın, müəllimlərimizin, xüsusən müdirimiz Rəcəb Əfəndizadənin ad-sanına, şöhrət və hörmətinə görə öz uşaqlarını oxutmaq üçün yüz kilometrlərlə uzaqda yerləşən Şəki seminariyasına göndərirdilər.

Şəki seminariyasının məzunları həmişə yüksək və dərin bilikləri etibarilə universitet və institut məzunları ilə bir səviyyədə durmuşlar. 1930-1932-ci illərə qədər hələ pedinstitutlar kifayət qədər ali təhsilli müəllim kadrları buraxa bilmədiyi dövrlərdə bizim məzunlar orta məktəbin VI-VII və yuxarı siniflərin VIII-IX-X siniflərində bütün fənlərdən dərs deyirdilər.

1925-1930-cu illərdə Şəki seminariyasının məzunlarını barmaqla göstərirdilər. Seminariyanın 1929-cu ilə qədərki məzunlarının çoxu indi respublikamızın ali məktəblərində, elmi-tədqiqat institutlarında və Azərbaycan Dövlət Universitetində baş elmi işçi, dosent, professor, kafedra və laboratoriya müdiri vəzifələrində işləyirlər.

Şəki seminariyası, öz məzunlarına nəinki dərin elmi-siyasi bilik, geniş məlumat vermiş, bu elm ocağı tələbələrə həm də təşkilatçılıq bacarığı və yüksək vərdişlər də aşılamışdır.

Bizdən yuxarı sinifdə III-IV əsaslarda oxuyan tələbələr özlərini o qədər təmkinli, yüksək dərəcədə mədəni apa-

rırdılar ki, biz onları müəllimlərimizdən fərqləndirmirdik. Onlar hətta növbətçi müəllim vəzifəsini aparır və dərsdən sonra bizimlə müxtəlif məşğələlər keçirirdilər.

Bizdən aşağı sinifdə oxuyan tələbələrdən Hacızadə Manaf, Rəhmanov Feyzi və Xasməmmədov Teyfur komsomol və tələbə təşkilatlarına rəhbərlik edirdilər. Teyfur Xasməmmədov hazırda pedaqoji institutda dekan və dosentdir və professor Əzəl Dəmirçizadə o zaman «Yeni Şələlə» adlı qəzetin redaktorları idi. Rəhmanov F., Hacızadə M., Xasməmmədov T., Rəhimli Əhməd uzun illər müxtəlif rayonlarda və respublikamızda maarif şöbə müdiri, Maarif Nazirinin birinci müavini vəzifəsində işləməklə, xalq maarifinə yaxşı rəhbərlik etmişlər. Axşamlar və dərsdənkənar vaxtlarda həmin təşkilatçı tələbələr məktəbi idarə etməkdə müdiriyyətə yaxından kömək edirdilər.

## 4. Müəllimlərimiz haqqında

1. Əfəndizadə Rəcəb – əvvələr darülmüəlliminin, sonralar isə 1927-28-ci illərdə müttəhid pedaqoji texnikumunun ilk direktoru və banisi.
2. Xəlifəzadə Məmmədəli – müdir vəkili, tədris hissə müdiri, sonralar vəfatına qədər M.Əzizbəyov adına NKİ-da dilçilik kafedrasının müdiri, filoloji elmlər namizədi, dosent olmuşdur.
3. Hacızadə Əşrəf – coğrafiya müəllimi
4. Bayramzadə Mahmud – Məmmədzadə Məmməd, Əfəndizadə Əbdürrəşid kimya-biologiya müəllimlərimiz, sonralar isə universitet və institutların dosentləri, kimya-biologiya elmləri namizədləri olmuşlar.
5. Rəşid bəy Əfəndiyev və Alnikov – rus dili müəllimlərimiz ölkəşünaslıq və rus dili dərnəklərinə rəhbərlik edirdilər.
6. İbrahimbəyli İbrahim və Nəcəfqulubəyov Nəsir – riyaziyyat müəllimlərimiz.
7. Bayramzadə Əhməd və Hacızadə Musa – dil və ədəbiyyat müəllimlərimiz.
8. Cabbarzadə Mustafa – Fizika müəllimimiz.
9. Əlizadə Mahtac xanım və Paşabəyov Abdulla – botanika və kənd təsərrüfatının əsasları fənləri müəllimlərimiz.
10. Qazizadə Saleh – tarix müəllimimiz, hazırda professordur, EA Arxeologiya İnstitutunda şöbə müdiridir.

*Xəlilov Sadəddin Əhməd oğlu*
*1927-1928-ci il məzunu*


İşıq məbədi

# Mənim doğma texnikumum

*Qatarından ayrılan*
*Durnalara döndük biz,*
*Sakit baxışlar ilə*
*Danışdıq biz, dindik biz*
*Məktəbdən ayrılanda...*

Doğma məktəb... insan həyatının ən gözəl günləri, qayğısız illəri, məhz bu dövrə təsadüf edir.

İlk dəfə ayaq açan bir uşaq kimi kövrək qədəmlərini məktəbə basan bir şagird... Qəlbi təmiz, beyni təmiz, saf su kimi, ağ vərəq kimi bir uşaq... Altı yaşlı bir çocuq çəkinə-çəkinə müəllimin üzünə baxıb, onun hər kəlməsini diqqətlə dinləyən və hər bir hərəkətini min bir maraqla izləyən körpə bir varlıq... və onun əksi olaraq gələcəyə inam vəd edən cəsarətli addım səsləri, ılıq və mehriban bir baxış – hər körpənin qəlbinə yol tapmağa can atan, hər şagirdin gələcək taleyi üçün narahat olan qayğıkeş bir insan... İstər cavan olsun, istərsə yaşlı – fərqi yoxdur. Onu yalnız bir şey narahat edir: şagirdlərinin düzgün təlim-tərbiyəsi...

O, asta addımlarla sinif otağında gəzişir, şagirdlərinin cızdığı hər bir xəttə, yazdığı hər bir rəqəmə diqqətlə baxır, kimisinin əlindən tutub yazdırır, kimisinə izahat – düzgün istiqamət verir. Birinin səhvini düzəldir, birini tərifləyir...

Bu kimdir?

– İbtidai sinif müəllimi... Fidan balalara ilk dəfə qələm tutmağı öyrədən, «a» hərfini, «ana» sözünü, «Vətən» kəlməsini yazdıran ibtidai sinif müəllimi... Şəki Pedaqoji Texnikumunun məzunu... Bu texnikumda özünə əbədi və müqəddəs bir həyat yolu seçmiş ibtidai sinif müəllimi...

Bu gün Azərbaycanda ibtidai siniflər üçün müəllim kadrları hazırlayan onlarla ali və orta ixtisas məktəbləri fəaliyyət göstərir. Ancaq ibtidai sinif müəllimi dedikdə mənim gözlərim önündə Şəki Pedaqoji Texnikumu – mənim doğma texnikumum gəlib dayanır...

Mənim doğma texnikumum, sən bugünkü tələbələrinin də qəlbinin odusan, könlünün, arzularının atəşisən. Sən kainata həyat bəxş eləyən, öz nurunu doğma yurdumuzun hər tərəfinə səpələyən bir günəşsən. Sən bir çeşməsən – dağların, sal qayaların daşlarını göz-göz eləyib axan çeşmə – uşaq təbəssümü kimi təmiz, şəffaf bir çeşmə...

Sən bu gün bizim görən gözümüz, düşünən beynimiz, həyat yollarında addımlamaq üçün bizi hazırlayan bir nur beşiyisən – bizim həmişə doğma və əziz olan təhsil ocağısan – doğma pedməktəbimizsən.

Müəllimlər müəllimi – doğma texnikumum mənim! Sən bir zamanlar məni və bacımı da eyni ildə öz qoynuna aldın, eyni ildə də ibtidai sinif müəllimi kimi həyata yola saldın. Bu, 1983-cü il idi. Mən də, bacım da bu texnikumdan, həyata atılmışıq. Doğma texnikumun sinif otaqlarından mehriban, gülərüz müəllimlərindən ayrılmağımızdan nə az, nə çox – düz 27 il keçir. Ancaq yenə də o doğma texnikum həmənki kimi yaddaşımızdan boylanır.

Mənə elə gəlir ki, mən yenidən doğulsaydım orta məktəbi qurtaran kimi yenə də sənədlərimi Şəki Pedaqoji Texnikumuna verərdim. Yenə də bu texnikumun məzunu olmaq, ibtidai sinif müəllimi olmaq istəyərdim. Bu peşə və Şəki Pedaqoji Texnikumunda təhsil almaq, onun məzunu olmaq mənim alın yazımdır. Mən bu alın yazıma görə də

Allahıma borcluyam və həyatımdan yerdən -göyə qədər razıyam.

Qayğılı-qayğısız günlərimizin şahidi olan, bizə doğru yol göstərən, əziz texnikumum!

Qarşıdan sənin 90 illik yubileyin gəlir. Bu yubiley münasibətilə texnikumun bütün müəllim və tələbələrini ürəkdən təbrik edirəm və bir də arzu edirəm ki, heç vaxt başın üzərindən qara yellər əsməsin, qara buludlar çaxmasın. Sinif otaqlarında müəllim və tələbələrin zəng səsindən diksinməsinlər.

Qarşıdan gələn bayramın mübarək, mənim doğma texnikumum!



*Sevda Fərzəliyeva*
*1983-cü il məzunu*





## Birincilərdən biri

Mən Şəki Pedaqoji Texnikumunun ilk buraxılış məzunlarındanam. 1920-1925-ci illərdə həmin texnikumda oxumuşam.

Şəkidə seminariya təşkil olundu. Məndə həmin məktəbdə oxumaq arzusu oyandı. Müxtəlif iqtisadi çətinliklərə baxmayaraq bu arzuma nail oldum.

Şəki Pedaqoji Texnikumu özünün maraqlı hadisələri və gözəl ənənələri ilə heç yadımdan çıxmır. Bu hadisələrdən biri ictimai və dövlət xadimi, təbib, yazıçı və dramaturq Nəriman Nərimanovun biz seminariya tələbələrinin görüşünə gəlməsi və bizimlə etdiyi mehriban, səmimi söhbətidir.

Texnikumun müəllimləri ilə tələbələri arasında qeyri-adi səmimiyyət var idi. O dövrün görkəmli müəllimlərindən Rəcəb Əfəndi, Məmmədəli Əfəndi, Mabud Əfəndi, Əhməd Əfəndi bizə atalıq qayğısı göstərirdilər. Onları mən heç bir zaman unutmaram.

Seminariya bizə elə təsir göstərmişdir ki, biz müəllimə, müəllimliyə, müəllimlə əlaqədar olan bütün varlığa ülvi bir şey kimi baxırdıq. Onu da qeyd edim ki, Şəki Pedaqoji Texnikumuna və ümumiyyətlə müəllimliyə bu münasibətim olduğu kimi qalmaqdadır.

Tələbənin sevincinə, kədərinə şərik olmaq, onu hər addım izləmək seminariyada bir ənənəyə çevrilmişdir.

Seminariya bizə kollektivdə yaşamağı, işləməyi, müstəqil tədqiqat işi aparmağı, həyat təcrübəsi toplamağı öyrətdi, bizim, o cümlədən, mənim sonrakı istehsalat və elmi yaradıcılıq fəaliyyətimin əsasını, bünövrəsini qoydu. Buna görədir ki, mən sadəcə müəllimlikdən elmlər doktoru dərəcəsinədək yüksəlmişəm.

Bu gün mən də Şəki Pedaqoji Texnikumunun keçmiş məzunu kimi məktəbin bütün nailiyyətləri ilə fəxr edir, öz sevincimi pedaqoji və tələbə kollektivlərinin sevincinə qoşuram.Texnikumun müəllim kollektivinə gənc nəslin tərbiyəsi və müəllim ordusunun yetişdirilməsi işində yeni-yeni müvəffəqiyyətlər, can sağlığı arzu edirəm.

*Azərbaycan Elmlər Akademiyası*
*V.L.Komarov adına Nəbatat İnstitutunun əməkdaşı,*
*Biologiya elmləri doktoru, Ş.O.Barxalov,*
*11.12.1970-ci il*





## Bilalli həyatını bizim yolumuzda qurban verdi

Mən 1926-cı ildə Şəki Pedaqoji Texnikumun hazırlıq kursuna daxil olub, 1927-ci ildən birinci kursda oxumağa başlamışam. Həmin ildən məktəbdə tədris ilk dəfə olaraq yeni üsul, daltoi plan üsulu ilə keçirilməyə başlayır. Bu tədris metodu ümumi halda müvəffəqiyyət qazana bilmədisə də, bəzi tələbələrə sərbəst işləmə vərdişi verə bildi ki, bu da sonralar onların elmə yiyələnməklərində müəyyən dərəcədə müsbət rol oynadı. Mənim əldə etdiyim az-çox elmi nailiyyətlər də sıx surətdə Şəki Pedaqoji Texnikumunda aldığım təhsillə əlaqədardır.

Mən radio və televizorda «Tələbəlik illəri» mahnısını eşidərkən Bakıda keçirdiyim tələbəlik illərini deyil, həyatımı xoş təəssuratlarla zənginləşdirən Şəkidə keçirdiyim tələbəlik illərini xatırlayıram. Odur ki, Abid müəllim ilə görüşüm də mənə çox xoş təsir bağışladı və mən həmin illəri yada salaraq xeyli həyacanlandım.

Texnikumun tədris otaqları, yataqxana, gəzdiyimiz küçələr, çox mehriban və dərin biliyə malik olan Rəcəb Əfəndi, Hacıbala, Əhməd, Ədhəm, Ziya, Musa və Mustafa müəllim bir-bir xəyalımda canlandı.

Heç yadımdan çıxmaz: 1930-cu ildə bir dəstə quldur şəhəri zəbt etdikdə biz başsız qaldıq. Şəhər əhalisi tələbələri iki-bir, üç-bir öz evlərinə aparıb, ata-ana qayğısı ilə üç gün saxladılar. Mən ikinci gün məktəbə gəldikdə məktəbin müdir müavini 3-cü zavodun fəhləsi Bilallini orada gördüm. Biz yuxarı kurs tələbələri onu gizlətməyə çalışdıq. Lakin bizim səyimizə baxmayaraq o, heç yerə getməyib: «Mən sizi kimə tapşırıb gedim?» – deyə cavab verdi. 15-20 dəqiqə keçməmiş quldurlar gəlib onu apardılar. O, küçəni

dönərkən çevrilib bizə baxdı, gözlərini silib yoluna davam etdi. 10-15 dəqiqə sonra iki güllə səsi eşidildi: Biz ağladıq. Bilallı həyatını bizim yolumuzda qurban verdi.

*Azərbaycan Elmlər Akademiyası*
*Fizika İnstitutunun və Lenin adına*
*APİ- nin elmi şurasının üzvü,*
*Texnika elmləri doktoru, professor*
*Kərimov Ələkbər Məcid oğlu*
*Bakı şəhəri 1970-ci il*





## Şəki seminariyası haqqında xatirələr

Şəkidə darülmüəllimin 1920-ci ilin sentyabr-oktyabr aylarında Dadanovların evində açılmışdır. Əvvəllər dərslər qeyri müntəzəm keçirilirdi. Rəcəb Əfəndiyev, Xəlifəzdə M., Bayramzadə Ə., Hacıyev Ələşrəf, Qabilov Baba müəllimlərimiz idilər. Bu məktəbdə I-II ehtiyat qruppası, 1 əsas qruppası var idi. 70-80 uşaq oxuyurdu. Bir neçə ay sonra Əliyevlərin evinə köçdük. Məktəbdə oxuyan uşaqlar bütün Azərbaycan rayonlarından, Ermənistan və Gürcüstandan idilər.Yemək, paltarla çox yaxşı təmin edilirdik. Məktəbdə intizam, təlim- tərbiyə işi olduqca yaxşı təşkil olunmuşdur. Müəllimlərimiz çox qüvvətli, elmli, tələbkar idilər, öz vaxtlarını gecə-gündüz hazırlaşmağımıza sərf edirdilər. Ölkənin müəllimə – hazırlıqlı, hərtərəfli hazırlıqlı adamlara ehtiyacı çox idi. Bunu hiss edirdik.

Mən oxuyarkən məktəbdə kitabxana müdiri idim. Məktəbi qurtarandan sonra da məktəbin özündə müəllim olaraq saxlanıldım. Sonra Nuxa qəza Maarif şöbəsinə inspektor təyin olundum. 1923-cü ildən komsomol təşkil edildi, mən də komsomola daxil oldum. Mən iki məktəbin pedaqoji dərnəyinin sədri idim. Nuxa darülmüəllimini bitirənlər Azərbaycan rayonları məktəblərində çox iş gördülər. Müəllim çatışmırdı. Biz hamımız görkəmli yerlərdə işləyir və işin öhdəsindən müvəffəqiyyətlə gəlirdik. Bu məktəbləri bitirən oğlan və qız məzunlar çox savadlı və hərtərəfli inkişaf etmiş adamlardılar.

Nuxa seminariyasında hər il yay aylarında metod kursları açılır və azərbaycanlı müəllimlər burada cilalanırdılar. Zaqafqaziyada Nuxa qız və oğlan seminariyası o vaxt böyük mövqeyə malik idi. Nuxa məktəblərini bitirmiş bu

adamların əksəriyyəti indi də Azərbaycan miqyasında ən görkəmli adamlar olmuşdular. Azərbaycanda elmi kadrların yetişməsində Nuxa darülmüəllimlərini bitirmişlərin çox böyük iş gördüklərini inkar etmək olmaz.

Doğrudur, mən çox məktəblər görmüşəm. Amma hələ indi də belə təlim-tərbiyə ocağı təsəvvür edə bilmirəm.

Mən Pedinstitutun fizika-riyaziyyat fakültəsini, sonralar tibb institutunun müalicə fakültəsini bitirmişəm. Amma, əsas, möhkəm bünövrə Nuxa darülmüəllimində qoyulmuşdu.

Biz dövlətə, partiyaya və bizi yetişdirmiş müəllim heyyətinə çox minnətdarıq. Doğrudur, biz də onların getdiyi yolla gedir, ölkəmiz üçün savadlı, hərtərəfli hazırlıqlı adamlar yetişdiririk.

*Quliyev Ələfsər Hüseyn oğlu,*
*10.XII.1970*





# Təhsildən öncə tərbiyəyə böyük əhəmiyyət verirəm

Millət vəkili, tarixçi alim Yaqub Mahmudov Şəki Pedaqoji Texnikumunun müəllim və tələbələri ilə görüşdü. Texnikumun maddi-texniki bazası, dərs məşğələlərinin gedişi ilə tanışlıqdan sonra millət vəkili müəllim və tələbələr qarşısında çıxış etdi. Təhsilimizin bu günündən, onun problemlərindən danışan görkəmli alim və pedaqoq müəllim və tələbələri düşündürən bir çox məsələlərə aydınlıq gətirdi və onların çoxsaylı suallarına cavab verdi.

– «Sizinlə görüşmək mənim çoxdankı arzum idi. İşlərimin çoxluğu isə buna imkan vermirdi. Ancaq mən Allah adamıyam, görünür, qismətimə belə yazılmışdı ki, sizinlə müqəddəs Ramazan ayında görüşüm. Bu gün bu arzum, bu istəyim baş tutdu, mən sizlərlə bir yerdəyəm.

Əvvəlcə onu deyim ki, texnikumunuzun maddi bazası ilə – sinif otaqları ilə laboratoriya və fənn kabinələri ilə, kitabxanası ilə, idman zalı, açıq idman meydançası ilə, tələbə kafesi ilə tanış oldum. Deyim ki, çox böyük qürur hissi keçirdim, fərəhləndim. Çox gözəl maddi-texniki baza yaratmısınız. Burada gördüklərim hər şey təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət edir. Burada bəzi işləri də həyata keçirməklə sizin bazanız əsasında ali məktəb, universitet də yaratmaq olar. Ancaq yadıma düşən bir xatirə mənə dedirir ki, siz elə pedaqoji məktəb kimi də fəaliyyət göstərsəniz, respublikamız üçün sizin bu xidmətləriniz də bəsdir.

Mənim rəhmətlik qardaşım Ramazan da bu məktəbdə təhsil alıb. Mən həmişə onun savadına, elminə, dünyagörüşünə qibtə etmişəm, bu gün də qibtə ilə, ehtiramla



yanaşıram. Baxmayaraq ki, bu gün tarixçi-aliməm, professoram, bir çox kitabların, dərsliklərin müəllifiyəm.

Şəki Pedaqoji Məktəbi həmişə özünün məzunları ilə seçilib, bu gün də seçilir. Mən bunları eşitmişəm və görmüşəm. Bu gün gördüklərim də bunu bir daha təsdiqləyir, ənənələr davam etdirilir. Mən bütün bunlara görə ilk öncə texnikumun direktoru Rafiq müəllimə və texnikumun pedaqoji kollektivinə çox sağ olun deyirəm.

Bu gün müəllimin dolanışığının ağırlığı heç kəsə sirr deyil. Bunlar sizə də bəllidir. Siz müəllimlər bəzi məhrumiyyətlərə dözərək dərs deyir, işləyirsiniz, gəncliyimizin təlim-tərbiyəsi ilə məşğulsunuz.

Təhsilimizin keşiyində duraraq, hələ yeni qəzet – «Təhsil uğrunda» adlı qəzet də buraxırsınız. Rafiq müəllim qəzetinizin nüsxələrini mənə də verdi, onlarla tanış oldum və buna da sevindim.

Onu bildirmək istəyirəm ki, Şəki yüz illərlə Azərbaycanın çox inkişaf etmiş, önəmli maarifçilk, ziyalılıq mərkəzi olub. Burada bir zamanlar ikiillik müəllimlər institutu fəaliyyət göstərib, bütün Azərbaycanın pedaqoji kadrlarla təmin olunmasında bu ikiillik Şəki Müəllimlər İnstitutu çox mühüm rol oynayıb. Bölgədə də Şəki bizim dövlətçiliyimizin qarantıdır. Ona görə də mənim sizin «Təhsil uğrunda» qəzetinizə, pedaqoji texnikumunuza, onun çoxsaylı pedaqoji heyətinə ən böyük arzum ondan ibarətdir ki, ənənələri yaşatsınlar, siz də qəzetinizdə bizim tarixi ənənələri dirçəltmək yolunda bir-birindən uğurlu addımlar atasınız. Qoy bilsinlər, öyrənsinlər ki bizim Şəkimizdə bütün azərbaycanlılara xidmət edən belə bir məktəbimiz, ziyalılarımız olub, məşhur pedaqoqlarımız olub. Rəşidbəy Əfəndiyevlərimiz, Ə.Dəmirçizadələrimiz olub. Onlardan da əvvəl Azərbaycan pedaqoji fikir tarixində, onun inkişafında öz yeri olan mütəxəssislərimiz olub. Yəni, o ənənələr dirçəldilsin və o gün gəlsin Şəkidə müstəqil institut, müstəqil universitetimiz olsun.





Mən indiki dövrdə Azərbaycanımızda təhsildən öncə tərbiyəyə böyük əhəmiyyət verirəm. Tərbiyə üzərində, milli təfəkkür üzərində, azərbaycançılıq üzərində, vətənsevərlik üzərində qurulan təhsil uğur qazana bilər. Əgər onun kökündə, əsasında bizim milli mənəviyyatımız yoxdursa, bizim milli tərbiyə sistemimiz yoxdursa, o təhsil xalqa xeyir verməz. Ona görə də arzu edirəm ki, siz təhsildən öncə, Azərbaycan mənəviyyatını yaşadan, bizim milli mənəviyyatımızı yaşadan tərbiyə sistemi qurasınız və onun üzərində ona layiq təhsil verəsiniz. Bu yolda sizin qəzetiniz də çox iş görə bilər. Odur ki, həm pedaqoji kollektivinizə, həm də qəzetinizə bu müqəddəs işdə uğurlar arzulayıram.

*Professor, millət vəkili Yaqub Mahmudov,*
*Texnikumda nəşr olunan*
*«Təhsil uğrunda» qəzetindən*
*(2002-ci il, №3.səh.6)götürülmüşdür*

# Qaynar qazan



1974-cü ildə Azərbaycan Xarici Dillər Universitetinin İngilis dili fakültəsini bitirib, elə həmin ildə də Bakı şəhərində «İnturist»də tərcüməçi kimi əmək fəaliyyətinə başlamışam. Ancaq ailə vəziyyətimlə əlaqəli 1975-ci ildə Şəkiyə qayıtmalı oldum.

Şəhər 10 №-li məktəbə ingilis dili müəllimməsi təyin edildim. Elə həmin ildə də Şəki Pedaqoji Texnikumunda azad komsomol komitəsinin katibi seçildim. Mən bu texnikumun həyatını hec vaxt belə təsəvvür etməzdim. Texnikumun həyatı sanki bir «qaynar qazan» idi. Burada dinclik, macal deyilən şey yox idi. Tədbirlər tədbirə calanırdı. Ayda bir dəfədən gec olmayaraq qrupların, ayrı-ayrı ixtisaslar üzrə şöbələrin, fənn kabinələrinin divar qəzetlərinin hazırlanması, əsər müzakirələri, ədəbi-bədii gecələr, radio qovşağının işi, görüşlər, idman yarışları, spartakiadalar və s.

Bir tərəfdən də şəhər tədbirləri o qədər olurdu ki, günün nə vaxt başlayıb, nə vaxt qurtardığını bilmək olmurdu. Ancaq onu deməliyəm ki, işlər çox olsa da, nəticəsi göz qabağında idi.

Burada təhsil alan tələbələr təkcə müəllim kimi yetişmirdilər. Onlar əsl təşkilatçı müəllim kadrları kimi yetişirdilər. Onlar şəkil çəkməyi də bacarırdılar, məqalə yazmağı





da, mühazirə mətni hazırlamağı da, ilk tibbi yardım göstərməyi də, biçmə-tikməni də, toxumağı da və s.

1979-cu ilədək mən texnikumda çalışdım. İndi də o illəri çox fərəhlə xatırlayıram və sevinirəm ki, mən də bir vaxtlar o «qaynar qazan»da «bişmişəm».

Burada çalışdığım illər ömrümün ən parlaq səhifələrinin çox böyük hissəsini təşkil edir. Bu texnikumun bünövrəsi elə qoyulub ki, burada işlər elə qurulur, elə təşkil olunur ki, canıdildən işləməmək, «gün kecirmək» mümkün deyil.

İndi mən 1983-cü ildən şəhər 19 saylı məktəbdə direktor işləyirəm. Açığını deyim ki, bu texnikumda öyrəndiklərim bu gün də idarəetmədə, kollektivə rəhbərlik etməkdə mənim çox köməyimə gəlir.

Ona görə də əlimə qələm götürüb bu sətirləri yazır və var səsimlə deyirəm:

90 yaşın mübarək, mənim şanlı, adlı-sanlı texnikumum!

Qoy Azərbaycanımız var olsun, sən də var olasan həmişə!

*Hüseynova Ulduz Fərrux qızı*
*Şəki şəhər 19 saylı məktəbin direktoru*

## «Ədalət»in ədaləti

*Respublikamızda çap olunan qəzetlər içərisində həmişə ədalətli mövqeyi və ədalətli sözü ilə sayılıb-seçilən qəzetlərdən biri və bəlkə də birincilərindən biri olan «Ədalət» qəzeti (baş rerdaktoru Aqil Abbasdır, qəzet 1990-cı ilin iyulundan çıxır) özünün 14 yanvar 2003-cü il (№ 7(1627)) tarixli sayının 8-ci səhifəsində qəzetimizlə bağlı Məzahir Əhmədoğlunun imzasıyla yazı dərc etmişdir. Yazının oxucularımız üçün də maraqlı olduğunu nəzərə alaraq, nöqtə və vergülünə belə toxunmadan diqqətinizə təqdim edirik.*

### «Təhsil uğrunda» öz oxucularını tapacaq

**Ötən ilin dekabr ayında əlimə tanış bir adla nəşr olunan qəzet düşdü: «Təhsil uğrunda». A-3 formatda buraxılan 8 səhifəlik bu qəzet oxuculara aylıq bülleten kimi təqdim olunsa da, əslində elə əsl qəzet idi. Müasir tərtibatlı, oxunaqlı və cəlbedici. Bu gür qəzetlər əvvəllər respublikanın əksər ali məktəblərində nəşr olunmaqla həmin təhsil müəssisələrinin həyatını əks etdirir, müəllim və tələbələrin söz tribunasına çevrilərdi. Səhv etmirəmsə sonradan bu ənənə davam etdirilmədi. Səbəbini araşdırmaq fikrində deyilik, bunda işimiz yoxdur. Ancaq əlimdəki «Təhsil uğrunda» qəzetini oxuduqca məni bir məsələ düşündürürdü: peşəkar jurnalistlərin çalışmadığı bu qəzet öz mövzu aktuallığı, seçimi, tərtibatı və səmimiliyi ilə bir çox respublika miqyaslı qəzetlərdən heç də geri qalmırdı. Sanki burada uzun illərin təcrübəsini qazanmış peşəkar bir kollektiv çalışır.**

Maraq məni qəzetin ünvanına çəkib apardı. «Təhsil uğrunda» qəzeti Şəki Pedaqoji Texnikumunda nəşr olunur. Yəni burada hazırlanır və «Azərbaycan» nəşriyayatında çap





olunur. Qəzetin baş redaktoru elə texnikumun direktorudur. Ötən ilin sentyabr ayından nəşrə başlayan «Təhsil uğrunda» qəzetin təsisçisi texnikumun pedaqoji kollektivi olmaqla yanaşı, bu maraqlı missiyanın təşəbbüsçüsü də Rafiq müəllimdir. İlk baxışda bir qədər qəribə və təəccüblü görünür. Ancaq heç demə belə deyilmiş. Texnikumun direktoru Rafiq Şükürov rayonun seçilən ziyalılarından biri olmaqla, jurnalistikaya da ciddi münasibət bəsləyən, onun ənənələrini, problem və qayğılarını sərf-nəzər etməyi bacaran şəxsdir. Rafiq müəllimgilin evində qəzet, mətbuat həmişə diqqət mərkəzində olub, həyatı bir məsələyə çevrilib. Atası istər Moskvada, istərsə də Azərbaycanda nəşr olunan əksər qəzetlərin abunəçisi olub, evdə bu qəzetləri oxuyub, uşaqlarına da oxutdurub. Beləcə atanın dəsti-xətti, qəzet sevgisi elə o vaxtlardan Rafiq müəllimə də ciddi təsir göstərib, onu ovsunlayıb. «Nədən jurnalist olmadınız?» sualına cavab vermək istəmir. Biz də çox israr etmədik. Ancaq o baş redaktoru olduğu qəzetin ilk saylarından sanki bu suala elə sualla cavab verir: «Yoxsa bunu bacarmadım?».Bacardınız, Rafiq müəllim, çox gözəl bacardınız. Bir texnikumda 1500 tirajla qəzet çıxarmaq, hətta ayda bir dəfə də olsa asan məsələ deyil. Özü də səliqəli, sanballı, oxucu zövqünü oxşayan bir qəzet. Bunu çoxları bilməsə də, biz jurnalistlər çox yaxşı bilirik. Sizə həm pedaqoji fəaliyyətinizdə, həm də qəzetçilk kimi çətin, əzablı, eyni zamanda şirin və mənalı işinizdə uğurlar arzulayırıq.

*«Təhsil uğrunda» qəzetindən.*
*(fevral 2003-cü il) götürülmüşdür*

## «Sızlar, yada düşəndə ürəyimin telləri...»

1964-65-ci tədris ilində Şəki Pedaqoji Texnikumunun İbtidai sinif müəllimi hazırlayan şöbəsinə daxil olmuşam.1967-68-ci tədris ilində texnikumu bitirib İbrahim kənd səkkizillik məktəbinə sinif müəllimi təyin olunmuşam.

Yaxşı yadımdadır, həmin texnikuma daxil olmuş tələbələrdən kasıb ailələrdən və yetim uşaqlardan 12 nəfərini, mən də olmaqla, indiki tarix kabinəsində qalmaq üçün seçdilər. O zaman texnikumun direktoru olan Aminə Babayeva bizi öz otağına çağırtdırıb dedi ki, sizin ailə vəziyyətinizlə maraqlanmışıq. Şəhərdə qalmaq üçün imkanınız olmadığına görə məktəbdə qalmağınızı məsləhət bilmişik. Hələlik bir il burada yaşayacaq və oxuyacaqsınız. Həm də tapşırıq vermişəm ki, müəllimlər axşam saat 8-dən 22-dək sizinlə məşğul olacaq, hazırlığınıza və davranışınıza nəzarət edəcəklər.

Beləliklə, biz 12 nəfər bütün I kursu burada qaldıq, yaşadıq və oxuduq. Həmin dövrdə texnikumda dərs deyən müəllimlərdən Abid Səmədov, Məmməd Allahyarov, Muxtar Məmmədov, Bəkir Muradov və başqaları bizə kömək və nəzarət edirdilər.

Müəllimlərdən Mahtaban Yusifzadə, Razi Əfəndiyev, Məmməd Allahyarov, Zivər Qaqaşova, Tahirə Əkbərova, Fuad Axundov, Niyazi və Müzəffər Hacıyev, Abid Səmədov, Bəkir Muradov, Aman Səmədov, Furman Muradov ən çox sevdiyim müəllimlərim olub.

Aminə Babayeva və tədris-hissə müdiri Bəxtiyar Əliyev olmaqla pedaqoji kollektiv bütün tələbələrə həqiqi mənada müəllimlikdən başqa, həm də bizi valideyn qayğısına bərabər qayğı ilə əhatə edirdilər.

Bu illər ömrümün yeniyetməlik dövründə mənə vətəni





və insanları sevməyi, səmimi, mehriban və doğrucul olmağı, həyatı mənalı yaşamağı öyrətdi.

Heç zaman yadımdan çıxmaz, 1965, 1966 və 1967-ci illərin «1 may» bayramında Pedaqoji texnikumun bayrağını aparmaq mənə həvalə edilmişdi. Bu məni son dərəcə sevindirir və qururlandırırdı.

Tələbəlik illərində Mahtaban və Razi müəllim məndə dil-ədəbiyyata, Aminə müəllimə tarixə, Müzəffər müəllim isə coğrafiyaya böyük həvəs yarada bilmişdilər. Bir dəfə ədəbiyyat dərnəyinin məşğələsində Razi Əfəndiyev mənə «Əruz vəzni» haqqında mühazirə yazıb dərnəyin növbəti məşğələsində oxumağı təklif etdi.

Mən o boyda yükün altına girə bilərəmmi – deyəndə Razi müəllim cavab verdi ki, girərsən də, çıxarsan da.

III kursda bu tapşırığı alanda IV kursda Razi müəllimin dərs dediyi Səmayə Alxasova mənə dedi ki, sənə kömək edəcəyəm, qorxub eləmə. Səmayənin köməyi ilə bu məruzəni hazırladım və Razi müəllim çox razı qaldı.

Hazırda Səmayə Alxasova N.Tusi adına Azərbaycan Pedaqoji Universitetində müəllim işləyir. O, Pedaqoji Texnikumu fərqlənmə diplomu ilə bitirib, bir imtahan verib ali məktəbə daxil olmuşdur. Sonralar bacım Səkinə də bu texnikumu fərqlənmə diplomu ilə bitirib, mən hərbi xidmətdən qayıtdıqdan sonra bir ildə ikimiz də o zamankı Pedaqoji İnstituta daxil olduq və Səmayə müəllimə ilə indi də ailəvi dostluğumuz davam edir.

Texnikum illərində çoxlu tələbə dostlarım vardı. Onlardan hazırda məktəb direktorları olan Etibar Məmmədov, Fazil Şirinov, Sərdar Bəkirov, Abdulsalam Sitdayev və başqalarının adını fərəhlə çəkə bilərəm. İndi də tələbə yoldaşlarımla görüşüb o bəxtəvər günlərimizi fərəhlə xatırlayırıq.

Son olaraq deyərdim ki, Şəki Pedaqoji Texnikumunda

oxuduğum illərdə qazandıqlarıma görə yuxarıda adlarını çəkdiyim müəllimlərimə borcluyam.

Pedaqoji Texnikum mənim həyatımda, tərbiyəmdə, təhsilimdə, dünyagörüşümdə, bir insan və şəxsiyyət kimi formalaşmağımda əvəzsiz rol oynamışdır.

Məzunu olduğum texnikumda dərs dediyimdən qürur duyuram.



*Rəşid Səmədov, 1968-ci il məzunu*





# Qori Seminariyasına bərabər....

## Əvvəlcə özüm haqqında

Mən Əlibalayev Salman Əbuzər oğlu 15 may 1933-cü ildə Nuxa şəhərində sənətkar ailəsində anadan olmuşam. 7 yaşımadək uşaq baxçasında tərbiyə almışam. Baxçanı bitirdikdən sonra 1940-ci ildə şəhər 2 saylı yeddiillik orta məktəbin 1-ci sinfinə daxil olmuşam. 1950-ci ildə həmin məktəbi fərqlənmə şəhadətnaməsi ilə bitirmiş və təhsilimi davam etdirmək üçün Nuxa Pedaqoji Texnikumuna sənədlərimi vermişəm. 1954-cü ildə Nuxa Pedaqoji Texnikumunu bitirmiş və həmin il ali təhsil almaq məqsədi ilə Bakı şəhərinə gedərək Azərbaycan Dövlət Pedaqoji İnstitutuna imtahan vermişəm. İnstitutun coğrafiya-biologia fakültəsinə daxil olmuş, 1959-cu ildə təhsilimi müvəffəqiyyətlə başa vurmuşam. 1959-cu ildə Maarif Nazirliyinin təyinatına əsasən Şəki rayon Orta Zəyzid kənd məktəbinə coğrafiya-biologia müəllimi vəzifəsinə təyin olunmuşam. On iki il həmin məktəbdə çalışmış, 1973-cü ildə şəhər 11 saylı orta məktəbə coğrafiya-biologia müəllimi vəzifəsinə göndərilmişəm. İyirmi beş il 11 saylı şəhər orta məktəbdə çalışmış və 1998-ci ildə şəhər 2 saylı orta məktəbə coğrafiya müəllimi vəzifəsinə göndərilmiş və hal-hazırda da həmin məktəbdə işləyirəm. Ailəliyəm, bir oğlum var.

## Texnikum haqqında xatirələrim

Mən Nuxa Pedaqoji Texnikumunda oxuyan zaman 40-dan artıq ali və orta ixtisas təhsilli müəllimlər burada keyfiyyətlə dərs tədris edirdi. O zaman Nuxa Pedaqoji Texnikumunu Qafqazda məşhur olan, ən savadlı müəllim yetişdirən Qori Seminariyasına bərabər tuturdular. Bu texnikumda əməkdar müəllimlər, gözəl savadlı, elmi, biliyi olan müəllimlər çalışırdı. Mən texnikumun direktoru, biologiya müəllimi Qurban Abbasov, dil- ədədbiyat müəllimi, əməkdar müəllim Mahtaban Yusifzadə, fizika müəllimi Mustafa İsmayılov, idman müəllimi Bəkir Muradov, hərbi rəhbər İbrahimxəlil İbrahimxəlilov, tarix müəllimi Osman Osmanov, rus dili müəllimi Abdulla Qazızadə, coğrafiya müəllimi Müzəffər Hacıyaev kimi müəllimlərdən dərs almışam.

Bir faktı da qeyd edim ki, coğrafiya müəllimi Müzəffər Hacıyevin ali təhsili yox idi. Amma coğrafiya fənnini o qədədr gözəl tədris edirdi ki, bunun nəticəsi olaraq 1954-cü ildə məzunlardan 8 nəfəri Azərbaycan Dövlət Pedaqoji İnstitutunun məhs coğrafiya-biologiya fakültəsinə qəbul olmuşdur.

Mən açıq deyirəm, səmimiyyətimə inanın, texnikumda öyrəndiklərimin yarısını öyrənib ali təhsil almışam. Texnikumda təhsil aldığım illər, ali məktəbdəki təhsil illərimə nümunə ola bilər.

Mən Nuxa Pedaqoji Texnikumunun 54-cü buraxılışının məzunu olmuşam. Həmin ilin məzun vinetkasında 21 müəllimin şəkli əks olunmuşdur. Əfsuslar olsun ki, müəllimlərin 20-si dünyasını dəyişmiş, bu günə onlardan cəmisi bir nəfər, əslən Qax rayon İlisu kəndində anadan olmuş,





1-ci sinif dərsliyinin uzun müddət müəllifi olmuş, Prezident təqaüdçüsü Kərimov Yəhya Şəfi oğlu sağ salamatdır.

Mənimlə birgə məzunu olmuş Nuxa Pedaqoji Texnikumunun tələbələrindən bu gün alım, professor, akademik pillələrinə yüksəlmiş müəllimlər öz işlərini səylə aparmaqdadırlar. Bunlardan Akademiyanın müxbir üzvü, Paliantoloq Vəli Əliyevi, psixologiya elmləri doktoru Tofiq Mustafayevi, professor Vilayət Əliyevi və başqalarını nümunə gətirmək olar.

Müşahidələrimdə şahidi oluram ki, məzunu olduğum texnikum bu gün də yüksək səviyyədə inkişaf edir. Texnikumun direktoru Rafiq Şükürovun səyi və fasiləsiz zəhməti sayəsində indi texnikum estetik görünüşlü, səliqə-səhmanlı, abad və möhtəşəm görünür. Təhsil sahəsində gördüyü əvəzsiz xədmətlərinə görə texnikumun məzunu olaraq ona böyük müvəffəqiyyətlər arzulayıram. İnanıram ki, texnikum yaxın gələcəkdə təntəli surətdə qeyd olunacaq 90 illik yubileyi də adına layıq, möhtəşəm olacaq və hamımızı sevindirəcək, uğurları bir-birinin arxasınca tükənməz olacaq. Bir daha Sizə bu çətin və şərəfli işdə müvəffəqiyyətlər arzulayır və Tanrıdan Sizə bu işdə kömək olmasını diləyirəm.



*Hörmətlə: Salman Əlibalayev*
*20.02.2010-cu il*

# Bunlar da bir xatirə

Əziz mehribanım Rəcəb! Kağızların arası kəsilməsinə səbəb söz yoxdır ki, mənim məkanimi və adrisimi bilməməkdir. Bizim şagirdlərimiz ilə bahəm Yekatirinadora göndərübləz – buralar rus vilayətidir. Müsəlman ruhi və rayhəsi dərk olunmiyor. Əmma burada şəhərin ətrafında çoxli çərkəs köyləri var. Çərkəslər yaxşi tayfədirlər bizə hörmət edirlər. Mölud bayramini artıq təntənə ilə ifa etdik, çərkəzlərə xoş gəldi, ikinci dəfə mərasim möludi icra etmək üçün bizi yaxın kəndlərdən birinə apardilər və orada lazımə mehmannəvazlığı həqimizdə etdilər – heyfaki nə onlar bizim dilimizi və nə biz onların dilini anlayırıq ruscə danışmaq lazım gəlür. Çərkəzlərin çoxu rus dilini bilür. Sizi mən unutmiram sizdə məniunutmuyun, allah sizi səlamət və xoşbəxt iləsin. Badsəbanın səlami var.
Məlimin Fridun.

adres: Ekaterinador. d. şkola. / 13/II 15 q.





12 oktyabr 1915. Qori.

Əzizim Rəcəb! Kağızın vusul oldu, xeyli zəman idi ki, səndən kağız yox idi, nigəran idim və təəccüb edirdim ki, nə əcəb Rəcəbdən kağız gəlmiyor! Bəli! biçarə tacir bu qədər zəhmət çəkdi, can çürütdi – axiri puç oldi öz əməginidə və bizim əməgimizidə zay etdi. Onan bilə vəqtsiz vəfat etməsi məni xeyli pərişan və digərgün edübdir. Heç yaddan çıxarda bilmirəm... O biçarədən səba gənə əmuzadəm. Fərhadbək ki xeyli qabil bir cavan idi və gənə başqa bir əmizadəm. Hüseyinbək əvvəlinci tacir ilə bir vəqtdə ikincisi dəvadə əcl şərbətini içməklə bilə məni dağdar ilədilər və ağır yükləri mənim üstimə töküldi. Allaha pənah! Təzə qəzetləri oxudunmu xoşina gəldimi, „açıq söz və qurtuluş" qəribə adlar deyilmi – açıq söz yəni nə? qurtuluş nə deməkdir?... Bir adam ki, qəzetəyə ad qoymaqda aciz...lə bu dana ondan nə gözləmək?

Məlimin Fridun.

Mehribanım Rəcəb. Çoxdandır ki, səndən bir əhval yoxdur. Bilmirəm sən bəna yazmalısan, yoxsa mən sənə, unutmişəm. Hər kalda sən mənim yozub yazmadığımə mültəfit olmiyüb gah da bir öz işindən və muğilliyindən məlumat ver. Nə üçün qəzetlərdə əhval yazmirsən mümkün olsə, „Yeni iqbalə" hekayələrindən göndər dərc olunsun. İstiyərsən mən əzizə yozum sənin barəndə və o səni məxsusi təklif iləsin yazmağə. Bir neçə hekayələr yazandən sonra məcbur etmər olar ki, sənə qələm həqqidə verilsin. Badsəbanın sənə səlami var. Baqi allah əmanında olmağını istiyərəm. Məlimin Fridun

17 dekabr 1915. Qori.





Шәки Педагожи Техникумунун севимли II курс тәләбәләри!

Мән сизә сәмими саламлар гөндәрир, чан сағлығы, сәадәт вә тәһсилинизә уғурлар диләјирәм.

Әзиз тәләбәләр, чох сағ олун ки, мәни јада салмысыныз.

Нәзәринизә чатдырырам ки, мән Педагожи Техникумда охујаркән низам-интизамлы, јахшы охујан тәләбә олмушам. Чалышын, мүәллимләринизи севин, онларын бүтүн тапшырыгларына әмәл един. Шәки Педагожи Техникумунун өзүнәмәхсус бөјүк әнәнәси вар. Сиз бу әнәнәни сахлајын, јахшы охујун.

Бир даһа сизә мөһкәм җан сағлығы вә һәјатда уғурлар арзулајырам.

Чох бөјүк һөрмәтлә!

Сизин гаршыдан кәлән Баһар бајрамынызы тәбрик едирәм!

Шәки 10.III-1997. Вали Әлијев.

1

## Тәрҹүмеји-һал.

Мән, Кәримов Јәһја Шәдри оғлу 1927-ҹи илдә Гах рајонунун Илису кәндиндә бәнна аиләсиндә анадан олмушам.

1931-ҹи илдә аиләмиз рајон мәркәзинә көчмүшдүр. 1934-ҹү илдә Гах-Муғал орта мәктәбинин I синфинә, ~~дахил олмушам~~, VII синфи битирдикдән сонра Загатала Педагожи Мәктәбинә дахил олмушам. Атам мүһарибәјә сәфәрбәр олундуғундан охумаға башламамыш, мәктәбә кечиб, сонралар пионер баш дәстә рәһбәри вәзифәсиндә ишләјә-ишләјә охумушам. IX синифдә рајон комсомол комитәсиндә ишләјәрәк тәһсилими давам етдирмишәм. X синифдә охујаркән јенидән пионер баш дәстә рәһбәри олмушам.

Орта тәһсилими баша чатдырдыгдан сонра Азәрбајҹан Нефт Сәнаје Институтуна дахил олмушам (Сонралар Сосиалист Әмәји Гәһрәманы адына лајиг көрүлмүш мәним Бәхтијар Кәримов III курс тәләбәси иди вә һәмјерли кими мәнә һәр ҹүр көмәк көстәрирди). Мүһарибәнин ағырлығындан әзијјәт чәкән бөјүк аиләмизи доландырмаг мәгсәдилә





2

рајона дөндүм. 1 нөмрәли ушаг евиндә тәрбијәчи вәзифәсиндә чалышдым.

Бөјүк Вәтән мүһарибәси баша чатдыгдан сонра Республика Мүәллимләри ~~Ин~~ Тәкмилләшдирмә Институтунун Шәки Педагожи Мәктәбиндә тәшкил етдији ај јарымлыг курсу кечдим. Мәктәбимиздә пионер баш дәстә рәһбәрлији илә јанашы синиф мүәллими, V–VII синифләрдә ҹоғрафија мүәллими вәзифәсиндә чалышдым.

1946-ҹы илдә В.И. Ленин адына Азәрбајҹан Дөвләт Педагожи Институтунун дил вә әдәбијјат факултәсиндә тәһсил алдым. Ораны 1950-ҹи илдә әла гијмәтләрлә битирдим. Губа Мүәллимләр Институтуна тәјинат алдым. Нөвбәти дәрс илиндә Газах Мүәллимләр Институтуна көндәрилдим. Ики ил орада педагожикадан мүһазирә охудугдан сонра икиилик мүәллимләр институту бағланды. Губа, Ағдам, Газах, Шәки мүәллимләр институтларынын сонунҹу курс ~~[illegible]~~ тәләбәләри Шәкидә (Кировабад Дөвләт Педагожи

3

Институтунун филиалында) тәһсил алмалы олдулар. Мән дә Шәкијә көчүрүлдүм. Һазырки јенијә дүнјасыны фәјиминин (педмәктәбин педагокика вә психолоҝија фәнләри) бүтүн мүәллиминин дәрсләрини дамәји мәнә һәвалә етди. Беләликлә, һәм институтда, һәм дә педмәктәбдә ишләмәли олдум.

Педмәктәбдә аспирантураја һазырлашдым. 1955-ҹи илин јајында Азәрбајҹан Дөвләт Педагожика Институтунун (Индики Елми-Тәдгигат Педагожи Елмләр Институтунун) аспирантурасына гәбул ~~[illegible]~~ олундум. Көркәмли алим, проф. Ә. Дәмирчизадәнин рәһбәрлији илә араштырмалар апардым. 1962-ҹи илдә намизәдлик, 1975-ҹи илдә докторлуг диссертасијасы мүдафиә етдим.

1961-ҹи илдән институтда шөбә мүдири, 1976-ҹы илдән елми ишләр үзрә директор муавини вәзифәсиндә ишләјирәм.

Бу мүддәтдә али мәктәбләрдә саатһесабы вә јарым штат мүәллимлик етмишәм.

1970-ҹи илдән „Ибтидаи мәктәб вә мәктәбәгәдәр тәрбијә" журналынын редакторујам.





4

1961-ҹи илдән дәрсликләрин тәртибинә башламышам. 1963-ҹү илдән фасиләсиз „Әлифба" дәрслијинин мүәллифијәм. Һазырда ибтидаи синифләрдә 9 дәрслијим вә дәрс вәсаитимдән истифадә олунур.

Республика Тәһсил Назирлијинин ~~Вахид~~ Елми-Методик Шурасынын рәјасәт һеј'әтинин үзвү, „Ибтидаи тәлим вә мәктәбәгәдәр тәрбијә" ~~[illegible]~~ бөлмәсинин сәдријәм.

Республиканын Әмәкдар Мүәллими, ССРИ Маариф Әлачысыјам. Орден вә медалларла тәлтиф олунмушам.

[signature] 18.1.97

# X bölmə

## Təbriklər, təbriklər

### Şəki Pedaqoji Texnikumunun kollektivinə

Hörmətli müəllimlər və tələbələr!

Şəki Pedaqoji Texnikumu respublikamızda, xüsusilə onun şimal zonasında pedaqoji kadrların hazırlanmasında, xalqımızın mənəvi irsinin öyrədilməsində və nəsildən-nəslə ötürülməsində özünəməxsus yer tutur.

Azərbaycanın ən qədim və çox maraqlı tarixə malik Şəki şəhərində 75 ildən çox fəaliyyət göstərən bu təhsil ocağı təkcə yerləşdiyi bölgənin deyil, eləcə də bütün Azərbaycanın sosial-iqtisadi və mədəni inkişafına öz təsirini göstərmişdir. Belə ki, bu gün Respublikanın bir çox ali məktəblərində, elm, mədəniyyət ocaqlarında, idarəetmə orqanlarında Şəki Pedaqoji Texnikumun məzunları var.

Möhtərəm Prezidentimiz Heydər Əliyev cənabları Azərbaycan Respublikası gənclərinin I forumundakı çıxışında gənclərimizin təhsili ilə əlaəqdar aydın bir istiqamət göstərərək demişdir: «Bizim gənclərimizin vəzifəsi təhsil almaq və müasir tələblərə uyğun səviyyəyə çatmaqdır». Sözsüz ki, Respublikanın bütün təhsil işçiləri kimi Şəki Pedaqoji Texnikumunun əməkdaşları da respublika rəhbərinin bu müdrik tövsiyyələrini dərindən dərk edərək onların həyata keçirilməsi üçün bütün imkanlarını səfərbər edir və edəcəkdir.

Müstəqil Azərbaycan Respublikasında maarifin,





elmin, mədəniyyətin daha da inkişaf edib çiçəklənməsi kimi çətin və çətin olduğu qədər də şərəfli işdə Şəki Pedaqoji Texnikumunun pedaqoji kollektivinə və tələbələrinə uğurlar diləyirik.

*Hörmətə: Azərbaycan Respublikası Təhsil Naziri*
*L.X.Rəsulova*
*30.01.1997-ci il*

### Şəki Pedaqoji Texnikumunun kollektivinə

Respublikamızın şimal-şərq bölgəsinin məktəbəqədər müəssisələr və ümumtəhsil məktəbləri üçün pedaqoji kadrlar hazırlayan Şəki Pedaqoji Texnikumu 75 il ərzində müxtəlif təzyiqlərə baxmayaraq bu günədək öz ənənələrini qoruyub saxlamış və şərəfli bir yol keçmişdir.

Nəinki respublikada, hətta onun hüdudlarından kənarda belə şöhrət qazanmış Rəşidbəy Əfəndiyev, Əbdüləzəl Dəmirçizadə və s. kimi alimlər vaxtı ilə bu texnikumu bitirmiş və həyata vəsiqə almışlar.

Hazırda texnikumun minlərlə məzunu bölgənin ən ucqar rayonlarında fəaliyyət göstərməklə, yetişməkdə olan gənc nəslin təlim-tərbiyə işində fədakarlıqla çalışmaqla texnikumun şərəfini uca tuturlar.

Bu illər ərzində texnikumun pedaqoji kollektivi təlim-tərbiyənin təkmilləşdirilməsi, tədrisdə yeni metod və prinsiplərdən istifadə edilməsi, təlimin texniki vasitələrinin tətbiqi və tədris planlarının tələbləri səviyyəsində yeni fənn proqramlarının hazırlanmasında da xeyli işlər görmüşlər.

Şəki Pedaqoji Texnikumunun fədakar kollektivini böyük yubiley – 75 illiyiniz münasibətilə təbrik edir, Sizə ye-

ni-yeni uğurlar diləyir və respublikamızın indiki iqtisadi çətinliklərinə baxmayaraq, müstəqil vətənpərvərlər yetişdirməkdə səbr, təmkin və möhkəm iradə arzulayırıq.

*Kollektiv adından Təhsil Nazirliyi,*
*Təhsil üzrə Respublika Elmi-metodik Mərkəzin*
*direktoru: Ə.H.Əhmədov*

**Şəki Pedaqoji Texnikumunun kollektivinə**

Hörmətli müəllimlər və tələbələr!

Mənə doğma və əziz olan Pedaqoji Texnikumunun kollektivini 75 illik yubileyi münasibətilə təbrik edir, Sizə uğurlar diləyirəm.

Şəki Pedaqoji Texnikumunun Azərbaycanın təhsil sistemində özünəməxsus yeri vardır. Zəngin ənənələrə malik olan bu qocaman elm məbədi 75 il ərzində respublikamızın ümumtəhsil məktəbləri, məktəbəqədər müəssisələri üçün minlərlə savadlı, yüksək ixtisaslı müəllim kadrları hazırlamış və indi də öz səmərəli fəaliyyətini davam etdirməkdədir.

Məhz buna görə də Şəki Pedaqoji Texnikumunun adı indi də respublikamızda iftixarla çəkilir, minlərlə həmvətənimiz həmin məktəbdə təhsil aldığını özünə fəxarət sanır. Ümid edirəm ki, bacarıqlı, səriştəli, təcrübəli və mehriban kollektivi olan, nüfuzlu və qocaman tədris müəssisəsi öz şanlı ənənələrini bundan sonra da davam etdirəcəkdir. Müstəqil respublikamız üçün yüksək ixtisaslı pedaqoji kadrların hazırlanmasında kollektiviniz öz bacarığını əsirgəməyəcək, təhsilimizin tərəqqisinə sanballı töhvələr verəcəkdir.





Sizə xalqımızın mənəvi dəyərini yaşatmaq yolunda uğurlar diləyir, möhkəm can sağlığı arzulayıram.

*Şəki Şəhər İcra hakimiyyətinin başçısı:*
*N.L.Əhmədov*
*30.01.1997*

*Şəki Pedaqoji Texnikumunun direktoru Rafiq Şükürova.*

Xəstəxanada olduğumdan yubileyinizdə iştirak edə bilmədiyim üçün təəssüflənirəm. 75 illik yubileyinə görə texnikumun müəllimlərini təbrik edir, onlara çətin və şərəfli işlərində uğurlar diləyirəm.

*Azərbaycanın Xalq şairi:*
*Bəxtiyar Vahabzadə*

Hörmətli Rafiq Müəllim!

Sizin texnikumun 75 illik yubileyini təbrik edir, pedaqoji kollektivinizə fəaliyyətində uğurlar diləyirik.

*Hörmətlə: Ə.Cavad adına*
*Bakı Mədəni Maarif Texnikumunun*
*rəhbərliyi və pedaqoji kollektivi*

Hörmətli Rafiq müəllim!

Sizi və bütövlükdə pedaqoji kollektivinizi Bakı məktəbəqədər Pedaqoji Texnikumunun tələbə və müəllim heyəti adından Azərbaycan xalqının maariflənməsində böyük xidmətləri olan Şəki Pedaqoji Texnikumunun 75 illik şərəfli yaşı münasibətilə böyük iftixar hissi ilə təbrik edir və

pedaqoji kollektivinizə xalqımızın mənəvi dəyərlərini yaşatmaq yolunda ləyaqətli uğurlar arzulayıram.

*Hörmətlə:*
*A.M.Həsənov*
*Bakı Məktəbəqədər Pedaqoji Texnikumunun direktoru*

Hörmətli Rafiq müəllim!

Sizi və kollektivinizi texnikumunuzun 75 illk yubileyi münasibətilə təbrik edir, yaradıcılıq fəlaiyyətinizdə yeni uğurlar arzulayırıq.

*Şəki şəhər,*
*Əhalinin Sosial Müdafiəsi Mərkəzinin kollektivi*

*Şəki Pedaqoji Texnikumunun yubiley təşkilat komitəsinə.*

Şəki Pedaqoji Texnikumunun müəllim və tələbə kollektivini texnikumun 75 illik yubileyi münasibətilə təbrik edirik, orta ixtisas təhsilli pedaqoji kadrlar hazırlanması sahəsində kollektivə böyük uğurlar arzulayırıq.

*Mingəçevir Politexnik Texnikumunun kollektivi adından direktor Allahverdiyev*

*Şəki Pedaqoji Texnikumunun direktoru R.Şükürov cənablarına.*

Şəki 2717 nömrəli Avtomobil dəstəsinin kollektivi sizin rəhbərlik etdiyiniz pedaqoji texnikumun yaradılmasının 75 illiyi münasibətilə təbrik edir və işinizdə yeni-yeni müvəffəqiyyətlər arzulayırıq.





*A.Əhmədoğlu,*
*Şəki 2717 nömrəli A/dəstəsinin rəisi*

Şəki Pedaqoji Texnikumunun müəllim və şagird kollektivini 75 illik yubiley münasibətilə təbrik edir, gələcək həyatınızda uğurlar arzulayırıq.

*Milli Təhlükəsizlik Nazirliyi*
*Şəki Şəhər Şöbəsinin kollektivi adından N.Dəmirçiyev*

*Şəki Şəhər Pedaqoji məktəbin direktoru R.Şükürov cənablarına.*

Sevil Qadınlar Məclisinin Şəki Şəhər təşkilatı yubiley münasibətilə kollektivi təbrik edir, müvəffəqiyyətlər arzulayırıq.

*G.İsmayılova,*
*«Sevil Qadınlar Məclisi»nin sədri*

*Şəki Pedaqoji Texnikumunun yubiley təşkilat komitəsinə.*

Hörmətli Rafiq müəllim, Sizi və Sizin Pedaqoji kollektivi texnikumunuzun 75 illik yubileyi münasibətilə təbrik edir, gələcək işlərinizdə uğurlar arzu edirik.

*Həmzəyev Əlihəsən*

*Şəki Pedaqoji Məktəbin kollektivinə.*

Azərbaycan Respublikasının pedaqoji ictimaiyyətində böyük nüfuz qazanan Şəki Pedaqoji Məktəbin kollektivini 75 illik yubileyi münasibətilə təbrik edir, kollektivin üzvlərinə can sağlığı, müvəffəqiyyətlər arzulayıram.

*Məktəbin 1974-cü il məzunu,*
*Şəki ƏSMM-nin direktoru E.Məmmədov*

*Şəki Pedaqoji Texnikumunun direktoru R.Şükürov yoldaşa.*

Hörmətli Rafiq müəllim, bu gün xalqımızın indiki nəslinin savadlanmasında və yetişməsində böyük xidmətləri olan Şəki Pedaqoji Texnikumunun 75 yaşı tamam olur. Bu əlamətdar yubiley günü münasibəti ilə sizi və sizin şəxsinizdə texnikumun müəllim və tələbə heyətini təbrik edir, Sizə və rəhbərlik etdiyiniz kollektivə suveren respublikamızın müstəqilliyi yolunda daha da inkişaf etdirilməsi üçün sanballı pedaqoji kadrların yetişdirilməsində yeni- yeni uğurlar diləyirik.

*Böyük hörmətlə: Şəki Rayon Aqrokombinatının*
*Baş Direktoru Ş. Musayev*

*Şəki Pedaqoji Texnikumuna*

Şəki Tibb Məktəbinin kollektivi texnikumun fəaliyyətə başlamasının 75 illiyi münasibətilə sizi təbrik edir, 75 il ərzində hazırladığınız pedaqoji kadrlar rayonumuzun və respublikamızın digər rayonlarında gənc nəslin təlim-tərbiyəsini yaxşılaşdırmaq sahəsində səmərəli fəaliyyət göstərmiş və bu gün də bu işi müvəffəqiyyətlə davam etdirirlər. Kollektivimiz pedaqoji kadr hazırlığını yüksəltmək





üçün sizə yeni-yeni uğurlar arzulayır, kollektivin hər bir üzvünə can sağlığı, uzun ömür və ailə səadəti diləyirik.

*Şəki Tibb məktəbinin kollektivi adından*
*direktor əvəzi Z.Məmmədov*

*Şəki Pedaqoji Texnikumuna.*

Şəki Texnologiya Texnikumunun kollektivi 75 illik yubileyiniz münasibətilə sizi təbrik edir, pedaqoji kollektivinizə yeni-yeni müvəffəqiyyətlər və möhkəm can sağlığı arzu edir.

*Hörmətlə: Şəki Texnologiya Texnikumunun*
*kollektivi adından*
*direktor Sədiyev Oxşar*

*Şəki Pedaqoji Texnikumunun ziyalı kollektivinə.*

Hörmətli texnikumun kollektivi, Şəki Ət-Süd kombinatının kollektivi sizi texnikumun 75 illik fəaliyyəti dövründə yüksək ixtisaslı pedaqoji kadrlar yetişdirilməsi münasibətilə təbrik edir. Gələcək yaradıcılıq fəaliyyətinizdə yeni-yeni uğurlar arzulayırıq

*Hörmətlə: Ət-Süd kombinatının kollektivi*

*Şəki Pedaqoji Texnikumunun direktoru R.Şükürov cənablarına.*

Hörmətli Rafiq müəllim!

Şəki tikinti trestinin kollektivi pedaqoji texnikumun fəaliyyətə başladığı vaxtdan bu günə kimi təhsil sistemində respublika əhəmiyyətli yüksək ixtisaslı sağlam kadrla-

rın yetişdirilməsində böyük əməyi olan kollektivinizi və şəxsən sizi pedaqoji texnikumun 75 illik yubileyi münasibətilə təbrik edir, müstəqil Azərbaycan Respublikasının inkişafının möhkəmləndirilməsinin təminatçılarından olan təhsil sistemi kadrlarının yetişdirilməsində sizə can sağlığı, uzun ömür, yeni-yeni nailiyyətlər arzu edirik

*A.Məhərrəmov,*
*Şəki Su-Tikinti Trestinin müdiri*

*Şəki Pedaqoji Texnikumun direktoru R.Şükürov yoldaşa.*

Respublikamızın ən qocaman və nüfüzlu tədris müəssisələrindən biri olan Şəki Pedaqoji Məktəbinin 75 illik yubileyi münasibətilə sizi və rəhbərlik etdiyiniz kollektivi təbrik edirik. Ümid edirik ki, məzunları arasında onlarla tanınmış görkəmli elm, təhsil və ədəbiyyat fədaisi olan ulu tədris ocağınız, öz şanlı ənənələrini bundan sonra daha böyük səy və əzmkarlıqla davam etdirəcək, müstəqil Azərbaycanımızın təhsilinin tərəqqisinə sanballı töhvələr bəxş edəcəkdir.

Sizə nəcib və müqəddəs işinizdə möhkəm can sağlığı və uğurlar diləyirik.

*Böyük hörmət və ehtiramla*
*Şəkinin mədəniyyət işçiləri adından*
*mədəniyyət şöbəsinin müdiri N.Qaffarov*





*Şəki Pedaqoji Texnikumuna.*

Zəngin tədris ənənələrinə malik qədim təhsil müəssisələrindən olan Şəki Pedaqoji Texnikumunun yaradılmasının 75 illik yubileyi münasibətilə rayon prokurorluğunun kollektivi adından texnikumun müəllim və tələbə heyətini təbrik edir, texnikumda təhsil alan gənclərin vətənpərvərlik ruhunda tərbiyə olunmasında, əsl ziyalı kimi respublikamızın müstəqilliyi və süverenliyi üçün şəxsi məsuliyyət hissini dərindən dərk edən mütəxəssislər kimi yetişməsində müvəffəqiyyətlər arzulayıram.

Ümid edirik ki, respublika prezidenti möhtərəm Heydər Əliyev cənablarının Azərbaycanın müstəqilliyi uğrunda apardığı daxili və xarici siyasətin həyata keçirilməsində bütün Azərbaycan tələbələri kimi sizin texnikumun tələbə və müəllim heyətinə öz töhvəsini verəcəklər.

*V.H.Zahirov,*
*Şəki rayon prokuroru, ədliyə müşaviri*

*Şəki Pedaqoji Texnikumunun direktoru R.Şükürov yoldaşa.*

Sizi, rəhbərlik etdiyiniz kollektivin bütün üzvlərini, həmçinin məzunlarınızı böyük ənənələrə malik olan Şəki Pedaqoji Məktəbinin 75 illiyi münasibətilə Şəki rayon xalq məhkəməsinin kollektivi adından təbrik edir, sizə uzun ömür, can sağlığı və şərəfli işlərinizdə müvəffəqiyyətlər arzulayıram. Qoy zəngin ənənələrə malik olan kollektiviniz bundan sonra da müstəqil respublikamız üçün dəyərli kadlar hazırlanmasında ön sıralarda olsun.

*Hörmətlə: Şəki rayon Xalq Məhkəməsinin*
*sədri A.B.Paşayev*

*Şəki Pedaqoji Texnikumunun direktoru R.Şükürov yoldaşa.*

Əziz Rafiq müəllim, Sizi və məktəbinizin müəllim kollektivini texnikumunuzun 75 illik yubileyi münasibətilə təbrik edir, yeni-yeni uğurlar arzulayırıq.

*Hörmətlə: Şin kənd zəhmətkeşləri adından N.Zamanov*

Əziz Rafiq müəllim, hörmətli kollektiv üzvləri!

Bu gün sizin həyatınızda unudulmaz bir gündür. Çalışdığınız Pedaqoji Texnikumun 75 illik yubileyini təntənə ilə qeyd edirsiniz. Buna sizin mənəvi haqqınız var. Müəllim əməyinin bəhrəsi onun yetişdirdiyi kadrlardır. Belə bir əziz gündə bizim təsərrüfatın əməkçilərinin də ürək sözlərini, təbriklərini qəbul etməyinizi xahiş edirik. Sizə gələcək işlərinizdə uğurlar, yeni-yeni nailiyyətlər arzulayırıq.

*Xoş arzularla: K.Dəhnə kolxozunun əməkçiləri adından A.Yusifov*

Hörmətli Rafiq müəllim!

Bu gün başçılıq etdiyiniz Pedaqoji Texnikumun 75 yaşı tamam olur. Bu əlamətdar hadisə münasibətilə biz də ürək sözlərimizi, təbriklərimizi sizə çatdırmağı özümüzə borc bilirik. Bizim kəndin də yüksəlişində, mədəni inkişafında, əhalisinin savadlanmasında bu qocaman təhsil ocağının yetişdirdiyi məzunların əməyi az olmayıb.

Əlbəttə, bununla fəxr etməyə, öyünməyə dəyər. Sizə





bundan sonrakı fəaliyyətinizdə də uğurlar diləyir, can sağlığı arzulayırıq.

*Səmimi arzularla: Baltalı kolxozunun kollektivi adından Ş.Tağıyev*

Hörmətli Rafiq müəllim, əziz kollektiv üzvləri və tələbələr!

Bu əziz gündə-çalışdığınız, təhsil aldığınız Pedaqoji Texnikumun 75 illik yubileyi günündə biz də sizə öz təbriklərimizi çatdırır, sevincinizə şərik oluruq. Həyatın sınaqlarından çıxmağa hazır olan kadrlar yetişdirdiyiniz üçün sizə bir daha minnətdarlığımızı bildirir, bu yolda yeni-yeni uğurlar arzulayırıq.

*Hörmətlə: Dərəcənnət əməkçiləri adından M.Abdullayev*

Əziz Rafiq müəllim!

Bu gün təkcə sizin yox, bütövlükdə rayonumuzun mədəni həyatında əlamətdar gündür. Biz də texnikumun fəaliyyətə başlamasının 75 illik yubileyi münasibətilə Sizi, texnikumun müəllim və tələbə kollektivini təbrik edir, işlərində uğurlar arzulayırıq.

*Hörmətlə: Bolludərə sovxozunun əməkçiləri adından Ç.Qaffarov*

Hörmətli Rafiq müəllim!

Müəllim ta qədimdən müqəddəs varlıq olub. Çünki gənc nəslin təlim-tərbiyəsi, savadlanması kimi çətin vəzifə

də onların üzərinə düşüb. Bu müqəddəs işdə Sizə, başçılıq etdiyiniz texnikumun kollektivinə səmimi duyğularımızı bildirir, gələcək işinizdə müvəffəqiyyətlər arzulayırıq.

*Hörmətlə: Çayqaraqoyunlu kənd əməkçiləri adından S.Namazov*

Möhtərəm Rafiq müəllim! Əziz kollektiv üzvləri və tələbələr!

Bu əziz gündə – çalışdığınız, təhsil aldığınız Pedaqoji Texnikumun 75 illik yubileyi günündə biz də sizə öz təbriklərimizi çatdırır, sevincinizə şərik oluruq. Sizə bu yolda yeni-yeni uğurlar arzulayırıq.

*Hörmətlə:Sarıca sovxozunun əməkçiləri adından Ş.Əmrahov*

Əziz Rafiq müəllim!

Şəki Pedaqoji Texnikumunun 75 illiyi münasibətilə sizi və sizin şəxsinizdə bütün müəllim kollektivinizi ürəkdən təbrik edir, Sizə uzun ömür, can sağlığı, xoş soraqlı günlər arzulayırıq.

*Səmimi arzularla: B.Layısqı kənd zəhmətkeşləri adından T.Səlimov*

***PS: Şəki Pedaqoji Texnikumunun 75 illik yubileyi münasibətilə daha 28 təşkilat, idarə və müəssisə adından pedaqoji kollektivə təbrik teleqramları göndərilmişdir.***





# XI bölmə

## Kim kimdir?

**Məmmədov Teymurçin Muxrəddin oğlu**
*(Tədris işləri üzrə direktor müavini)*



1953-cü ildə Şəki şəhərində anadan olmuşdur. 1969-cu ildə Şəki şəhər 12 nömrəli məktəbi bitirib. Elə həmin ildə də Bakı Dövlət Universitetinin Fizika fakültəsinə daxil olmuşdur.

1974-cü ildə universiteti bitirərək Oğuz rayonunun Xaçmaz kənd orta məktəbində fizika müəllimi kimi əmək fəaliyyətinə başlamışdır.

1975-ci ildə Şəki şəhər 7 nömrəli orta məktəbində, 1976-1983-cü illərdə isə 20 nömrəli orta məktəbində fizika müəllimi işləmişdir.

1983-cü ilin sentyabr ayından ixtisası üzrə Şəki Pedaqoji Texnikumuna müəllim təyin olunan Teymurçin Məmmədov 1987-ci ildən 1991-ci ilədək texnikumda qiyabi şöbə müdiri kimi fəaliyyət göstərmiş, 1991-ci ildən isə tədris işləri üzrə direktor müavini vəzifəsində çalışır.

Ailəlidir, iki övladı, üç nəvəsi var.

**Salamova Səbahət Qazalı qızı**
*(Tərbiyə işləri üzrə direktor müavini)*



1960-cı ilin iyun ayının 20-də Şəki rayonunun Baş Küngüt kəndində anadan olub. 1977-ci ildə doğulduğu kənddə orta məktəbi bitirib. 1977-1981-ci illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin fizika fakültəsində təhsil alıb.

1982-ci ildən 1998-ci ilədək Şəki 43 nömrəli Orta Texniki Peşə Məktəbində fizika müəlliməsi işləyib. 1998-ci ildən Şəki Pedaqoji Texnikumunda fizika müəlliməsi, 2007-ci ildən texnikumda tərbiyə işləri üzrə direktor müavini vəzifəsində çalışır.

Üç övladı var.

**Əhmədov Ağabala Muxtar oğlu**
*(İnzibati təsərrüfat işləri üzrə direktor müavini)*



27 may 1964-cü ildə Şəki şəhərində anadan olmuşdur. Şəki şəhər 17 nömrəli məktəbində natamam, 11 nömrəli məktəbində isə orta təhsil almış, 1981-ci ildə Azərbaycan Texniki Universitetinə daxil olmuşdur.

1986-cı ildə həmin universiteti bitirən Ağabala Əhmədov 1987-ci ildən





Şəki Müəssisədənkənar Mühafizə Bölməsində əmək fəaliyyətinə başlamışdır.

1988-ci ildə Şəki Məişət Xidməti Texnikumunda (indiki Şəki Pedaqoji Texnikumunda) komsomol komitəsinin katibi seçilib.

1991-ci ildən texnikumda inzibati təsərrüfat işləri üzrə direktor müavini vəzifəsində çalışır.

Ailəlidir, üç övladı var.

**Süleymanov İlqar Yolçu oğlu**
*(Baş mühasib)*



1 yanvar 1969-cü ildə Şəki rayonunun Şin kəndində anadan olub. 1985-ci ildə doğulduğu kənddə orta təhsilini başa vurub.

1986-cı ildə Bakı Maaliyə Kredit Texnikumuna daxil olmuş, 1990-cı ildə həmin texnikumu bitirmişdir. Elə həmin ildə də Şəki Kənd Təsərrüfatı Texnikumunda baş mühasib kimi əmək fəaliyyətinə başlayıb. 1993-cü ildə Şəki «Karvansaray» mehmanxana kompleksinə baş mühasib təyin olunub. 1993-cü ilin iyul ayından Şəki Pedaqoji Texnikumunda baş mühasib vəzifəsində çalışır.

Ailəlidir, iki övladı var.

## İbrahimzadə Aytən Rasim qızı

*(Kadrlar üzrə mütəxəssis)*



1976-cı il iyul ayının 9-da Bakı şəhərində anadan olmuşdur. 1994-cü ildə Şəki «Fizika-riyaziyyat və hümanitar təmaüllü» litseyi bitirərək Azərbaycan Texniki Universitetinin Avtomatika fakültəsinə daxil olmuşdur. 1998-ci ildə həmin universiteti bitirərək «İnformatika və hesablama texnikası» ixtisasına yiyələnmişdir.

1998-ci ildən Şəki Pedaqoji Texnikumunda informatika müəllimi, kadrlar üzrə mütəxəssis vəzifəsində çalışır.

Ailəlidir, bir övladı var.

## Kərimov Yusif Abdurahman oğlu

*(İdman rəhbəri)*



1957-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1974-cü ildə şəhər 19 nömrəli orta məktəbi bitirmiş, 4 il zavodda çilingər işləmiş, 1978-ci ildə Azərbaycan Dövlət Bədən Tərbiyəsi Akademiyasına daxil olmuşdur. 1982-ci ildə ali təhsilini başa vuraraq Şəki Pedaqoji Texnikumuna bədən tərbiyəsi müəllimi təyin olunmuşdur.

1983-cü ildən texnikumda idman





rəhbəri vəzifəsinə irəli çəkilmiş, hal-hazırda da tutduğu vəzifədə səylə çalışır.

Ailəlidir, bir övladı var.

## Səmədov Rafiq Tofiq oğlu

*(Hərbi rəhbər)*



17 may 1965-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1982-ci ildə şəhər 7 nömrəli orta məktəbi bitirmiş, 1983-1985-ci illərdə hərbi xidmətdə olmuşdur. Hərbi xidmətdən sonra Şəki İstehsalat Birliyində toxucu usta vəzifəsində işləmişdir.

1986-cı ildə Moskva şəhərində ÜİLKGİ MK yanında ali Komsomol məktəbinin tarix və komsomol tərbiyəsi fakültəsinə daxil olmuşdur. 1989-cu ildə Azərbaycan Gənclər İttifaqı Şəki Şəhər Komitəsinin ikinci katibi seçildiyi üçün təhsilini başa vurmaq hüququ saxlanılmaqla praktiki işə çağırılmışdır. 1990-cı ildə həmin ali məktəbi bitirmişdir. 1992-ci ildə Azərbaycan Gənclər İttifaqı Şəki Şəhər Komitəsinin birinci katibi işləmiş, 1992-1994-cü illərdə şəhər 8 nömrəli orta məktəbdə tarix müəllimi işləmişdir.

1994-cü ildə Rusiya Gənclər İnstitutunun aspiranturasına daxil olmuş, 1997-ci ildə aspiranturanı bitirmiş, iki il institutda fəaliyyət göstərmişdir.

1999-cu ildə Şəki şəhərinə qayıtmış və şəhər 14 nömrəli orta məktəbində tarix müəllimi işləmişdir.

2000-ci ildən Şəki Pedaqoji Texnikumunda tarix mü-

əllimi, 2003-cü ildən texnikumda hərbi rəhbər vəzifəsində çalışır.

Ailəlidir, iki övladı var.

### İsmayılov Şahid Nəzir oğlu

*(Təcrübə rəhbəri)*



1959-cu ildə Şəki rayonunun Baş Şabalıd kəndində anadan olub.

1974-cü ildə Baş Şabalıd kəndində natamam orta təhsilini bitirdikdən sonra Şəki Pedaqoji Texnikumuna daxil olmuş, 1978-ci ildə texnikumu bitirərək Azərbaycan Dövlət Pedaqoji Universitetinin Ümumi texniki fənlər fakültəsinə daxil olmuşdur.

1982-ci ildə universiteti bitirərək təyinatla Şəki Pedaqoji Texnikumuna müəllim göndərilmişdir.

1990-cı ildən texnikumda təcrübə rəhbəri vəzifəsində çalışır.

Yeni Azərbaycan Partiyasının Şəki «Yuxarı baş» ərazi ilk təşkilatının sədridir.

Ailəlidir, üç övladı var.





### Səmədov Nəriman Vahid oğlu

*(Şöbə müdiri)*



1956-cı ildə Şəki rayonunun Kəhrizoba kəndində anadan olub. 1973-cü ildə orta məktəbi bitirb və Nəsimi adına Səfərabad kolxozunun süd-əmtəə fermasında laborant işləyib. 1974-cü ildə Azərbaycan Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsinə daxil olmuş, 1979-cu ildə həmin universiteti bitirərək Şəki rayonunun Şirinbulaq kənd səkkizillik məktəbinə riyaziyyat müəllimi təyin olunmuşdur.

1980-ci ildə Cəfərabad kənd orta məktəbinə təlim-tərbiyə işləri üzrə direktor müavini vəzifəsinə təyin olunub. 1995-1998-ci illərdə Şəki 2 nömrəli Peşə məktəbində direktor vəzifəsində çalışmışdır.

1999-cu ildən Şəki Pedaqoji Texnikumunda müəllim, 2007-ci ildən isə texnikumda şöbə müdiri vəzifəsində çalışır.

Ailəlidir, dörd övladı, 5 nəvəsi var.



### Kərimova Günay Nəriman qızı

*(Şöbə müdiri)*

1981-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1997-ci ildə Şəki şəhər 7 nömrəli orta məktəbini, 2002-ci ildə Azərbaycan Dövlət Dillər Universitetinin Tərcümə və pedaqogika fakültəsini bitirmişdir.

Elə həmin vaxtdan Şəki Pedaqoji Texnikumunda müəllim kimi fəaliyyətə başlamışdır.

2008-ci ildən «İngilis dili» şöbəsinə ictimai əsaslarla şöbə müdiri təyin edilmişdir.

Ailəlidir, iki övladı var.

**Qasımov Müşfiq Rauf oğlu**

*(Şöbə müdiri)*



19 may 1976-cı ildə Şəki şəhərində anadan olmuşdur. 1993-cü ildə Şəki şəhər 8 nömrəli orta məktəbini bitirib. Həmin ildə də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Təsviri incəsənət və rəsmxətt fakültəsinə daxil olub. 1997-ci ildə həmin universiteti bitirb. Müşfiq Qasımov 1998-ci ildə Şəki Uşaq Yaradıcılıq Mərkəzində müəllim kimi əmək fəaliyyətinə başlayıb. 1999-cu ildən Şəki Pedaqoji Texnikumunda müəllim, 2001-ci ildən isə şöbə müdiri vəzifəsində çalışır.

Ailəlidir, üç övladı var.





**Rəsulov Rafiq Nütvəli oğlu**

*(Qiyabi şöbə müdiri)*



1955-ci ildə Şəki rayonunun Kiş kəndində anadan olub. 1972-ci ildə doğulduğu kənddə orta məktəbi bitirib və həmin ildə də Azərbaycan Dövlət Pedaqoji Universitetinin biologiya-coğrafiya fakültəsinə daxil olub, 1977-ci ildə ali təhsilini başa vuraraq Oğuz rayon gənc təbiətçilər stansiyasının direktoru vəzifəsində əmək fəaliyyətinə başlayıb. 1983-cü ildən Şəki Pedaqoji Texnikumunda müəllim, təcrübə rəhbəri işləmiş, 1998-ci ildən isə qiyabi şöbənin müdiri vəzifəsində çalışır.

Rafiq Rəsulov eyni zamanda həvəskar bəstəkardır, 50-dən çox mahnının müəllifidir. 2006-cı ildə «Səbuhi» studiyası tərəfindən onun mahnılarından ibarət buraxılmış diskin təqdimatı Şəki şəhər ictimaiyyəti tərəfindən böyük coşqu ilə qarşılanmışdır.

Ailəlidir, iki övladı, bir nəvəsi var.



**Hüseynova Təngiz Şükür qızı**

*(qiyabi şöbə metodisti)*

1958-ci ildə Şəki rayonunun Aşağı Küngüt kəndində anadan olmuşdur. 1975-ci ildə Aşağı Küngüt kənd orta məktəbini bitirib. 1977-ci ildə Azərbay-

can Dövlət Pedaqoji Universitetinə daxil olub, 1982-ci ildə həmin universiteti bitirib.

Əmək fəaliyyətinə 1979-cu ildə Aşağı Küngüt kənd orta məktəbində başlayıb.

1982-ci ildən Şəki şəhər 10 nömrəli orta məktəbində işləyib. 1996-cı ildən Şəki Pedaqoji Texnikumunda müəllim, 2000-ci ildən isə texnikumda qiyabi şöbənin metodisti vəzifəsində çalışır.

Ailəlidir, bir övladı var.

**Məmmədov Nizami Sadəddin oğlu**

*(Metod kabinənin rəhbəri)*



1947-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1965-ci ildə Baş Göynük kənd orta məktəbini bitirib. Azərbaycan Dövlət Pedaqoji Universitetinin fizika fakültəsinə daxil olub. 1971-ci ildə universiteti bitirərək Yevlax şəhər 4 nömrəli orta məktəbinə müəllim təyin edilib. 1973-cü ildə Şəki rayonunun Şirinbulaq kənd 8 illik məktəbinə tədris işləri üzrə direktor müavini təyin edilmiş, 1974-cü ildən isə Selbasan kənd səkkizillik məktəbinə direktor vəzifəsinə təyin olunmuşdur.

1983-cü ildən respublika Müəllimləri Təkmilləşdirmə İnstitutunun Şəki filialında «Əmək və peşə orientasiyası» tədris metodika kabinəsinə müdir, eyni zamanda institutun tədris işləri üzrə direktor müavini təyin edilmişdir.

Nizami Məmmədov 1993-1994-cü illərdə Bakı Dövlət





Universitetinin Şəki filialında müəllim işləmiş, 1995-ci ildən Şəki Pedaqoji Texnikumunda çalışır, metod kabinə rəhbəridir.

Dövri mətbuatda 20-dən çox elmi məqaləsi dərc olunmuş, «Pedaqogika tarixindən mühazirə materialları» (Rafiq Şükürovla birlikdə, *2004*), «Pedaqogika dərslikləri»(yenə Rafiq Şükürovla birlikdə, *2005*), «3-cü cə 4-cü siniflərdə riyaziyyat»(müəllim və tələbələr üçün dərs vəsaiti, yenə Rafiq Şükürovla birlikdə, *2005*) kitabları, eyni zamanda bir sıra test nümunələri toplusu və ayrı-ayrı fənn proqramları çap olunmuşdur.

Nizami Məmmədovun əməyi yüksək qiymətləndirilmiş «Qabaqcıl maarif xadimi» döş nişanı və bir sıra fəxri fərmanlarla təltif olunmuşdur.

Ailəlidir, üç övladı, beş nəvəsi var.

**Əhmədov İsmayıl Pirməmməd oğlu**

*(Mülki-müdafiə rəhbəri)*



1960-cı ildə Şəki şəhərində ziyalı ailəsində anadan olmuşdur. 1977-ci ildə Şəki şəhər 10 nömrəli orta məktəbini bitirmişdir. 1977-1979-cu illərdə Şəki Yol İstismar İdarəsində əmək fəaliyyətinə başlamışdır. 1979-cu ildə indiki İnşaat Mühəndisləri Universitetinin Sənaye və mülki tikinti fakültəsinə daxil olmuş, 1985-ci ildə həmin universiteti bitirmişdir.

1985-1986-cı illərdə Kolxozlararası Təmir Tikinti idarəsində mühəndis işləmiş, sonra hərbi xidmətə yollanmışdır.

1988-1991-ci illərdə Şəki şəhər İnşaat Materilalları satışı bazasında əmtəəşünas işləmiş, 1991-ci ildən də Şəki Pedaqoji Texnikumunda çalışır.

Ailəlidir, iki oğlu var.

**Zeynalov Pərviz Qinyaz oğlu**
*(Texnikumun tarix muzeyinin rəhbəri)*



1979-cu il fevral ayının 14-də Şəki şəhərində anadan olmuşdur.

1995-ci ildə Bakı Dövlət Universitetinin Sosial elmlər və psixologiya fakültəsinə daxil olub,1999-cu ildə həmin universiteti bitirib Politologiya üzrə bakalavr dərəcəsi almışdır. 2000-ci ilin fevral ayından Şəki Pedaqoji Texnikumunda işləyir.

Pərviz Zeynalov dövri mətbuatda tez-tez cıxış edir. 10-a yaxın elmi və elmi-publisistik məqalənin müəllifidir.





# XII bölmə

## Danışan şəkillər




*Ulu öndər Heydər Əliyevin abidəsi önünə əklil qoyarkən*



*Texnikumun müəllimləri ulu öndər H.Əliyevin abidəsini ziyarət edirlər*







*Şəki şəhər İcra Hakimiyyətinin başçısı Murad Cabbarlı (soldan 2-ci) texnikumun idman meydançasında Rafiq Şükürovun məlumatlarını dinləyir*



*Şəki şəhər İcra hakimiyyətinin başçısı Murad Cabbarlı (soldan 3-cü) görüş zamanı*



Texnikum müəllimlərinin bir qrupu








**Tədris işləri üzrə direktor müavini Teymurçin Məmmədov müəllimlərlə metodiki söhbət aparарkən**



**Müharibə veteranları ilə görüşdən sonra**



*Rafiq Şükürov (1-ci sırada ortada) İngilis dili müəllimləri ilə birlikdə*



**Şöbə müdiri Nəriman Səmədov müəllimlərlə mövzu-təqvim planlarını müzakirə edərkən**








*Rafiq Şükürov tədbir iştirakçıları ilə birlikdə*



*Müəllim Nizami Məmmədov pedaqogika dərsində*



*Texnikumun həyətindən bir görünüş*







*Texnikumun direktoru Rafiq Şükürov iş otağında*



*Rafiq Şükürov (2-ci sırada ortada) texniki heyyətlə birlikdə*



*Təcrübə rəhbəri Şahid İsmayılov, metodist müəllimlər Tangiz Hüseynova, Səbahət Salamova, Pərviz Zeynalov və Rafiq Səmədovla birlikdə təcrübənin gedişini müzakirə edirlər*



*İdman rəhbəri Yusif Kərimov (sağdan 3-cü) idman müəllimləri ilə birlikdə*







*Şair Vaqif Aslan, texnikumun direktoru Rafiq Şükürov, fəlsəfə elmləri doktoru Cavanşir Feyziyev, texnika elmləri doktoru, millət vəkili Məcnun Şükürov və şair Ramiz Orsər*



*Təcrübə rəhbəri Şahid İsmayılov sınaq dərsində*



***Müəllim Maarif Hacıyev rəngkarlıq dərs məşğələsində***



İşıq məbədi



***Xalq şairi Bəxtiyar Vahabzadə texnikumda keçirilən görüşdən sonra ziyalılar arasında***




*Texnikumun direktoru Rafiq Şükürov məzunlara hədiyyələr təqdim edir*



*Qiyabi şöbənin müdiri Rafiq Rəsulov qiyabiçi tələbələrlə birlikdə*







*Gəncliyin dostu – Bəxtiyar Vahabzadə gənclərlə birlikdə*



*Yaxın-uzaq xatirələr*







*Növbəti tədbirdən sonra*



*Rəqs qrupunun çıxışı*




*Bu da bir xatirə*







***Fəxri məzun Əsmayə müəllimə şagirdləri ilə birlikdə***



***Məzunlar: Soldan, Xalid Qaffarov, Abbas Qəhrəmanov və digərləri***




*Şair Vaqif Aslan müəllimlərlə birlikdə*



*Müharibə veteranları ilə görüşdə,*
*xitabətdə hərbi rəhbər Rafiq Səmədov*







*Müəllim Ramiz Orsər Azərbaycan dili dərsində*



*Bu da bir xatirə*







*Millət vəkili, texnika elmləri doktoru Məcnun Şükürov tələbələrin qonağıdır*



*Sınaq-təcrübə dərsində*



İdman spartakiadasının açılışında







*Müəllim Rasim Rzayev təsviri sənət dərsində*



*1933-cü ilin buraxılışı*
*Məmməd İsmayılzadə*
*Direktor müavini 1941-1945*



*Müəllim Cahid Rəsulov*

ŞƏKİ PEDAQOJİ KOLLECİ 2010

"İncəsənət" şöbəsi tələbələrinin iştirakı ilə

"ARŞIN MAL ALAN"

operettası

Cahan xala

Süleyman

Əsgər

Asya

Telli

Vəli

Bədii rəhbər: Müşfiq QASIMOV

Quruluşçu rejissor,: Şəmsiyyət ƏSGƏROVA

Quruluşçu rəssam, dizayner: Müşviq QASIMOV

Müşaət edir: Aynurə MUSTAFAYEVA

İşıq rejissoru,operator: Yusif ABBASOV

Qrim ustası: Vəfa ƏSGƏROVA

İŞTİRAK EDİRLƏR

Əsgər – Tural Məsimov
Gülçöhrə – Nərmin Rəsulova
Asya – Fərqanə Xəlilova
Soltan bəy – Nərgiz Mövlanova
Süleyman – Aysel Həsənova
Vəli – Turkan İbrahimzadə
Telli – Aytän Räsulova
Cahan xala – Vüsalə Məmmədova

Tamaşa ___ aprel 2010-cu il, saat _____-da Pedaqoji Kollecın akt zalında keçiriləcək.

*İncəsənət fənləri şöbəsi tələbələrinin hazırladığı «Arşın-mal alan» tamaşasının afişası*







*Spartakiadanın açılışında*



*Təmir işlərinin gedişində*



*Şöbə müdiri Müşfiq Qasımov mükafatlandırılmış tələbələrlə birlikdə*







*Novbəti tədbirdən sonra*




*«Birlik» yarışmasında*



Əsas tədris binasının ümumi görünüşü





## MÜNDƏRİCAT

V bölmə



VI bölmə



VII bölmə

VIII bölmə

IX bölmə



X bölmə







XI bölmə



XII bölmə

Şükürov Rafiq Şükür oğlu,
Ramiz Orsər (Yusifov) Rəhim oğlu

# İŞIQ MƏBƏDİ

***Şəki Pedoqoji Kolleci – 90***

*Nəşriyatın yaradıcısı*
***Qoşqar İsmayıloğlu***

Nəşriyyat direktoru
*Akif Dənzizadə*
Redaktor
*Fəridə Ələskərli*
Texniki redaktoru
*Sərxan Ramizoğlu*
Dizayner
*Polad Hüseynov*
Korrektor
*Aytən İbrahimzadə*
Çapa məsul
*Cəlil Quliyev*

*Çapa imzalanmış 02.10.2010, formatı 60x84$^{1}/_{16}$, fiziki ç.v 19,5 təbaşirli kağız, tayms qarnituru, sifariş K3. Sayı 1000*

*Kitab*
**«İDEAL-PRİNT»**
*nəşriyyatında nəşrə hazırlanmış və ofset üsulu ilə çap olunmuşdur.*

✉ *AZ 1025. Bakı şəhəri, Xocalı pr., 24.*
☎ *T/F.:* ***4989555, 4937255, 4902757***

